# AZƏRBAYCAN MƏKTƏBİ

*Elmi-nəzəri, pedaqoji jurnal*

**2016**
**№ 1 (671)**
*(yanvar-fevral)*

**1924-cü ildən çıxır**

*Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1996-cı il tarixli Nizamnaməsi ilə təsdiq olunmuşdur. Ədliyyə Nazirliyi üzrə dövlət qeydiyyatı № 11/3165*

*Redaksiyanın ünvanı:*
*Az1025, Bakı şəhəri, A.Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, otaq 410 )*

*Telefon/Faks*
*(012) 496-74-19*
*(012) 496-74-20*

*E-mail:*
*azarbaycan.maktabijurnali.24@mail.ru*

*Rekvizitlər:*
*Kapital Bankın Rabitə Filialı*
*h/h AZ83AIIB45810013441800004118*
*VÖEN: 9900003611*
*Bankın rekvizitləri:*
*Kod: 200189*
*m/hAZ37NABZ01350100000000001944*
*SWIFT: Bik AIIBAZ2X*

*Jurnal redaksiyada yığılıb səhifələnmiş, ARTPİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.*

**Təsisçi Azərbaycan Respublikası Təhsil Nazirliyi**

**BU NÖMRƏDƏ**

**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı: Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş: 06**

---

**Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, ARTPİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.**

**В этом номере**



**In this number**

# 2014/2015-Cİ TƏDRİS İLİNDƏ KEÇİRİLMİŞ “ƏN YAXŞI MÜƏLLİM” MÜSABİQƏSİNİN QALİBLƏRİNİN MÜKAFATLANDIRILMASI HAQQINDA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN

## S Ə R Ə N C A M I

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, “Ən yaxşı ümumi təhsil müəssisəsi və ən yaxşı müəllim mükafatlarının təsis edilməsi haqqında” Azərbaycan Respublikası Prezidentinin 2007-ci il 4 sentyabr tarixli 2373 nömrəli Sərəncamının 1-ci hissəsinə uyğun olaraq

**QƏRARA ALIRAM:**

1. 2014/2015-ci tədris ilində keçirilmiş “Ən yaxşı müəllim” müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə aşağıda qeyd edilən müəllimlər 5000 (beş min) manat məbləğində birdəfəlik pul mükafatı ilə mükafatlandırılsınlar:

Abbasova Ülviyyə Vaqif qızı
Abdullayeva Gülnarə Bəşir qızı
Abidi Gülnarə Abusəməd qızı
Ağayeva Məlahət İmran qızı
Ağayeva Vüsalə Əli qızı
Axundova Nailə Ələsgər qızı
Axundzadə Həcər Təvəkkül qızı
Allahverdiyeva Afət İkram qızı
Allahverdiyeva Bikə Əhməd qızı
Aslanova Ülviyyə Salam qızı
Babayeva Leyla Əvəz qızı
Bayramov Şərafət Təhmuraz oğlu
Bayramova İradə İsmayıl qızı
Bəşirov Əmiraslan Xəlil oğlu
Cabbarov Hafiz Əkbər oğlu
Cabbarov Vasif Arif oğlu
Cəfərova Cəmalə Fərəməz qızı
Eldarova İradə Baba qızı
Eyubova Mehriban Qulu qızı
Əfəndiyeva Rübail Əhməd qızı
Əhmədova Aliyə Fərman qızı
Əhmədova Səlimə Bağır qızı
Əliyev Rövşən Mirzə oğlu
Əliyeva Könül İsa qızı
Əliyeva Leyli Məhərrəm qızı
Əliyeva Nəzakət Səlim qızı
Əliyeva Sahilə Vahid qızı
Əliyeva Tamara Nuruş qızı
Əlizadə Aynur Məmməd qızı
Əlizadə Sevda Cavanşir qızı
Əmirova İlahə Malik qızı
Əmrahova Sevda Rüfət qızı
Əsədov Seyyub Əsəd oğlu
Əsgərova Cəmalə Mehman qızı
Əskərova Solmaz Hacıəhməd qızı
Əyyubzadə Günay Teyyub qızı
Fazilova Şəfəq Nadir qızı
Fərzəliyev Dəyanət Xaliq oğlu
Heydərova Pərvanə Müslüm qızı
Həsənova Tatyana Qara qızı
Həşimova Aygün Baba qızı
Hümbətova Olqa Gennadyevna
Hüseynov Hüseyn Əmirhüseyn oğlu
Hüseynova Aynur Namiq qızı
Hüseynova Gülnar Müşviq qızı
Hüseynova Arzu Talıb qızı
Xəlilova Söylü Nüşirəvan qızı
Xudiyeva Günəş Şərəfəddin qızı
Xudiyeva Xatirə Rafiq qızı
İbrahimova Aynur Asif qızı
İmanov Elmin Allahverdi oğlu
İsmayılov Mərdan Rəhim oğlu
İsmayılov Nicat Əli oğlu

İsmayılova Aynurə Zahid qızı
İsmayılova Mələknisə Yusif qızı
Kərimova Dilşad Ədilağa qızı
Qasımova Tahirə İsmayıl qızı
Qayıblı Nügbar Məcnun qızı
Qəribova Pərvin Yaşar qızı
Quliyev Elməddin Əli oğlu
Quliyeva Xəyalə Xeyrullah qızı
Qurbanova Natalya Dmitriyevna
Məhəmmədova Təranə Eyvaz qızı
Məlikova İradə Telman qızı
Məmmədli Ələddin Qibləli oğlu
Məmmədova Sahibə Xasay qızı
Məmmədova Şirin Nəcəf qızı
Məmmədova Şirincan Əvəz qızı
Məmmədova Zeynəb Əliqasım qızı
Məşədibəyova Samirə Camal qızı
Mirzayeva Ellada Rəşid qızı
Mirzəyev Ziya Tofiq oğlu
Mirzəyeva Zöhrə Məzayir qızı
Mirzoyeva Kamalə Rəfayıl qızı
Musayeva Nərmin Əsəd qızı
Mustafayeva Nailə Tahir qızı
Mustafayeva Vəfa Rafail qızı
Nəcəfova Bikə Əliyulla qızı
Nəzərova Sevinc Mahmud qızı
Orucova Aynurə Tuiddin qızı
Poladov Xəyal Bayram oğlu
Ramazanova Yeganə Sətdar qızı
Rəsulova Səbinə Əlibala qızı
Rüstəmov Etibar Ələddin oğlu
Rüstəmova Qəmər Xalıq qızı
Rzayev Hüseyn Həsən oğlu
Seyidəliyev Yaşar Nəcməddin oğlu
Seyidova Şərəbanı Mirəbdüləzim qızı
Səfərova Əminə Əli qızı
Səmədov Azər İbiş oğlu
Soltanova Gülsən Rza qızı
Süleymanova Fatimə Hüseynbala qızı
Şahbazov Rafət Məmmədəli oğlu
Şahgəldiyeva Ədibə Səfər qızı
Şükürov Yaşar Fəxrəddin oğlu
Şükürova Nailə Sadıx qızı
Tahirli Aytən Yaşar qızı
Təhməzova Könül Arif qızı
Valehova Gülbəniz Babaverdi qızı
Vasanova Könül Məmməd qızı.

2. Bu Sərəncamın 1-ci hissəsində nəzərdə tutulmuş pul mükafatları "Ən yaxşı ümumi təhsil müəssisəsi müsabiqəsinin keçirilməsi Qaydaları və ümumi təhsil müəssisələrinə verilmiş mükafatın istifadə istiqamətləri"nin və "Ən yaxşı müəllim müsabiqəsinin keçirilməsi Qaydaları"nın təsdiq edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2008-ci il 25 fevral tarixli 714 nömrəli Fərmanının 3-cü hissəsinə uyğun ödənilsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**
**Bakı şəhəri, 21 dekabr 2015-ci il**

# AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL NAZİRİ MİKAYIL CABBAROVUN ANS-İN "HESABAT" VERİLİŞİNƏ MÜSAHİBƏSİ



*- Cənab nazir, postneft dövrü üçün Prezident faktiki olaraq yeni strategiyalar həyata keçirir. Bu strategiyada üstünlük etibarsız, hər an bitib-tükənmək ehtimalı olan təbii sərvətlərə yox, insan kapitalına verilir. Nə qədər qəribə səslənsə də, bir vaxtlar dəbdə olan yeni insan modeli aktuallaşıb. Amma doğrudan da yeni Azərbaycan üçün cazibədar səslənir. Təhsil Nazirliyi bu istiqamətdə hansı işləri görür?*

- Cənab Prezident tərəfindən Azərbaycanda insan kapitalının formalaşdırılması üçün tədbirlər, aparılan siyasət bir neçə ildir ki, həyata keçirilir. Təhsil sahəsində həyata keçirilən işlər də bunun nümunəsidir. Burada, ilk növbədə, xaricdə təhsil üzrə Dövlət Proqramını qeyd etmək istəyirəm. 2007-ci ildə qəbul edilən proqram artıq o dövrdə bilik iqtisadiyyatını, dünyada dəyişən iqtisadi modeli nəzərə alaraq, Azərbaycanın gələcəyinin, ilk növbədə, keyfiyyətli kadrlarının hazırlığından ibarət olduğunu ortaya qoymuşdu. Bu günə qədər xaricdə təhsil üzrə Dövlət Proqramı üzrə 3500-dən çox təqaüd verilib. Min nəfərdən çox şəxs artıq məzun olub. Onların 60 faizi özəl sektorda, 40 faizi dövlət qulluğunda çalışır. Bunun üçün onlara xüsusi imtiyazlar yaradılıb. Belə ki, həmin məzunlar imtahan vermədən dövlət qulluğuna qəbul olunurlar.

Təbii ki, bu, yeganə istiqamət deyil. Əgər ölkə təhsilinə nəzər salsaq, biz iki il bundan öncə Savadlı, Bacarıqlı, Hazırlıqlı tələbələrdən ibarət SABAH proqramına start vermişik. Burada da eyni məqsədləri düşünmüşük. Yeni insan necə olmalıdır və yeni iqtisadiyyatda hansı keyfiyyətləri axtarırıq? Bilikli, biliklərini gündəlik həyatında və peşəkar fəaliyyətində tətbiq edə bilən və kreativ, qeyri-standart düşüncəyə malik olan insanlar. Bu, bugünkü postmodern adlanan dövrün və iqtisadiyyatın tələbidir. Çalışırıq ki, SABAH qruplarında biz belə tələbələrin seçilməsinə, yetişməsinə nail olaq.

Peşə təhsili səviyyəsində də analoji proseslər gedir. "Müasir Azərbaycan Peşəkarları" (MAP) ümumi brend adı altında keçirdiyimiz layihələr buna misal ola bilər. Artıq bir neçə ilk peşə-ixtisas təhsili müəssisəsində həyata keçirilən bu layihənin əsas fərqləndirici cəhəti odur ki, biz bunu həm özəl sektor, həm də dövlətə məxsus olan şirkətlərlə birlikdə həyata keçiririk.

Nəhayət, ümumi təhsil sahəsindən danışsaq, deyə bilərik ki, artıq Azərbaycanda yeni məzmunlu tədris həyata keçirilir. Başqa sözlə, mütləq bilikdən, qeyd etdiyim tənqidi təfəkkürü, kreativ düşüncəni inkişaf etdirən, qeyri-standart düşüncəni və komandada çalışmaq imkanları, vərdişləri aşılayan bir

təhsil sisteminə qədəm qoymuşuq. Bu prizmadan düşünürəm ki, mənim əsas mesajım pozitivdir. Bu da ondan ibarətdir ki, təhsil sistemində sualınızda şərti olaraq yeni insan adlandırılan həmin məzunu artıq buraxırıq.

*- Bir halda ki, yeni insandan danışırıq. Yeni insanın adını biz, məzun qoyuruq. Bu, həm də test mövzusuna aparıb çıxaracaq. Ali məktəblərə qəbul olunmaq üçün testlərin mövcud məzmunu məzunun biliyini tam ifadə edə bilirmi? Qiymətləndirmədə test sisteminin hansı alternativi ola bilər?*

- Mənə belə gəlir ki, biz sualda iki məsələyə toxunmalıyıq. Birincisi, bu gün Azərbaycanda keçirilən qəbul imtahanının məzmunu və həmin məzmunun müsbət tərəfləri. İlk növbədə, məzmun və formanı fərqləndirməliyik. Formal olaraq bu, test imtahanı sistemidir. Formal olaraq bu imtahanın əsas üstünlükləri insan faktorundan asılılığının minimal olması, qiymətləndirmə prosesində nəticələrin müəyyən mənada insan faktorundan asılı olmayaraq həyata keçirilməsidir. Bu, Azərbaycan kontekstində böyük üstünlükdür. Bununla da obyektivlik təmin edilir.

Digər tərəfdən, imtahanın yığcam olması, bir gün ərzində təhsil proqramının məzmununun qiymətləndirilməsidir. Yeni şəraitdən, şərtlərdən, tələblərdən danışırıqsa, təbii olaraq, burada, bizim fikrimizcə, gələcəkdə evalusiya olmalıdır, bəlkə yenidən baxılmalıdır. Biz istəyərdik ki, zəruri kompetensiyalar qiymətləndirmədə əks olunsun. Bunlar nələrdir? Bu gün test imtahanının forması əmək bazarında tələb olunan müasir, uğurlu məzun üçün tələb olunan bir sıra bilik və kompetensiyaları ölçmək qabiliyyətinə malik deyil. Nədir bu? Nitq, ritorika, yazı vərdişləri, qeyri-standart, hər hansı seçim variantları ilə məhdudlaşmayan tənqidi düşüncə tərzini özündə əks etdirən sualların olması.

Bir tərəfdən qeyd etdik ki, imtahanın qısa olması üstünlükdür. Amma digər tərəfdən təbii olaraq bunun bir çatışmazlığı da var. Faktiki olaraq məzunun gələcəyi, taleyi 3 saatlıq bir imtahanda həll olunur. O imtahan ildə bir dəfə keçirilir. Dünyada mövcud olan sistemlərlə müqayisə etsək, təbii olaraq, dünyada başqa qiymətləndirmə sistemləri də mövcuddur. Onlardan ən məşhurları GMAT, SAT, əgər dil biliyinin qiymətləndirilməsindən danışırıqsa,TOEFL, IELTS kimi imtahanları misal göstərə bilərik. Onların hansısa bir hissəsi test imtahanı şəklində keçirilə bilər, amma bütün imtahan test deyil, burada oxu, yazı vərdişləri, fikri ifadə etmək də yer alır. Bu istiqamətdə Tələbə Qəbulu üzrə Dövlət Komissiyasının sədri, hörmətli həmkarım Məleykə Abbaszadə ilə faydalı müzakirələrimiz gedir. Düşünürəm ki, hər iki qurum bu mövzunu tanıyır. Növbəti iki-üç ildə düşünmürəm ki, imtahanın forma və mahiyyətində hər hansı dəyişiklik gözləməliyik. Amma ondan sonrakı dövrdə mənə belə gəlir ki, imtahanın forması və məzmunu dəyişməlidir.

Bunun başqa zəruri səbəbi də oradan qaynaqlanır ki, yeni tədris məzmunu ilə oxuyan məzunlarımız 3 ildən sonra məktəbi bitirirlər, əgər belə demək olarsa, onların tədrisi, bilikləri testlə ölçülə bilməz. Onlara məktəbdə aşıladığımız biliklərin qiymətləndirilməsi fərqli alətlər tələb edir. Biz hal-hazırda qiymətləndirmə standartları adlanan bir fəaliyyəti həyata keçiririk. Həmin o yeni qiymətləndirmə standartları hazırlanmalıdır. Burada qorxulu bir şey yoxdur. Əgər biz yaxın ölkələri götürsək, məsələn, Rusiyada bu sistemi vahid dövlət imtahanı adlandırırlar. Həmin imtahanlar da bütün tələbələr üçün eyni vaxtda keçirilir. Obyektivliyi və bizim üçün zəruri olan digər amilləri önə çəkmək şərtilə deyək ki, həmin imtahanların test hissəsi yoxdur. Ənənəvi yoxlama işi kimi, deyək ki, bizim oxuduğumuz dövrdəki yoxlama işi formatında keçirilir. Mən yenə deyirəm, belə bir qərar bir gün, bir il ərzində

qəbul oluna bilməz, olunmamalıdır. Çünki, mən burada qeyd etdiyim kimi, bəzi faktorlara xüsusi diqqət yetirməliyik. İlk növbədə, insan faktorunun qiymətləndirmə prosesinə təsirinin istisna olunması və yaxud hər hansı bir şəkildə tam minimuma endirilməsi.

*- Region məktəblilərinin ali məktəblərə qəbul olunma faizi Bakı ilə müqayisədə daha üstündür. Baxmayaraq ki, region məktəblərinin maddi-texniki bazası Bakı ilə müqayisədə kifayət qədər zəifdir. Bu, tərs mütənasibliyi nə ilə izah etmək olar?*

- Bu tərs mütənasiblik deyil, bu mifdir və həqiqətə uyğun deyil. Amma sizin və bir çox həmkarlarınız nəyə görə bunu belə qəbul edir? Bu, maraqlı sualdır və icazənizlə mən bu sualı cavablandırardım.

Məsələ ondan ibarətdir ki, bir qayda olaraq, bu statistika səslənərkən və yaxud bu statistika təqdim edilərkən, diqqət yetirilmir ki, biz nəyi nə ilə müqayisə edirik? Bir qayda olaraq bizə təklif edirlər ki, Bakı, digər şəhər, region məktəblərindən ümumi sənəd verən abituriyent sayı ilə qəbul olanların mütənasibliyini ölçək. Bununla da təbii olaraq, bir neçə problem yaranır. İlk növbədə, problem ondan ibarətdir ki, əgər Bakı məktəblərinin məzunlarının təxminən 85 faizi ali məktəbə qəbul olunmaq üçün sənəd verirsə, regionlarda bu rəqəm təxminən 45-50 faizdir. Hər 100 nəfər şagirddən abituriyent olanların sayı fərqlidir.

İkinci məsələ ondan ibarətdir ki, statistika təqdim edilərkən həm bu ilin, həm də ötən ilin məzunlarının sayı bir yerdə sayılıdır. Belə olduğu təqdirdə, bir qayda olaraq, bilirsiniz ki, Bakı məktəblərinin məzunları növbəti ildə, əgər birinci ildə uğur qazanmayıblarsa, ikinci və üçüncü illərdə özlərini bir daha sınayırlar.

Amma biz müqayisəni məzun sayına görə aparsaq, birmənalı şəkildə deyə bilərik ki, Bakı, Sumqayıt məktəbliləri kifayət qədər çox fərqlənir. Üçüncü yerdə Mingəçevir gəlir. Bu rəqəmlər var. Nəyə görə bu, belədir? Bu, başqa sual ola bilər? Yəni ki, nəyə görə Bakı və Sumqayıtdan olan məzunların sayında ali məktəbə qəbul olunanlar daha üstünlük təşkil edir? Bunun əsas səbəbi ondan ibarətdir ki, böyük şəhərlər olduğuna görə burada ali təhsilə daha çox meyil edirlər. Həm ailə, həm şagirdin özü tərəfindən. Amma peşə təhsilinə və orta ixtisas təhsilinə maraq daha azdır. Bu yaxşıdır, yoxsa pisdir? Regionun sosial-iqtisadi tələblərinə uyğundur, yoxsa yox? Bu başqa diskussiyanın mövzusudur. Mən qeyd etdiyim kimi, bu mifdir.

*- Niyə Azərbaycanda vətəndaşlarda ali məktəblərə epidemik bir həvəs var. Hamı istəyir ki, ali məktəbə daxil olsun. Bu tendensiyanın qarşısını necə almaq olar? Necə etmək olar ki, insan nəyinsə peşəkarı olsun?*

- Bu, tək Azərbaycan üçün unikal problem deyil. Bu gün dünyada gedən bir tendensiyadır. Bir faktı mən sizin nəzərinizə çatdırım. Növbəti 5 il ərzində ali təhsil alan insanların sayı bəşəriyyət tarixində indiyədək ali təhsil haqqında diplom almış insanların sayından çox olacaqdır. Bu tendensiyanın bir çox səbəbləri var. Birincisi, bilik iqtisadiyyatı dövründə yaşayırıq. Bu, o deməkdir ki, bilik ən yüksək dəyərdir. Bilikli insanların, öz biliklərini tətbiq edən insanların əmək bazarında, həyatda şansları daha yüksəkdir. Bu, təbiidir.

Biz bu gün şahidik ki, yüksək bilik tutumlu texnologiyalara malik şirkətlərin, müəssisələrin, ölkələrin dünya iqtisadiyyatında uğur payı nə dərəcədədir. İkincisi, səbəb ali təhsilin daha əlçatan olmasıdır. Azərbaycanda da bu belə olub. Sovet İttifaqı dövrü ilə müqayisə etsək, həmin zaman Azərbaycan ali təhsil müəssisələri ildə təxminən 16 min tələbə qəbul edirdilər. Hazırda bu rəqəm təxminən 33 minə yaxındır. Deməli, iki dəfədən çox artıb. Onu da unutmaq lazım deyil ki, bu təhsili insanlar,

əsasən, öz vəsaitləri hesabına əldə edirlər. Tələbələrin təxminən üçdə biri dövlət hesabına təhsil alır.

Təhsil almaq hər bir insanın bir konstitusion hüququdur. Bu hüququn reallaşmasında təhsil naziri, vətəndaş kimi heç bir problem görmürəm. Burada gördüyümüz problem nədir? Və biz bununla bağlı addımlar da atırıq. Problem odur ki, ali təhsil almaq niyyəti olan insan minimal bilik səviyyəsinə malik olmalıdır. Məhz bu səbəbdən Təhsil Nazirliyinin təşəbbüsü ilə 2015-2016-cı tədris ilindən ali təhsilə qəbulun minimal balı endirilmədi. Bununla bağlı bizim gələcəkdə də siyasətimiz birmənalı olacaq. Əgər abituriyent ali təhsil üçün zəruri olan bilik səviyyəsinə malik deyilsə, niyyətinizdən asılı olmayaraq, siz ali təhsil müəssisəsinə qədəm qoya bilməyəcəksiniz. Bu, birmənalı şəkildə belədir.

*- Azərbaycanda fəaliyyət göstərən bir sıra kolleclər birləşdirildi. Bunun məqsədi nə idi? Eyni aqibət bizim universitetləri də gözləyə bilərmi? Nəzərə alsaq ki, bizim universitetlərimizin adı məşhur 500-lükdə də deyil...*

- Sualınızdakı iki məsələni bir-birindən fərqləndirməliyik. İlk olaraq deyim ki, bunlar təhsil infrastrukturunun, şəbəkəsinin optimallaşdırılmasıdır. Yəni Nazirlər Kabinetinin kolleclərin birləşdirilməsi ilə bağlı son qərarı təhsil şəbəkəsinin optimallaşdırılması zərurətindən, bizim bu istiqamətdə həyata keçirdiyimiz tədbirlərdən irəli gəlir. Bu prosesə biz bu gün başlamamışıq. Doğrudur, son zamanlar bu proses daha da sürətləndirilib. Amma bu işlər mən fəaliyyətə başladığım ilk həftələrdən, ilk aylardan görülür. Xatırlayırsınızsa, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin nəzdində olan bir sıra məktəblərin birləşdirilməsi həyata keçirildi. Ali təhsil səviyyəsində Azərbaycan Müəllimlər İnstitutunun Azərbaycan Dövlət Pedaqoji Universitetinə (ADPU) qoşulması ilə bağlı cənab Prezidentin müvafiq sərəncamı olub. Kolleclərin birləşdirilməsi də bu qəbildən irəli gələn qərardır. Burada əsas məqsəd çox sadədir. Bu sahəyə olan resursların daha səmərəli istifadəsi, təkrarçılığın aradan qaldırılması, daha aydın şəkildə desək, bugünkü əmək bazarında tələb olunan ixtisasların inkişafı, lüzumsuz idarəetmə xərclərinin minimuma endirilməsidir. Hətta o qərarı diqqətlə oxusaq, görərik ki, yumşaq desək, adı belə kifayət qədər aydın olmayan kolleclər mövcud idi. Bu kimi məsələlər dövlətin vahid təhsil siyasətini təmin etmək, resursların mümkün qədər optimallaşmasıdır.

Sualınızda siz həm də universitetlərimizin nəticələrinə toxundunuz. Biz aydın bilməliyik ki, nəyi nə ilə müqayisə edirik. Hər hansı bir təhsil müəssisəsini digəri ilə ədalətli şəkildə müqayisə etmək üçün biz onların sərəncamında olan resurslara diqqət etməliyik. Bir universitet başqa bir universitetə, hətta Azərbaycanda belə, bərabər deyil.

Ötən ilin yayındakı söhbətimizdə də mən söyləmişdim ki, özəl məktəbə gedən şagirdin təhsilinə bəzən 8-10 dəfə daha çox vəsait sərf oluna bilir. Dünya və Azərbaycan təcrübəsində bunu universitetlər üzrə də müşahidə edirik. Düşünürəm ki, burada unikal bir şey yoxdur. Təhsilin səviyyəsi mövcud resurslardan asılıdır. Daha yüksək resursa malik olan universitetlərimizin daha yüksək nəticə göstərmək şansı var. Məsələn, deyək ki, əgər hansısa telekanalda 12 kameralı PTS yoxdursa, o, Avropa Çempionlar Liqasının oyununu, öz işçilərinin peşəkar səviyyəsindən asılı olmayaraq, biz istədiyimiz kimi translyasiya edə bilməyəcək.

Azərbaycan universitetlərinin inkişaf dinamikasına gəlincə, biz regional reytinqlərə diqqət yetiririk. Bunlar MDB məkanını, Şərqi Avropanı əhatə edən və 50 yaşdan daha gənc olan universitetləri ölçən reytinq agentlikləridir. “Times Higher Education”, QS və sair müvafiq agent-

liklərin siyahılarına nəzər salırıq. Yaxşı xəbər ondan ibarətdir ki, son illərdə Azərbaycandan olan bir neçə universitet, məsələn, Bakı Dövlət Universiteti, Qafqaz Universiteti, Xəzər Universiteti, Azərbaycan Dövlət İqtisad Universiteti, Azərbaycan Dillər Universiteti müxtəlif reytinqlərdə yer alıb və irəliləyirlər. Deyək ki, TOP 500-də yoxdur, TOP 700-də var. MDB reytinqlərinə baxanda TOP 100-də var. Şərqi Avropa reytinqlərinə baxanda TOP 150-də var. Burada bizim üçün daha əhəmiyyətli olan həmin o dinamikadır. Onlar irəliləyir, yerində sayır, yoxsa geriyə gedir? Mən düşünürəm ki, biz əminliklə deyə bilirik ki, prinsip etibarilə bizim universitetlərimizin dünya reytinqlərində göstəricisi üzrə dinamikası müsbətdir. Amma bu, bizi qane edirmi? Tam qane etmir, biz daha sürətli irəliləyiş istəyirik.

Bu, həm də insan resursuna bağlı olan məsələdir. Bu istiqamətdə biz cənab Prezidentin təşəbbüsü ilə xaricdə təhsil üzrə Dövlət Proqramını ikinci dəfə hazırlayırıq. Biz universitetlərimizin potensialını gücləndirmək məqsədilə xaricdən gələn professorların Azərbaycan universitetlərində yerləşdirilməsi üçün xüsusi bir proqram nəzərdə tutmuşuq.

- *Xüsusi qabiliyyətli uşaqların ölkə ərazisindən seçilib, onlar üçün xüsusi yerlər hazırlanması, hətta onların cəmiyyətdən təcrid olunması, yeməkləri, yatacaqları, gəzəcəkləri yerləri ayırmaq, xüsusi bir zümrə qurmaq belə bir ideya fikrinizə gəlibmi?*

- Çox maraqlı sualdır. Daha çox təhsildən kənar mövzulara toxunan sualdır. Gəlin belə bir sualdan başlayaq: Biz inanırıqmı ki, bir məktəbin məzunları, 10 milyon əhalisi olan ölkənin bütün zəka və beyin potensialını özündə əhatə edə bilər? Şəxsən mən buna inanmıram. Mən düşünürəm ki, bunu bir məktəbdə, bir məkanda, bir universitetdə etmək qeyri-mümkündür. İstiqamət kimi fikirləşirikmi ki, xüsusi istedad, bilik və bacarığa malik olan şagirdlərin, məktəb şəbəkələrinin, siniflərin infrastrukturunun, universitetlərin formalaşdırılması maraqlı ola bilər? Bir sıra dövlətlər bu yanaşmanı tətbiq edir. Azərbaycanda biz pilot layihəni artıq bir ildir ki, həyata keçiririk. Ölkəmizin 5 regionunda yerləşən 50 pilot məktəbdə 200-ə yaxın təmayüllü siniflər yaratmışıq. Bu siniflərdə xüsusi tədris proqramı ilə yüksək dərəcədə maddi-texniki təchizata malik baza şəraitində tədris keçirilir. Bunu genişləndirmək niyyətindəyik. Paralel olaraq bir sıra məktəblərimizdə, Fizika-riyaziyyat və informatika təmayüllü lisey, Kimya-biologiya təmayüllü liseydə Beynəlxalq Olimpiadalara Hazırlıq Mərkəzləri yaratmışıq. Nəticələr artıq özünü büruzə verir. Bizim şagirdlərimizin iştirak etdiyi beynəlxalq fənn olimpiadalarından Azərbaycana ötən illərdən daha çox medallar gətirmişik. O cümlədən, indiyədək gətirə bilmədiyimiz fənlər üzrə - informatika fənnindən medallar əldə etmişik.

Yeri gəlmişkən, 2019-cu ildə Azərbaycanda informatika üzrə dünya olimpiadasının keçirilməsi planlaşdırılır. Keçən il, bildiyiniz kimi, Beynəlxalq Kimya Olimpiadası keçirildi.

İrəli sürdüyünüz ideya həqiqətən təhsil sistemlərində tanınır. Burada mühüm mövzu həmin məktəblərin, siniflərin, mühitin kifayət qədər təhsilalanlarla əhatə edilməsidir. Əks təqdirdə, biz bunu yalnız bir-iki məktəbdə edəriksə, mən düşünürəm ki, qloballaşan dünyada biz sadəcə olaraq dünyanın aparıcı ölkələri üçün beyin hazırlayacağıq. Beləliklə, Azərbaycan istedadlarının ən yaxşı iş təklifləri alaraq, qlobal iqtisadiyyatın və sosial həyatın inkişafına daha çox töhfə vermısinin şahidi olacağıq. Bizim strateji məqsədimiz ondan ibarətdir ki, say olaraq elə bir infrastruktur yaradılsın ki, həmin istedadlı gənclərin iş yerləri də, yaşa-

yış yerləri də, maddi-mədəni dəyərlər məkanı da doğma Azərbaycanımız olsun.

*- Subyektiv olaraq deyim ki, mənim tanış olduğum dərsliklərin keyfiyyəti məni qane etmir. Dərsliklərin keyfiyyəti ilə bağlı təhsil naziri olaraq sizin fikriniz maraqlıdır.*

- Dərsliklərin hazırlanması və keyfiyyətinin artırılması Təhsil Nazirliyinin qarşısında haqlı olaraq qoyulan məsələlərdən biridir. Son illər ərzində dərsliklərin hazırlanması prosesində dəyişikliklər etmişik. Bütün dəyişikliklərin yeganə məqsədi var: Hazırlanan dərsliklərin keyfiyyətinin artırılmasına nail olmaq. Dəyişikliklər nədir? Birincisi və ən mühümü odur ki, biz dərsliklərin seçim mərhələsində qiymətləndirmə prosesini tam açıq etmişik. Təhsil Nazirliyindən əlavə, digər qurumların bu işə cəlb edilməsinə nail olmuşuq. Bu, özlüyündə yaxşı xəbərdir. Çünki dərslik seçimində həm şəffaflığı artırır, həm də hər hansı bir təkmilləşmənin, təklifin dərslik çap olunandan sonra deyil, dərslik seçim mərhələsində olan zaman aparılmasına imkan verir.

İkincisi, hazırda yanaşma ondan ibarətdir ki, bütün hazırlanma prosesində olan, həmçinin artıq istifadədə olan dərslikləri ictimai rəy üçün açıq elan etmişik. Bunun üçün xüsusi bir portal yaradaraq dərslikləri orada yerləşdirmişik. Təhsil üzrə ekspertlərin, valideynlərin, müəllimlərin, jurnalistlərin, yazıçıların, riyaziyyatçıların və digər mütəxəssislərin dərsliyin məzmununa görə təklifi varsa, bunlar dərsliyin hazırlanması prosesində də istifadə olunur. Bunu nəyə görə etdik? Çünki mən bir daha vurğulamaq istəyirəm ki, dərslikləri yaradan Təhsil Nazirliyi və nazirliyin işçiləri deyil. Dərslikləri yaradan bizim alimlərimiz, müəllimlərimizdir. Təbii olaraq biz həmin bu prosesin təkmilləşdirilməsi, metodikanın, metodiki dəstəyin verilməsi, ictimai müzakirələrin və ekspertizanın səviyyəsinin qaldırılması üçün bütün zəruri olan çərçivəni, şəraiti yaratmalıyıq və artıq müvafiq mühit yaradılıb.

Haqlı olaraq sual səslənə bilər ki, siz bizə sistemi izah edirsiniz, ancaq bizə sistemin izahı yox, dərslik lazımdır. Təhsil Nazirliyinin təşəbbüsü ilə artıq bir ildən çoxdur ki, biz hökumətə qərar layihəsi təqdim etmişik. Bu qərar layihəsi ehtiyat dərsliklərin hazırlanması barədədir. Bu qərar qəbul olunduğu təqdirdə, Təhsil Nazirliyinin səlahiyyəti yaranacaq ki, hər bir fənn üzrə və yaxud ehtiyac duyduğumuz hər bir fənn üzrə ehtiyat dərslik yaradaq. Artıq açıq müsabiqədə qalib gələn müəlliflərlə deyil, həmçinin bu sahədə ölkəmizdə bilik və nüfuza malik olan ekspert müəllifləri seçib ixtisaslar üzrə qruplara bölərək, ehtiyat dərsliyin yaradılmasına nail olaq. Həmin dərsliyin minimal tədris standartlarına cavab verməsini təmin edək. Bu qərar qəbul olunduğu təqdirdə, birbaşa ən güclü mütəxəssisi bu işə cəlb edə bilərik.

Fürsətdən istifadə edib, bütün mütəxəssis və alimlərimizi, dərslik yaradılması üçün özündə potensial bilik və bacarığı görən elm adamlarımızı bu prosesdə iştirak etməyə dəvət edirik. Çünki dərsliyi elm, təhsil sahəsinin mütəxəssisləri yaradır, dövlət məmurları deyil...

*- Mənim yadıma gəlir ki, məktəbimizin direktoru hansısa əməlimə görə, mənə bir sillə vurmuşdu. Mən döyülən şagird olmamışam, amma heç yadımdan çıxmır. Buna görə cəmiyyətdə heç bir faciə baş verməmişdi. Bizim kənddə də, ailədə də. Hətta məktəb direktoru bizim evə gələndə hörmətlə qarşılanmışdı ki, sağ olun, uşağı tərbiyə edirsiniz. Son zamanlar şagirdlərin döyülmə faktları baş verir. Cəmiyyətdən kəskin reaksiya görürük. Yadıma gəlmir ki, buna görə Azərbaycanda indiki qədər ajiotaj olsun. Şagirdlərin döyülmə faktlarına təhsil naziri kimi sizin münasibətiniz necədir?*

- Təhsil Nazirliyi kimi biz buna təbii baxmırıq, baxmaq niyyətində də deyilik.

Birmənalı şəkildə Təhsil Nazirliyinin mövqeyi ondan ibarətdir ki, tədris prosesində bu, yolverilməzdir. İstənilən faktdan asılı olmayaraq təhsil prosesində şagirdin, müəllimin, məktəb direktorunun hər kəsin öz hüquqları və vəzifələri var. Bir tərəfin hüququ harada bitirsə, digər tərəfin hüququ oradan başlayır. Əgər bir tərəf başqa bir tərəfin hüququna aid olan tərəfə, əraziyə müdaxilə edirsə, Təhsil Nazirliyi tərəfindən fərdi qərar qəbul edilir, biz bunu araşdırırıq. Müasir təhsil sisteminə, Azərbaycan cəmiyyətinin inkişaf meyillərinə və dəyərlərinə əsaslanaraq, bunu yolverilməz hesab edirik.

Bu məsələ ətrafında olan ajiotaja gəldikdə, bunun da iki səbəbi var. Birincisi, bu halın baş verməsidir. Çünki hadisə olmasa, bunun ətrafında müzakirə də olmazdı. İkinci məsələ ondan ibarətdir ki, KİV-in, sosial şəbəkələrin cəmiyyətdə bu və ya digər səbəbdən haqlı mövqeyə malik olan fərdi şəxsləri maarifləndirməklə reytinq yığmaq arasındakı fərqli fəaliyyətini fərqləndirməliyik.

Əgər baş verən istənilən mənfi halla mübarizənin ilk addımı maarifləndirməkdirsə, reytinq və sosial şəbəkədə daha çox “like”, seyrçi yığmaq üçün maarifləndirmək o qədər də cəlbedici alət deyil. Təhsil sistemində bu halların hansısa oturuşmuş ehkamlardan, müəllimə olan münasibətimizdən asılı olmayaraq, şagirdin, vətəndaşların müxtəlif fikirlərinə baxmayaraq, Təhsil Nazirliyinin mövqeyi olaraq deyirəm ki, təhsil sahəsində bu, baş verməməlidir. Heç bir müəllimin heç bir şagirdə əl qaldırmaq hüququ yoxdur. Eləcə də əksinə, heç bir şagirdin heç bir müəllimin hüququnu tapdalamağa haqqı yoxdur. Mən əminliklə deyə bilərəm ki, işlədiyim dövrdə biz həm müəllimlərin, həm şagirdlərin hüququna toxunan addımların qarşısını almışıq və müvafiq cəza tədbirləri görmüşük.

*- Maarifçilik Fondunun yaradılması ilə bağlı müzakirələr gedir. Bu fondun yaradılmasında əsas məqsəd nədir?*

- Bu fond bir məqsəd üçün yaradılıb. Məqsəd ondan ibarətdir ki, biz ali təhsil səviyyəsində təhsil alan tələbələrə tələbə kreditlərinin və gələcəkdə imkan olarsa, tələbə qrantlarının verilməsi üçün bir alət yaradırıq. Biz bu prosesə təxminən bir il bundan öncə başlamışıq. Təəssüflər olsun ki, Təhsil Nazirliyinin dövlət büdcəsində bunun üçün xüsusi məqsəd olmadığına görə, biz bu layihəyə Təhsil Nazirliyinin tabeliyində olan 11 ali təhsil müəssisəsini cəlb etmişik və bir sıra özəl şirkətlərlə də müzakirələr aparırıq. Maarifçi Fondu artıq Ədliyyə Nazirliyi tərəfindən qeydiyyatdan keçib. Fondun iştirakçısı olan 11 ali təhsil müəssisəsində yaxın aylardan başlayaraq fondun qaydalarına əsasən, belə krediti almaq üçün müraciət edən tələbələr bu imkandan yararlana biləcəklər. Bu kreditlər bir məqsəd daşıyır, təhsil haqqının ödənilməsi. Bu vəsaitin geri qaytarılması da tələbənin gələcəkdə əmək bazarında işə qəbul olandan sonra 5, 7 və yaxud 10 ilə həyata keçiriləcək.

Onu da əlavə edim ki, Təhsil Nazirliyi tərəfindən ilk dəfə olaraq, ali təhsil müəssisələri məzunlarının işə qəbulu barədə məlumat hazırlanıb. Bu məlumatlar yaxın vaxtlarda ictimaiyyətə təqdim olunacaq. Bu, valideynlər və məzunlar üçün çox faydalı məlumat olacaq. Çünki bununla açıq şəkildə hansı universitetin məzunu olduğu təqdirdə, məzunun işə düzəlmə şansının nə qədər olması barədə onlara məlumat veriləcək. Bu, həmçinin ali təhsil müəssisəsinin kütləviliyi və hansı ali təhsil müəssisəsinin seçilməsi kimi suallara da aydınlıq gətirəcək.

*- Maarifçi Fondu hansı vəsait hesabına formalaşdırılacaq?*

- Bu layihəyə qoşulmuş 11 təhsil müəssisəsi hər biri öz kvotaları çərçivəsində təhsil haqqı dəyərində müəyyən sayda yer ayırıblar. Şərti olaraq deyək ki, Azərbaycan Dövlət İqtisad Universiteti bir tədris ili üçün 50 belə

kreditin ödənilməsini öz üzərinə götürüb. Ancaq qiymətləndirməyə gəldikdə, yəni hansı tələbə bu krediti ala bilər? Bu, universitet tərəfindən yox, fond tərəfindən həyata keçiriləcək. Yaxın vaxtlarda fonda icraçı direktor təyin olunacaq, hər bir iştirak edən təsisçi tərəfindən nümayəndələr ayrılacaq.

Fürsətdən istifadə edərək, bu işin bünövrəsində olmaq istəyən sahibkarlara, iş adamlarına müraciət edirik. Çünki bu layihəni özəl sektorla tərəfdaşlıq layihəsi kimi dəyərləndiririk. Əgər onlar da qoşularsa, tələbənin yalnız təhsil haqqı ilə bağlı deyil, yaşayış xərcləri, digər ehtiyacları ilə bağlı da kredit verə bilərik.

*- Tələbələrə verilən təqaüdlərdə də yeniliklər oldu...*

- Cənab Prezident bu sərəncamı imzalamaqla Azərbaycan Respublikasının ali təhsil müəssisələrində təhsilin keyfiyyətinin qaldırılmasına böyük töhfə vermiş oldu. Artıq ikinci semestrdən istər dövlət sifarişi ilə, istər ödənişli təhsil alan tələbə yaxşı, əla qiymətlərlə oxuduğu təqdirdə dövlət tərəfindən təqaüd ala biləcək. Bu da tələbələr arasında sağlam rəqabətə gətirib çıxaracaq, ictimai nəzarəti əhəmiyyətli dərəcədə gücləndirəcək. Çünki öncədən öz hesabına təhsil alan tələbələr üçün maraqlı deyildi ki, dövlət sifarişi ilə təhsil alan tələbənin biliyi obyektiv qiymətləndirilir, ya yox. Çünki o, təqaüdü dövlət hesabına təhsil aldığı üçün əldə edirdi. Ona görə tələbələrə uğurlar. Çünki bu dəyişiklik ən yaxşı oxuyan tələbələrin təşviqi üçün vacib bir alətdir.

*- Daha bir yenilik məktəb müşavirliklərinin yaradılması planıdır. Bununla bağlı hansı addımlar atılacaq?*

- İlk növbədə, şərti adı məktəb müşavirləri layihəsi kimi düşünürük. Hazırda bununla bağlı nazirlikdə işçi qrupu formalaşdırılıb.

Layihə çərçivəsində qarşımıza hansı məqsədləri qoyuruq? Birinci məqsəd məktəblərdə müəllim-şagird, direktor-müəllim, məktəb rəhbəri-şagird və şagirdlər arasında olan münasibətlərdə qeyri-sağlam və mənfi hallar varsa, onların profilaktikası, ortaya çıxarılması və aradan qaldırılmasıdır. Belə bir təcrübə bir sıra dövlətlərin təhsil sistemində də mövcuddur. Hazırda qeyd etdiyim kimi, pilot layihə çərçivəsində bu məsələləri nəzərdə tuturuq. Bu layihənin həyata keçirilməsi nəticəsində şagirdlərin məruz qaldığı təhlükələrin, şagird-müəllim münasibətlərində olan neqativ halların, o cümlədən tamamilə kənar qüvvələr tərəfindən atılan mənfi addımların qarşısını almış olacağıq.

*- Peşə Təhsili Dövlət Agentliyinin yaradılması ilə bağlı işlər görülür. Təhsil və agentlik, bunlar bir-birinə yad kəlmələrdir. Bəs, bu agentlik nəyə xidmət edəcək?*

- Azərbaycan Respublikası Prezidentinin tapşırığına uyğun olaraq, biz ilk peşə-ixtisas təhsilinin optimallaşdırılmasına yönəlmiş addımları həyata keçiririk. Burada iki istiqamət var. Birincisi, mövcud olan şəbəkənin optimallaşdırılması. Yəni, hazırda fəaliyyət göstərən ilk peşə-ixtisas təhsili müəssisələrinin fəaliyyətinə yenidən baxılması, onların bəzilərinin fəaliyyətinin əsaslı şəkildə dəyişdirilməsi. İkincisi isə institusional, yəni peşə təhsili səviyyəsində təhsil alan məzunlarla əmək bazarı, işəgötürənlər, ölkə iqtisadiyyatının real tələbləri arasında uyğunluğun daha yüksək səviyyəyə qaldırılmasıdır. Bunun səbəbləri bəllidir. Birincisi, bizim əmək bazarımız kifayət qədər peşə təhsili sistemindən çıxan kadrlarla təmin olunmalıdır. Bu gün Azərbaycanda əmək miqrasiyası proseslərini də görürük. Xaricdən gələn işçi qüvvəsi ilə rastlaşırıq. Digər tərəfdən, Azərbaycanın çox müsbət demoqrafiq göstəriciləri var. Bu da o deməkdir ki, bizim gələcəkdə peşə təhsilinə qəbul etdiyimiz gənclərimizin sayı getdikcə artacaq. Üçüncüsü, sürətli iqtisadi dəyişikliklər dövründə hansısa peşənin sahibi olan

insanlar arasında təhsilə maraq artır. Çünki elə olur ki, onların fəaliyyət göstərdiyi sahələrdə iş yerləri bağlanır, fərqli sahələrdə iş yerləri açılır. Belə olduğu halda, onların yeni ixtisaslara yiyələnməsinə tələbat yaranır. Bütün bu fəaliyyətin əlaqələndirilməsi məqsədilə Peşə Təhsili Dövlət Agentliyinin yaradılmasına dair hazırlıq işləri görülüb. Artıq bu sənəd Nazirlər Kabineti tərəfindən ölkə rəhbərliyinə təqdim olunub.

Yeni yaradılacaq qurumun ad məsələsinə gəldikdə, bu, sadəcə olaraq dövlət qulluğunun tələblərindən irəli gələn amildir. Müxtəlif mərkəzi icra hakimiyyəti orqanlarının nəzdində agentliklər fəaliyyət göstərə bilər.

*- Məktəb direktorlarının təyinatı ilə bağlı da yeniliklər var. Bu yeniliklər nədən ibarətdir?*

- Birincisi, biz düşünürük ki, bu sahədə əhəmiyyətli dəyişikliklərə nail olmuşuq. İlk növbədə, biz məktəb direktorlarının təyin olunmasını bir neçə mərhələdən ibarət müsabiqə əsaslı prosesə çevirmişik. Buna Bakı şəhərindən pilot layihə olaraq başladıq. Son iki il ərzində Bakı şəhərində təyin etdiyimiz bütün məktəb direktorları rəqabətli seçim əsasında təyin olunub. Tam açıq və şəffaf danışsaq, bu proses nəticəsində kadr təyinatında olan bütün mənfi halların qarşısı alınıb.

2016-cı ildən başlayaraq biz bu təcrübəni Sumqayıt, Gəncə və həmin şəhərlərin ətrafında olan bir sıra rayonlara da tətbiq etməyə başlamışıq. Məktəb direktoru olmaq üçün zəruri anket keyfiyyətlərinə malik olan, direktor olmaq istəyən hər bir şəxs müraciət edə bilər. İlkin seçim nəticəsində onlar universitetlərin təlim bazasında yaradılan 5 aylıq təlim proqramında iştirak edirlər. Bu təlimləri uğurla başa vuran namizədlər imtahan verir və müsahibə mərhələsindən keçir. Yalnız bu mərhələləri müvəffəqiyyətlə keçənlər məktəb direktoru təyin oluna bilər. Beləliklə, respublikanın ərazisini kifayət qədər böyük həcmdə - təxminən 50 faizə yaxın olan şəbəkəni əhatə edəcəyik. Bu, aparılan islahatların yalnız birinci mərhələsidir. Çünki ikinci mərhələdə bu prosesin əks mərkəzləşməsinə nail olmağa çalışacağıq. Sadə dillə desək, bu gün və hər zaman Azərbaycanda fəaliyyət göstərən təxminən 4500 məktəbin hər birinin direktorunu Təhsil Nazirliyi təyin edir. Ancaq təhsil naziri hər gün bir nəfəri qəbul etsə, təxminən 12-15 illik bir müddət olar. Bu isə bir səmərəsizlik kimi görünür.

Hazırda dövlət başçısının sərəncamına uyğun olaraq, regionlarda maliyyə hesablaşma idarələrinin yaradılması prosesi gedir. Bir neçə rayonda fəaliyyət göstərən şöbələr əsasında regional hesablaşma mərkəzləri yaradılır. Rayon təhsil şöbələri müdirlərinin təyinatı rayon icra hakimiyyətlərinin rəhbərləri tərəfindən Təhsil Nazirliyi ilə razılaşdırılmaqla həyata keçirilir. Gələcəkdə biz düşünürük ki, əgər regional təyinatlar Təhsil Nazirliyi tərəfindən həyata keçirilərsə, bura təyin olunan həmkarlar təhsil siyasətini, təhsilin inkişafı üzrə Dövlət Strategiyasından irəli gələn tələbləri bilən və seçilən adamlar olarlarsa, məktəb direktorlarının təyinatı da yerli səviyyədə baxılmalıdır. Bu təyinatlar Təhsil Nazirliyi tərəfindən deyil, regional səviyyədə həyata keçirilsin. O şərtlə ki, təyin olunan direktorlar bu ixtisaslaşmış təlimdən keçmiş, zəruri biliklərə malik insanlar olsun. Bu addımları atmaqla biz faktiki olaraq subyektivlik, mənfi amilləri aradan qaldırırıq və yalnız peşəkarlıq, bilik prinsiplərini əsas götürürük. Ona görə də islahatın birinci mərhələsini başa çatdırmışıq. Əminliklə deyə bilərik ki, bu gün hər bir məktəb direktorunun təyinatı tam şəffaf həyata keçirilir. İslahatın ikinci mərhələsində isə bu prosesi daha yeni səviyyəyə çatdırmaq niyyətindəyik.

**“Azərbaycan müəllimi” qəzeti,**
**27 fevral 2016-cı il**

# EKSPERİMENT: MƏNTİQİ-QNESEOLOJİ ASPEKTLƏRİ VƏ İDRAKİ YÜKÜ



**Əziz Məmmədov,**
***Bakı Dövlət Universitetinin professoru,***
***fəlsəfə üzrə elmlər doktoru***

**Fuad Məmmədov,**
***Sumqayıt Dövlət Universitetinin***
***kafedra müdiri, dosent***



***Açar sözlər:*** *metod, idrak, məntiqi-qnoseoloji aspekt, eksperiment.*
***Ключевые слова:*** *метод, познавательные, логико-гносеологический аспект, эксперимента.*
***Key words:*** *method, cognitive, logical-epistemological aspect, experiment.*

Elmi tədqiqatın tarixən qədim və geniş yayılmış metodlarından biri də eksperimentdir. Elmdə eksperimental metodun qərarlaşması uzun sürən mürəkkəb proses olmuşdur. İnsan onu əhatə edən aləmi öyrənmək üçün ekspermentdən lap qədim zamanlardan istifadə etməyə başlamışdır. İlk əvvəllər təbiət hadisələrinin yalnız empirik müşahidəsi ilə kifayətlənən insan daha sonralar toplanmış təcrübə və nəzəri biliklər əsasında hadisələrin onu maraqlandıran tərəf və cəhətlərini fikrən ayırmağa, onları öyrənilməsi daha asan olan xüsusi şəraitə gətirməyə başlamışdır. O vaxtdan etibarən eksperiment idrakın mümkün metod və vasitələri sırasına daxil edilmiş və sonralar elmin, texnikanın inkişafı sayəsində durmadan təkmilləşdirilərək nəzəri idrakı xeyli inkişaf etdirmişdir. Əgər nəzəri fikir tarixində təcrübi elmin əhəmiyyətinin nəzəri əsaslandırılması şərəfi ingilis alimi F.Bekona məxsusdursa, bu elmin əsasını qoyan və ona metodoloji status qazandıran italyan alimi Q.Qaliley olmuşdur [1, s.123]. Müşahidə və eksperimentlər aparmaq məqsədilə Qaliley nəinki yeni cihazlar ixtira etmiş, həm də bir sıra süni və ideal eksperimentlər aparmağa nail olmuşdur. Elmin və texnikanın coşqun inkişaf etdiyi hazırkı dövrdə eksperimental metod daha geniş vüsət tapmışdır. Müasir elmin, xüsusilə təbiətşünaslığın inkişafını eksperimentsiz təsəvvür etmək mümkün deyil. Hazırda eksperimental tədqiqatın əhəmiyyəti o dərəcədə artmışdır ki, nəticədə o nəinki müasir elmin metodologiyasının mühüm tərkib hissəsinə, həm də praktiki fəaliyyətin əsas formalarından birinə çevrilmişdir.

Eksperiment latın sözü olub, sınaq, təcrübə, sübut mənasına uyğun gəlir. Eksperiment həmişə müşahidə ilə bağlıdır, hətta tarixi baxımdan ona müşahidə metodunun inkişafı kimi də baxmaq olar. Lakin müşahidədən fərqli olaraq eksperimentdə insan hadisələri yalnız seyr etməklə kifayətlənməyib, həm də onların gedişinə fəal surətdə müdaxilə edərək onları elə bir

“süni” vəziyyətə gətirir ki, bu halda onların xassələrini öyrənmək təbii haldakına nisbətən daha asan olur. Obyektiv proseslərə müdaxilə edən tədqiqatçı buna müxtəlif yollarla – ya öyrənilən prosesə bilavasitə təsir etməklə, ya da proseslərin cərəyan etdiyi real şəraiti dəyişməklə nail olur. Sadə müşahidənin prosesə fəal təsirlə tamamlanması eksperimenti empirik tədqiqatın ən səmərəli və məhsuldar metoduna çevirir. Məşhur amerikan filosofu və sosioloqu Q.Uells bu münasibətlə qeyd edir ki, sadə müşahidədən fərqli olaraq eksperiment “xarici örtük altındakına daha dərindən nüfuz edərək inkişaf edən və qarşılıqlı əlaqələnən təbiətin mahiyyətini təşkil edir” [2, s.87]. Müşahidə ilə müqayisədə eksperimentin mühüm üstünlüyü bundadır ki, onun vasitəsilə tədqiq olunan obyektin müşahidəçi üçün maraqlı olan əlaqələrini, münasibətlərini, tərəflərini seçmək, prosesi qəlizləşdirən əlavə amilləri aradan qaldıraraq əsas diqqəti tədqiqatçını maraqlandıran hadisənin və ya xassənin üzərinə yönəltmək imkanı qazanılır. Buna görə də eksperiment obyekt haqqında daha dəqiq bilik əldə etməyə imkan verir. Məşhur rus kimyaçısı A.M.Butlerov eksperimentin bu cəhətini yüksək qiymətləndirərək yazırdı: “Təbiət hadisələrini müşayət edən şərait, adətən, o dərəcədə mürəkkəb olur ki, müşahidəçi onlardan hansının daha əhəmiyyətli olduğunu ilk vaxtlar aydınlaşdıra bilmir. Bu zaman təcrübə onun köməyinə gəlir. Biz bilərəkdən məcbur edirik ki, məhz bizi maraqlandıran hadisə baş versin, həm də o, hər cür deyil, məhz elə baş versin ki, onun müşahidəsi bizim üçün daha əlverişli olsun” [3, s.22].

Eksperimentin çox mühüm üstünlüklərindən biri də onun idrak obyektinin xassələrini müxtəlif ekstremal şəraitlərdə – çox alçaq və çox yüksək temperaturlarda, çox yüksək təzyiqlərdə, çox böyük intensivliyə malik elektrik və maqnit sahələrində tədqiq etməyə imkan verməsindədir. Zərurət olduqda eksperimentator eksperimentə yeni-yeni amillər daxil etməklə elə nəzəri nəticələr əldə edir ki, bunları öyrənilən hadisənin təbii halında adətən aşkar etmək olmur. Bu cür şəraitlərdə aparılan təcrübələr idrak obyektinin gözlənilməz və təəccüblü görünən xassələrini açmağa və onların mahiyyətinə daha dərindən nüfuz etməyə imkan verir. İfratkeçiricilik və ifrataxıcılıq məhz belə ekstremal şəraitlərdə kəşf olunmuş fiziki hadisələrdir. Rus alimi P.N.Lebedev tərəfindən işıq təzyiqinin kəşfi də eksperimentin möcüzələrindən olub, onun bu səciyyəvi cəhətini qabarıq əks etdirir.

Məlum olduğu kimi, XIX əsrin sonlarınadək maddə və işıq öz təbiətlərinə görə bir-birinə qarşı qoyulurdu: maddə kütləyə malik olub, maddi sayıldığı halda, işığa kütlədən məhrum olan qeyri-maddi, xalis hərəkət kimi baxılırdı. Uzaqgörən alim və əqidəli materialist olan P.İ.Lebedev işığın maddiliyinə əmin olub, bu müddəanı təsdiq edə biləcək sübutlar axtarırdı. O, belə mülahizə yürüdürdü: əgər işıq maddidirsə, deməli, o, kütləyə malik olmalı və obyektə təzyiq göstərməlidir. Bu mülahizədən çıxış edən P.N.Lebedev bir sıra çətinlikləri aradan qaldıraraq çox həssas və mürəkkəb təcrübələrlə işıq təzyiqini aşkar etdi və onu əvvəlcə bərk cisimlərdə, sonra isə qazlarda ölçdü. P.N.Lebedevin şagirdi akademik S.İ.Vavilov dünyanın maddi vəhdətini sübut edən həmin kəşfi yüksək qiymətləndirərək qeyd etmişdir ki, bu kəşfdən sonra “fizik üçün işıq tam mənası ilə hərəkətdə olan materiyanın bir forması oldu və işıq ilə materiyanın bir-birinə qarşı qoyulması cəhdi həmişəlik aradan qalxdı” [4, s.11].

Eksperimentin mühüm məziyyətlərindən biri də onun təkrarlanan olmasıdır. Bu göstərir ki, eksperimentin gedişində aparılan müşahidə, müqayisə və ölçmə səhih məlumatlar əldə edilənədək dəfələrlə təkrar

oluna bilər. Eksperimentin xüsusilə dəyərli olan bu cəhəti, əsasən, iki səbəblə: əvvəla, eksperimentin gedişində tədqiqat obyektinə edilən təsirin həmişə mümkün olması ilə, ikincisi, eksperimentin baş tutması zəruri olan şəraitin müşahidəçi tərəfindən yaradılması ilə şərtlənir. Elmi-tədqiqat üçün son dərəcə əlverişli olması və təkrarlana bilməsi eksperimenti elmi mülahizələri və nəzəri nəticələri yoxlamağın mühüm vasitələrindən birinə çevirir.

Müşahidə ilə müqayisədə eksperimentin bir sıra digər üstünlükləri də vardır. Eksperiment hadisənin cərəyan etdiyi real şəraiti dəqiq təyin etməyə, bu şəraiti dəyişdirməyə, bilavasitə vizual müşahidə olunmayan hadisələri öyrənməyə, təbii proseslərin analoqunu və modelini yaratmağa, proseslərin sürətini artırmaqla onların mahiyyətinə daha dərindən nüfuz etməyə, hadisələrin hərtərəfli və dəqiq dərki əsasında onların təsir dairəsini genişləndirməyə və nəhayət, hadisələrin daxili səbəblərini açmağa imkan verir.

Eksperimentin məzmununa qnoseoloji baxımdan yanaşdıqda onda vəhdət təşkil edən iki əks tərəfin – obyektiv və subyektiv momentlərin mövcud olduğunu görmək olar. Eksperimentin obyektiv tərəfini eksperimentatorun tədqiq etdiyi obyektiv şeylər, proseslər, hadisələr və eksperiment vasitələri (cihaz, aparat, alətlər), subyektiv tərəfini isə eksperimentçinin şüurundan asılı olan elementlər təşkil edir. Eksperimentin xarakteri bir tərəfdən, tədqiq olunan hadisənin spesifikasından və mövcud elmi biliklərin inkişaf səviyyəsindən, digər tərəfdən, bilavasitə şüura aid edilən bir sıra subyektiv amillərdən – alimin yaradıcılığından, onun fəallıq dərəcəsindən, idrak obyektinin, rəhbər ideyanın və tədqiqat məqsədinin seçilməsindən asılıdır. Ümumiyyətlə, eksperimentin subyektiv tərəfinə insanın hiss orqanlarının xüsusiyyətləri, onun nəzəri hazırlığı, elmi biliyinin, mənəvi mədəniyyətinin inkişaf səviyyəsi, elmi-eksperimental tədqiqatın metodikası, müəyyən nəzəri biliyə və eksperimental vərdişlərə malik eksperimentatorun özü, habelə onun qarşıya qoyduğu məqsəd və vəzifələrdən ibarət məntiqi komponentlər daxildir.

Bütün yuxarıda deyilənlərə əsaslanıb müasir elmi eksperimentin strukturunda aşağıdakı maddi və məntiqi komponentləri fərqləndirmək olar:

1. Həqiqiliyi eksperimental tədqiqatlarda yoxlanılan nəzəri ideya, hipoteza, fərziyyə.
2. Eksperimental tədqiqatın obyekti kimi çıxış edən predmetlər, proseslər, hadisələr.
3. Tədqiqat obyektinə təsir etmək məqsədilə istifadə olunan amillər.
4. Kənar təsirlərdən qorunmaq üçün istifadə olunan müdafiə vasitələri.
5. Eksperimentin cərəyan etdiyi şəraitə nəzarət etmək məqsədilə istifadə olunan cihazlar sistemi və digər vəsaitlər.
6. Elmi eksperimental tədqiqatın məntiqi, başqa sözlə, elmi eksperiment üçün səciyyəvi olan əsas əməliyyatların məntiqi əlaqəsi.
7. Eksperimental qurğuya xidmət göstərən, onu idarə edən, onun tərkib komponentlərini əlaqələndirən, eksperimental eksperimentin gedişini izləyən və nəticələrini qeydə alan eksperimentator və ya bir qrup şəxs.

Elmi eksperimentin yuxarıda göstərilən tərkib komponentləri nisbi müstəqilliyə malikdir. Doğrudan da, elmi idrak üçün subyektiv amillərin rolu böyük olsa da, onların eksperimentə təsiri heç də mütləq səciyyə daşımır; məhdud xarakter daşıyan bu təsirin hüdudları bilavasitə xarici aləmlə, eksperimentin obyektiv tərəfi ilə müəyyən olunur. Eksperimentin subyektiv tərəfinin nisbi müstəqilliyi eksperimentatorun şüuru tərəfindən irəli sürülən və onun obyektə fəal müdaxiləsini şərtləndirən, eksperimentçinin şəxsi keyfiyyətlərindən və

deməli, potensial imkanlarından asılı olan məqsədə tabedir. Bu nisbi müstəqillik, həmçinin eksperimentin aparıldığı şəraitin standartlaşdırılmasından da asılıdır. Müasir eksperimental praktikanın bu tələbi ondan irəli gəlir ki, müxtəlif eksperimentçilər eyni bir eksperimental məsələnin həllinə nəinki müxtəlif mövqelərdən yanaşır, həm də biliyin səviyyəsindən, elmi dünyagörüşlərindən, elmi maraqlarının istiqamətindən və digər amillərdən asılı olaraq onun həllini müxtəlif cür reallaşdırırlar.

Beləliklə, eksperimentin nisbi müstəqilliyə malik subyektiv tərəfi onun obyektiv tərəfi ilə müəyyən olunur və bütün ideal obrazlar kimi öz məzmununa görə obyektiv səciyyə daşıyır. Eksperimentin gedişində onun subyektiv tərəfinin eksperimentə təsiri yalnız eksperimentçinin şüurundan, bu gedişə təsirindən deyil, həm də bu tərəfin praktiki, hissi-maddi təbiətindən irəli gəlir. Belə ki, eksperimentin gedişində eksperimentçinin şüuru həm də maddi formalarla – eksperimentçinin tətbiq etdiyi alət və cihazlarla ifadə olunur. Eksperimentçinin nəzəri fəaliyyəti və bu fəaliyyətin nəticələri: məqsəd, ideya, prinsip və s. məhz eksperimentdə tətbiq olunan cihazlar vasitəsilə maddiləşir. Hər bir cihaz maddi cisim olduğu halda, heç də hər cür maddi cisim cihaz deyildir. Müasir fiziki eksperimentin mühüm elementlərindən olan “cihaz” anlayışı sözün geniş mənasında, əvvəla, baxılan fiziki hadisənin cərəyan etməsi üçün zəruri olan şəraitin yaradılmasında və ikincisi, bu hadisənin eksperimentçini maraqlandıran kəmiyyət xarakteristikalarının ölçülməsində istifadə olunan bütün texniki vasitələrin məcmusudur” [5, s.464-466]. Cihaz ilə tədqiqat obyektinin qarşılıqlı təsiri qnoseoloji baxımdan adi maddi qarşılıqlı təsirlərdən keyfiyyətcə fərqlənir. Cihaz olmaqdan ötrü maddi cisim obyektiv qanunlar əsasında insan tərəfindən onlara isnad verilən müəyyən keyfiyyətlər kəsb etməlidir. Elmi idrakda müəyyən qnoseoloji funksiyanı yerinə yetirən cihaz idrak vasitəsi olub, insanın təbii duyğu orqanlarının bir növ süni əlavəsi kimi çıxış edərək onların fəaliyyət imkanlarını xeyli artırır. Bu mənada cihaz, eksperimentin obyektiv tərəfinə deyil, nəticə etibarilə yalnız subyektiv tərəfinə daxil olur. Məlum olduğu kimi, kvant mexanikasının öyrəndiyi atom obyektləri ikili təbiətə malik olub, korpuskulyar və dalğa xassələrinin vəhdətini təcəssüm etdirirlər. Eksperimentlər göstərir ki, mikroobyektlərin müəyyən cihazla qarşılıqlı təsirində onların korpuskulyar, başqa növ cihazla qarşılıqlı təsirində dalğa, üçüncü növ cihazla qarşılıqlı təsirində isə həm korpuskulyar, həm də dalğa xassəsi eyni zamanda təzahür edir. Eksperimentin gedişində mikroobyekt və cihaz qarşılıqlı təsirə girərək vahid fiziki sistemə çevrilirlər.

Eksperimentin təbiəti mürəkkəbdir. İnsanın obyektə maddi təsir vasitəsi, gerçəkliyin praktiki mənimsənilməsi üsulu olan eksperiment insanın yalnız həyati ehtiyaclarını ödəmək məqsədilə deyil, həm də elmi məqsədlə – obyekti tədqiq etmək, onu öyrənmək məqsədilə aparılır. Buna görə də eksperimentdə yalnız praktika üçün deyil, həm də nəzəri təfəkkür, məntiqi idrak üçün səciyyəvi olan cəhətlərə – tədqiqatçını maraqlandıran tərəflərin seçilib ayrılmasına və digər mühüm tərəflərin sərf-nəzər edilməsinə rast gəlinir. Buna görə də eksperiment bir növ praktiki abstraksiyadır.

Eksperiment yalnız praktika ilə deyil, həmçinin nəzəri təfəkkürlə də sıx bağlıdır. Eksperimentin nəzəriyyə ilə əlaqəsi öz ifadəsini fikri eksperimentdə tapır. Fikri eksperiment maddi-real eksperimentdən bununla fərqlənir ki, real eksperimentdə obyektin özündən istifadə edən alim fikri eksperimentdə onun fikri obrazından, ideal modelindən istifadə edir. Real eksperi-

mentdən fərqli olaraq fikri eksperiment subyektin nəzəri fəaliyyətinin spesifik formasıdır, başqa sözlə, fikri eksperiment real eksperimentin ideal formasıdır. Obraz və model təsəvvürləri üzərində aparılan fikri eksperimentlərdən xalis məntiqi üsulla alınması mümkün olmayan yeni biliklər əldə edilir. Fikri eksperiment maddi eksperimentlə nəzəriyyə arasında aralıq mövqe tutaraq, özündə bir növ real eksperimentin gücü ilə məntiqin gücünü birləşdirir. Real eksperimentlə fikri eksperiment arasında analogiya mövcuddur. Fikri eksperiment həyata keçirilərkən şüurda real eksperimentin strukturu və həyata keçirildiyi şərait bərpa edilir. Fikri eksperimentin gedişində aşağıdakı əməliyyatlar icra olunur: 1) müəyyən qaydalar əsasında tədqiq olunan obyektin fikri modelinin, ideallaşdırılmış şəraitin və modelə təsir göstərən ideallaşdırılmış "cihazların" quraşdırılması; 2) şəraitin şüurlu və planlı şəkildə dəyişdirilməsi, onların ixtiyari formada reallaşdırılmış kombinasiyasının modelə təsirinin təmin edilməsi; 3) fikri eksperimentin bütün mərhələlərində obyektiv qanunların və elmi faktların şüurlu, planlı şəkildə tətbiq olunması.

Elmi idrakda fikri eksperimentin rolu böyükdür. İxtiyari fikri eksperimentin təhlili göstərir ki, onun əsas idraki rolu irəli sürülmüş prinsip və fərziyyələri əsaslandırmaqdan ibarətdir. Tarixən ilk fikri eksperiment (üfüqi müstəvidə cismin hərəkətinin öyrənilməsi) Aristotelin hərəkət nəzəriyyəsini tənqid etmək məqsədilə Q.Qaliley tərəfindən söylənilmiş və o, özünün ətalət prinsipini məhz bu təcrübə ilə əlaqələndirməyə çalışmışdır. Digər bir tarixi fikri eksperiment (ideal buxar maşını haqqında mülahizələr) isə fransız fiziki S.Karnoya təklif edilmişdir. Karno tərəfindən istilik miqdarının saxlanması təsəvvürləri əsasında formulə etdiyi "istilik proseslərinin geriyə dönməzliyi prinsipi"ni fikri eksperiment vasitəsilə əsaslandırmışdır.

Fikri eksperimentdən müasir fizikada da geniş istifadə olunur. A.Eynşteyn nisbilik nəzəriyyəsinin başlıca prinsiplərini əsaslandırmaq və izah etmək məqsədilə fikri eksperimentdən (məsələn, ekvivalentlik prinsipini əsaslandırmaq üçün düşən lift fikri eksperimentindən) istifadə etmişdir. V.Heyzenberq isə kvant təsəvvürləri əsasında formulə etdiyi qeyri-müəyyənlik münasibəti»ni əsaslandırmaq və izah etmək üçün elektronun vəziyyət və sürətinin fikrən ölçülməsi təcrübəsindən istifadə etmişdir.

Son vaxtlar müasir fizikanın inkişafında səmərəli rol oynadığı üçün fəlsəfi, psixoloji və təbii-elmi ədəbiyyatda "fikri eksperiment" terminінə daha tez-tez rast gəlinir. Lakin müxtəlif müəlliflər bu termini müxtəlif cür mənalandırırlar. Mövcud elmi ədəbiyyatda fikri eksperimentin idrak obyektinin bəzi tərəflərindən sərf-nəzər etməyə imkan verən, xüsusi halda isə "ideallaşdırılmış" obyektlərlə "əməliyyat aparmağa imkan verən metod kimi" [6, s.34], fikri məsələləri həll etməyin üsulu kimi, "eksperiment forması olan adi nəzəri mülahizə kimi", riyazi işarələrlə aparılan əməliyyat kimi, nəzəriyyənin izah edilməsinin sxemi kimi və s. təriflərinə rast gəlmək olar. Fikri eksperiment haqqında irəli sürülən müasir mülahizələrdə təfəkkürün bu mürəkkəb, sintetik formasının müəyyən tərəfləri, momentləri düzgün əhatə olunsa da, onun spesifikliyi, özünəməxsusluğu ayrıca bir tərifdə tam ifadə oluna bilmir; çünki hər bir tərif natamam və təxmini olub, tərif verilən obyektə məxsus bəzi xarakteristikaların qismən də olsa mütləqləşdirilməsinə əsaslanır. Buna görə də fəlsəfi-metodoloji ədəbiyyatda irəli sürülən belə bir fikirlə razılaşmaq olmaz ki, guya fikri eksperiment nəzəri mülahizələrin xüsusi zümrəsinə aid olub, artıq təbiətşünaslığın inkişafında öz rolunu başa vurmuş və buna görə də bir daha

həyata qayıda bilməz.

Fikri eksperiment evristik səmərəsi xeyli böyük olan nəzəri mülahizələrin spesifik növü olub, real eksperimentlərin mexanizminin ümumiləşdirilməsi yolu ilə qərarlaşmışdır.

Hər bir real eksperiment həmişə konkret formada baş verməklə ayrı-ayrı elementlərdən sərf-nəzər edilə bilməsi üzündən mütləq «xalis hala» gətirilə bilməyən ciddi proseslər şəklində həyata keçirilir. Real eksperimentin gedişində müşahidə olunan effektlər bir qayda olaraq cihazın göstərişləri ilə bağlı olur. Fikri eksperimentdə isə prosesin inkişafı elə tərzdə cərəyan edir ki, sanki onlar tədqiqat obyektinin tədqiqatçını maraqlandırmayan şəraitlə qarşılıqlı təsirinin konkret formasından asılı olmur. Bu isə ancaq ona görə mümkün olur ki, fikri eksperimenti müşayiət edən fəaliyyət real obyektlər üzərində deyil, onların xəyali obrazları üzərində aparılır.

Fikri eksperimentin mühüm xüsusiyyətlərindən biri də budur ki, onu gerçəklikdə heç də həmişə həyata keçirmək mümkün olmur. Bunun səbəbi fikri eksperimentin həyata keçirilməsinə imkan verməyən bütün əlavə proseslərin tamamilə aradan qaldırılmasının qeyri-mümkünlüyüdür. Halbuki ortaya çıxan bütün xarici təsirləri tam aradan qaldırmağın mümkün olmadığı real eksperimentdən fərqli olaraq fikri eksperimentdə abstraktlaşdırma və ideallaşdırma üçün qeyri-məhdud imkanlar yaranır. Bu baxımdan professor V.S.Tyuxtinin belə bir fikri ilə razılaşmaq olmaz ki, qeyri-məhdud obyektin məzmunu üzərində əməliyyat aparmaqda “ideal subyektiv fəaliyyət planı praktiki fəaliyyətlə müqayisədə daha böyük imkanlara malikdir” [7, s.5]. Yalnız abstraksiyanın və ideallaşdırmanın köməkliyi ilə idrak obyektini bütün əlavə təsirlərdən təcrid edərək “xalis” halda öyrənmək mümkündür. Fikri eksperimentin gedişində obyekt üçün mühüm olan invariant xarakteristikaları və qanunauyğun münasibətləri də seçib ayırmaq mümkündür.

İdeallaşdırma fikri eksperimentin xüsusi növü olub, aşağıdakı mərhələlərdən təşkil olunur:

1) Öyrənilən obyektin şəraitini dəyişməklə biz onun təsirini tədricən azaldırıq.

2) Bu halda məlum olur ki, öyrənilən obyektin də bəzi xassələri müvafiq dəyişikliyə uğrayır.

3) Şəraitin öyrənilən cismə təsirinin aradan qaldırıldığını güman etməklə biz hüdud halına və bununla da ideallaşdırılmış obyektə keçirik.

Yuxarıda şərh etdiyimiz ümumi müddəaları araşdırmaq məqsədilə bir misala müraciət edək.

Məlumdur ki, bərk cisimlərin istilik keçirməsi onlarda az və ya çox dərəcədə baş verən deformasiya prosesi və bir sıra digər effektlərlə müşayiət olunur. Əgər istilikkeçirmə zamanı bizi ancaq deformasiya maraqlandırırsa, bu halda müəyyən sadələşməyə yol verməklə biz tədqiqat çərçivəsini yalnız bu cəhətlə məhdudlaşdıra bilərik. Eksperimentin gedişində tədqiqatçı obyektin bəzi xassələrini dəyişdirdiyi kimi, onlardan bəzilərini də dəyişməz saxlayır. O, daha sonra dəyişməz qalan bu qeyri-mühüm aspektlərdən sərf-nəzər edərək təcridedici abstraksiya vasitəsilə bütün diqqəti məhz onu maraqlandıran xassələrdən olan asılılıq üzərinə yönəldir.

İstilikkeçirmə hadisəsində deformasiya proseslərinə müəyyən münasibətlər daxilində qeyri-mühüm amil kimi baxaraq, onu nəzərə almamaq olar (bu halda deformasiya əslində o dərəcədə kiçik olmalıdır ki, onun istilik proseslərinə təsirindən sərf-nəzər etmək mümkün olsun). Baxdığımız halda tədqiqatçı öz hesablamalarında həqiqətdə deformasiyaya qabil olan real bərk cismi ideal obyektlə – “deformasiya

olunmayan "mütləq bərk cisimlə" əvəz etmişdir. Nəzərə almaq lazımdır ki, tədqiqatçı ideal obyekt yaratmaqla real obyektin bəzi xassələrdən yalnız sərfnəzər etməklə kifayətlənməmiş, həm də ona gerçəklikdə heç cür reallaşa bilməyən xassələr (məsələn, mütləq bərklik, ifrat axıcılıq və s.) isnad vermişdir. Burada tədqiqatçının abstraksiya fəaliyyəti onun yaradıcı fantaziyasına qovuşaraq gerçəklikdə mövcud olmayan və reallaşa bilməyən obyektin quraşdırılmasına səbəb olur. Sonlu elastikliyə malik real cismin fikrən «mütləq bərk cisim"lə əvəz olunması idraki-qnoseoloji baxımdan xeyli səmərəlidir. Əvvəla, ona görə ki, bu üsul hesablamanı xeyli sadələşdirir, ikincisi, ona görə ki, real obyektin, onda baş verən istilik axınlarının hərəkətini faktiki müəyyən edən xassələrin düzgün nəzərə alındığı təqdirdə tədqiqatın gedişində qarşıya çıxan bir sıra sualları düzgün cavablandırmağa imkan verir. Bu zaman hesablamalarda buraxılan xətalar əslində o dərəcədə əhəmiyyətsizdir ki, onları praktiki nəzərə almamaq da mümkün olur.

Eksperimentlə bağlı məsələlərdən biri də idrakda cihazların rolu məsələsidir. Məlumdur ki, obyektlərin xassələri onların başqa obyektlərlə, xüsusilə idrak vasitəsi kimi istifadə olunan cihazlarla qarşılıqlı təsiri zamanı aşkara çıxır. Həm də kvant mexanikasının öyrəndiyi mikroobyektlərin bu və ya başqa (məsələn, korpuskulyar, yaxud dalğa) xassəsinin aşkara çıxarılması konkret eksperiment şəraitindən və istifadə olunan cihazın növündən asılıdır. İnsanın cihaz vasitəsilə həyata keçirdiyi praktiki fəaliyyətin əsas formalarından olan eksperimentdə tədqiqatçı cihaz kimi istifadə etdiyi maddi obyektin tədqiqat obyekti kimi seçdiyi başqa növ maddi obyektlərlə qarşılıqlı təsiri ilə iş görür. Bu halda tədqiqat obyektinə müəyyən təsir göstərən cihazın özü də idrak obyektinin təsirinə məruz qalır. Cihazla idrak obyekti arasında baş verən belə təsir olmadan obyekt haqqında heç bir məlumat almaq mümkün olmazdı.

Klassik fizikada cihazların öyrənilən mikroobyektlərə təsiri cüzi olduğundan onu nəzərə almamaq, lazım gəldikdə isə onu prinsipcə hesablayıb təyin etmək olurdu. Kvant mexanikasında isə vəziyyət kökündən dəyişir. Burada cihaz kvant obyektlərinə sərf-nəzər edilməsi mümkün olmayan "həyəcanlandırıcı təsir göstərərək onların halını əsaslı surətdə dəyişdirir. Buna görə də müasir fizikada cihazla mikroobyektin qarşılıqlı təsiri hökmən nəzərə alınmalıdır. Bu münasibətlə N.Bor yazmışdır: "Klassik fizikada obyektlə cihaz arasındakı qarşılıqlı təsiri nəzərə almamaq, yaxud lazım gəldikdə onu ödəmək mümkün olduğu halda, kvant fizikasında bu qarşılıqlı təsir hadisələrin ayrılmaz hissəsini təşkil edir" [8, s.143]. Cihazla obyekt arasında ölçmənin təbiətindən irəli gələn qarşılıqlı təsir ölçmə zamanı alınan informasiyada əks olunduğundan, onu nəzərdən qaçırmaq olmaz. Kvant mexanikasında cihaz mikroobyektlərin vəziyyətinə təsir edərək onun haqqında əldə edə biləcəyimiz bilikləri bir qədər kobudlaşdıraraq, ona müəyyən "əlavələr" edir. Pozitivist fiziklər və filosoflar bu faktın mahiyyətini saxtalaşdıraraq mikroob-yektlərin dərki prosesində eksperimentin rolunu təhrif edir və ona xüsusi "yaradıcılıq" qüvvəsi isnad verirdilər. Bununla da onlar kvant proseslərinin cihaz vasitəsilə aşkara çıxarılan spesifikasını mikroobyektlərin öz təbiətləri ilə deyil, ancaq ölçmə aktının və cihazın xüsusiyyətləri ilə bağlayaraq, kvant hadisələri haqqında biliklərimizdə obyektiv məzmun olduğunu inkar edirlər. Fəlsəfədə mikroobyektlərin öyrənilməsi məqsədilə tətbiq olunan cihazların idraki rolunu təhrif edən "cihaz idealizmi" adlanan istiqamət bu əsasda meydana çıxmışdır. Vaxtı ilə həmin

mövqedən çıxış edən N.Bor, V.Heyzenberq və b. cihazın (müşahidəçinin) tədqiq olunan mikroobyektə təsirinin mütləq nəzərə alınmalı olduğuna əsaslanaraq, mikroobyekti və makrocihazı ayrılmaz koordinasiyada, rabitədə götürür və bildirirlər ki, bu koordinasiyanın mərkəzi üzvü olmaqla cihazlar elmi idrakda əsas rol oynayır və onlar mikRoobyektlərin vəziyyətini “yaradırlar”. Onlar daha sonra müşahidə zamanı tətbiq olunan cihazı subyektlə, müşahidəçi ilə əvəz edərək bildirirlər ki, ümumiyyətlə, mikroaləm obyektləri və prosesləri müşahidəçidən asılıdır, müşahidə zamanı onun tərəfindən yaradılır.

Daşıdığı məqsəddən, tədqiqat predmetindən, istifadə olunan eksperimental texnikanın xarakterindən və bir sıra digər amillərdən asılı olaraq hazırda elmi idrakda tətbiq olunan eksperimentləri tədqiqat, yoxlama və nümayiş eksperimentləri üzrə üç əsas qrupa ayırmaq olar.

Tədqiqat eksperimentləri müəyyən nəzəri mülahizələrə istinad etmək əsasında obyektin əvvəllər məlum olmayan xassələrini aşkar etmək məqsədilə aparılır. Bu qəbildən olan eksperimentlərə ən yaxşı misal Rezerfordun alfa hissəciklərin qızıl folqadan səpilməsi hadisəsindən istifadə edərək atomun planetar modelini müəyyən etdiyi eksperimenti göstərmək olar. Alfa hissəciklərin səpilmə xarakterinin təhlili göstərdi ki, atomun kütləsi nüvə adlanan çox kiçik həcmdə toplanmış, elektronlar isə nüvə ətrafında onun radiusuna nisbətən çox böyük məsafələrdə hərəkət edirlər.

Yoxlama eksperimentinə adətən hər hansı bir nəzəri mülahizəni yoxlamağa ehtiyac olduğu hallarda müraciət edilir. Müasir təbiət elmləri, xüsusilə fizika yoxlama eksperimentləri ilə zəngindir. Bir çox elementar hissəciklərin, məsələn, pozitronun (P.Dirak), neytrinonun (Pauli) omeqa-minus-hiperonun (Yukava) və s. varlığı, necə deyərlər, mütəxəssislərin qələmində kəşf olunmuş, onlar bir müddət hipotetik hissəciklər sayılmış və yalnız sonralar eksperimental surətdə aşkar edilmiş, bununla da onların reallığı və irəlicədən söylənilmiş nəzəri mülahizələrin həqiqiliyi təsdiq olunmuşdur. Belə yoxlama eksperimentləri xüsusilə ona görə əlverişlidir ki, onlar eyni zamanda həqiqətin meyarı rolunda da çıxış edirlər.

Hər hansı bir hadisəni tədris məqsədilə nümayiş etdirmək üçün əyani eksperimentdən istifadə olunur. Bu qəbildən olan eksperimentlər, adətən, orta və ali məktəb laboratoriyalarında nümayiş etdirilir.

Tədqiqat obyektinin xarakterinə görə eksperimentin fiziki, kimyəvi, bioloji, psixoloji və sosial növləri bir-birindən fərqləndirilir. Tədqiqat obyekti bilavasitə real cisim və ya proseslər olan eksperiment müstəqim eksperiment, cismin əvəzinə onun modelindən istifadə edildiyi eksperiment isə model eksperimenti adlanır. Belə modellər olaraq orijinal qurğuların surəti, maketi götürülə bilər.

Tədqiqatın metod və nəticələrinə görə eksperimentləri keyfiyyət və kəmiyyət növlərinə ayırmaq olar. Keyfiyyət eksperimentləri, adətən, tədqiqat, yoxlama xarakteri daşımaqla aralarındakı kəmiyyət münasibətləri məlum olan bir sıra amillərin tədqiq olunan prosesə təsirini aydınlaşdırır.

Kəmiyyət eksperimentləri isə öyrənilən obyektin hərəkətinə və ya prosesin gedişinə təsir göstərən mühüm amillərin dəqiq ölçülməsini təmin etmək məqsədilə aparılır. Belə eksperimentlərin həyata keçirilməsi külli miqdarda ölçən və qeydə alan cihazlardan, mürəkkəb hesablamalardan istifadə olunmasını tələb edir.

Hazırda eksperimentdən təkcə təbiətin deyil, həmçinin ictimai həyatın da öyrənilməsində istifadə olunur. Nisbətən kiçik kollektivlərdə ictimai hadisələri öy-

rənmək məqsədilə aparılan sosial eksperimentlər hazırda tədqiqatçıların nəzərini xüsusilə cəlb edir. Sosial eksperimentlərin köməyi ilə müəyyən ictimai qanunauyğunluqlar, onların təsir mexanizmi, nəticələri aşkar və tədqiq edilir. Sosial eksperimentdən, habelə bu və ya digər nəzəri mülahizəni və fərziyyəni yoxlamaq məqsədilə də istifadə olunur. Sosial eksperimentlərin köməyi ilə cəmiyyətə elmi rəhbərliyin müxtəlif formaları, əmək məhsuldarlığının artırılması yolları və vasitələri, cəmiyyətdə müxtəlif ictimai qanunauyğunluqların təsiri və s. tədqiq olunur.

Eksperimentin elmi idrak üçün mühüm əhəmiyyətini qeyd etməklə yanaşı onun malik olduğu müəyyən məhdudluğu da nəzərdən qaçırmaq olmaz. Bacarıqla hazırlanmış və dəqiq həyata keçirilmiş elmi eksperiment tədqiqatçının nəzəri mülahizələrini ya təsdiq, ya da təkzib edə bilər və buna görə də o, ictimai praktikanın bir növü olmaq etibarilə həqiqətin meyarı rolunda çıxış edə bilər. Lakin nəzərə almaq lazımdır ki, hər bir eksperiment, xüsusilə laboratoriya eksperimentləri öyrənilən hadisəni, onun üçün qeyri-adi olan bir şəraitdə müəyyən dəyişikliyə məruz qoyur.

***Rəyçi: prof. F.İsmayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. Быков В. Методы науки. Наука, М., 1974.
2. Быков В. Научный эксперимент и экспериментальные методы. /Некоторые проблемы методологии научного исследования. М., 1968.
3. Бутлеров А. Сочинение том 3., 1958.
4. Вавилов С. Собрание сочинений. Т.3, М.: АН СССР, 1956.
5. Жданов Г., Нелипа Н. Особенности эксперимента и теории в современной физике / Диалектика в науках о неживой природе. М.: Мысль, 1964.
6. Горский Д. Вопросы абстракции и образование понятии. М., 1961.
7. Тюхтин В. О природе образа. М.: Мысль, 1963.
8. Бор Н. Атомная физика и человеческие познание. М: ИЛ, 1961.
9. Məmmədov Ə., Zahidov T. Dialektik idrak və eksperimental metod. Bakı: Azərnəşr, 1992.

**А.Мамедов,**
**Ф.Мамедов**

**Эксперимент: логико-гносеологические аспекты и бремя познания**

**Резюме**

Статья посвящена сути, когнитивной нагрузки, методологическим функциям и логико-гносеологическим аспектам эксперимента, который является одним из научно-исследовательских методов.

**A.Mammadov,**
**F.Mammadov**

**Experiment: logical-epistemological aspects and the burden of knowledge**

**Summary**

The article is devoted essentially cognitive load, methodological functions and logical-epistemological aspects of the experiment, which is one of the research methods.



# CƏMİYYƏTİN MƏDƏNİ İNKİŞAFINA ƏXLAQİ-MƏNƏVİ DƏYƏRLƏRİN TƏSİRİ

**Afiq Əliyev,**
***Lənkəran Dövlət Universitetinin pedaqogika və psixologiya kafedrasının müdiri, pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *cəmiyyət, inkişaf, dəyər, əxlaq, mənəviyyat.*
***Ключевые слова:*** *общество, развитие, ценность, мораль, культура.*
***Key words:*** *public, development, value, morality, spirituality.*

Qloballaşan dünyada təlim-tərbiyə işinin milli zəmin üzərində qurulması, xalqımızın əxlaqi-mənəvi dəyərlərindən istifadə edilməsi, onların öyrənilməsi gənclərimizin milli ruhda tərbiyələnməsində mühüm rol oynayır. Təbiətin hər bir xalqa bəxş etdiyi ən qiymətli xəzinə onun milli-mənəvi dəyərləridir. Bu dəyərlərin hər cür yad təsirlərdən qorunaraq saxlanması, onun qayğılı münasibət sferasında inkişaf etdirilməsi isə, hər şeydən əvvəl, cəmiyyətin əsas özəyini təşkil edən insanların əxlaqi-mənəvi dəyərlərə malik olma səviyyəsindən asılıdır. Ona görə də milli-mənəvi dəyərlər gənc nəslə daha da zənginləşdirilmiş halda ötürülməlidir. Mənəvi dəyərlər zənginləşdirilmədən mövcud cəmiyyətin mədəni inkişaf səviyyəsinə uyğun gələ bilməz. Çünki insanların mənəviyyatı, əxlaq normaları və baxışları ilə bağlı olan milli-mənəvi dəyərlərin əsas yaradıcısı xalqdır.

Müstəqillik dövründə yetişən gənc nəslin təlim-tərbiyəsində mənəvi, əxlaqi dəyərlər və onların öyrənilməsi xüsusi əhəmiyyət kəsb etməkdədir.

Elmi-texniki tərəqqinin sürətli inkişafı real həyatda yüksək nailiyyətlərə, mütərəqqi dəyişikliklərə yol açsa da, bu prosesin cəmiyyətin mədəni inkişafına, əxlaqi-mənəvi dəyərlərə müəyyən təhlükə meyilləri də özünü qabarıq göstərir. Belə bir zamanda gənc nəslin tərbiyəsinin milli kontekstdə formalaşması sahəsində soykökə qayıdışın, milli özünüdərkin, əxlaqi-mənəvi dəyərlərin böyük əhəmiyyəti vardır. Xalqın tarixən formalaşmış yüksək əxlaqi-mənəvi dəyərlərini qoruyaraq bütövlükdə cəmiyyətin mədəni inkişafına istiqamətləndirmək isə həm dövlətin yeritdiyi siyasətlə, həm də sosial sferanın irəli sürdüyü mədəni-intellektual və elmi-pedaqoji prinsiplərlə tənzim olunur.

Ətraf aləmə zahiri münasibəti və özünəməxsus daxili xüsusiyyətləri ilə səciyyələnən insanın mənəviyyatının əsası irsi amillərlə şərtlənsə də, əsasən, sosial-mənəvi mühitin təsiri ilə formalaşır. Burada insanın böyüdüyü ailə mühiti, inkişaf etdiyi təbii və sosial mühit, yaşadığı ictimai-tarixi dövr, ümumilikdə cəmiyyətin mədəni-mənəvi həyatı mühüm rol oynayır.

İnsanın formalaşdığı ictimai-tarixi mühit mövcud əxlaqi-mənəvi və milli-mədəni dəyərlər sistemi, sosial-hüquqi normalar, təsərrüfat-iqtisadi münasibətlər, ailə-məişət münasibətləri, təhsil-tərbiyə sistemi və bu kimi digər mühüm elementlərin

sintezindən ibarətdir. Bütün bu elementlərin vəhdətinin daşıyıcısı olan insanlar ayrı-ayrılıqda ahəngdar inkişaf etmiş şəxsiyyətlər kimi cəmiyyətin mədəni inkişafında aparıcı qüvvə hesab olunur.

Bu gün xeyli miqdarda idarə olunan və idarə olunmayan informasiya kanallarının, xüsusən televiziyanın, mətbuatın, müxtəlif internet saytlarının əxlaqa və ümumən milli mənəviyyata yad elementlərin təsiri altına düşdüyü bir vaxtda milli-mənəvi mühitin qorunması və cəmiyyətin mədəni inkişafı problemi olduqca aktualdır. Burada milli özünüdərk prosesi ilə əxlaqi-mənəvi dəyərlərin vəhdəti güclü təsirə malik hərəkətverici qüvvə kimi özünü göstərir.

Hazırda Azərbaycanın Avropa məkanına daxil olması, dünya ölkələrinə inteqrasiyası bütün sahələrdə olduğu kimi, iqtisadi-siyasi, sosial-mədəni sferalara da qlobal miqyasda təsir göstərmişdir. Lakin bu təsir əxlaqi, milli-mənəvi sahəyə də təsirsiz qalmamışdır. Azərbaycan xarici ölkələrlə sıx əlaqədədir. Xarici jurnallar, televiziya kanalları və digər informasiya vasitələri ilə Avropanın, Amerikanın və bütün planetin mənəviyyat sahəsində olan problemlər, nöqsanlar digər ölkələr kimi, Azərbaycanın da milli məkanına daxil olur. Əlbəttə, insanlar milli şüur səviyyəsinə malikdirsə, mənəviyyatca yetkindirsə, möhkəm iradə və xarakter əlamətlərinə yiyələnibsə, onların kənar təsirlərə qarşı daxili müqavimət qüvvəsi böyük olacaqdır. Bununla yanaşı milli varlığı, milli mənafeyi qoruyub saxlamaq funksiyasını dövlət öz üzərinə götürür.

Gənc nəslin əxlaqi-mənəvi tərbiyəsi işi ümumi tərbiyə prosesinin əsas komponenti, onun tərkib hissəsidir. Ümumi tərbiyənin məqsədi hərtərəfli inkişaf etmiş həqiqi insan yetişdirməkdir. Hərtərəfli inkişaf etmiş şəxsiyyət yetişdirmək tələbi Azərbaycan Respublikası Təhsil Qanununun 4-cü maddəsində aydın şəkildə öz əksini tapmışdır:

- Azərbaycan dövləti qarşısında öz məsuliyyətini dərk edən, xalqının milli ənənələrinə və demokratiya prinsiplərinə, insan hüquqları və azadlıqlarına hörmət edən, vətənpərvərlik və azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirmək;
- Milli-mədəni və ümumbəşəri dəyərləri qoruyan və inkişaf etdirən, geniş dünyagörüşünə malik olan, təşəbbüsləri və yenilikləri qiymətləndirməyi bacaran, nəzəri və praktiki biliklərə yiyələnən, müasir təfəkkürlü və rəqabət qabiliyyətli mütəxəssis-kadrlar hazırlamaq [2, 15].

Cəmiyyətin mədəni inkişafını, gələcək tərəqqisini gənc nəslin mükəmməl təhsil almasında görən ümummilli lider Heydər Əliyev deyirdi: "Cəmiyyətin gələcək tərəqqisi bir çox cəhətdən indi gənclərimizə nəyi və necə öyrətməyimizdən asılı olacaqdır. Əlbəttə, bu da təhsil sistemimizin qabaqcıl dünya dövlətlərinin təhsil sisteminə inteqrasiyası, təhsilin modernləşdirilməsi yolu ilə həyata keçirilə bilər. Müstəqil dövlətimizi möhkəmləndirmək üçün müasir gəncliyə elmi-texniki biliklər vermək, praktik vərdişlər mənimsətmək bacarıqları ilə yanaşı, milli-mənəvi dəyərlərə malik olmaq, milli xüsusiyyətlərinə hörmətlə yanaşmaq kimi hislər də aşılamaq lazımdır... Gənclərimiz milli ruhda tərbiyə olunmalıdır, milli-mənəvi dəyərlərimiz əsasında tərbiyələnməlidir, tariximizi, dilimizi, milli ənənələrimizi, milli dəyərlərimizi yaxşı bilməlidir. Mənəviyyat olmayan yerdə heç bir şey ola bilməz... Bu gün mənəvi tərbiyə, bəlkə də, keçmiş illərdən daha çox lazımdır" [6].

Dünya xalqları arasında milli-mənəvi dəyərləri ilə tanınan Azərbaycan xalqı özünəməxsus bəşəri ideyaları, adət-ənənələri, milli xüsusiyyətləri ilə özünəməxsus yer tutur. Qədim tarixi köklərə malik

Azərbaycan xalqı əsrlər boyu özünəməxsus olan maddi və mənəvi xəzinəsini qoruyub saxlaya bilmişdir.

Xalqın mövcudluğunun əsas göstəricilərindən olan əxlaqi-mənəvi dəyərlər onun ən qiymətli sərvətidir. Hər bir xalq milli-mənəvi dəyərlər sisteminə malikdir. Bu milli-mənəvi dəyərlər bizim tariximiz, dilimiz, dinimiz, adət-ənənələrimiz, mentalitetimiz, milli xüsusiyyətlərimiz, mədəniyyətimiz, ədəbiyyat və incəsənətimizdir.

İstər təhsil sistemi, istər gənclərin mədəni-mənəvi həyatı elə bir mühit yaratmalıdır ki, bu mühitin xarici təsirlərə qarşı reaksiya qabiliyyəti güclü olsun. Yəni insanla xarici təsir arasında qoruyucu bir sahə olmalıdır. İnsanla mədəni-mənəvi mühit arasında qoruyucu sahədə boşluqlar olduqda yad təsirlər yaddaşa təsir edir. Bu zaman dünyagörüşü aşağı səviyyədə olanlar, zəif iradəlilər, əxlaqi-mənəvi dəyərlərdən uzaq olanlar asanlıqla bu təsirlərə boyun əyirlər.

Bununla əlaqədar olaraq gənc nəslin əxlaqi-mənəvi inkişafının, milli özünüdərk hissinin səviyyəsini, iradi qabiliyyətlərini yüksəltmək istiqamətində aparılan işlər sistemli şəkildə yerinə yetirilməlidir.

Bu zaman ənənəyə sadiqlik, yüksək mənəvi dəyərlərimizi, milli mənliyimizi qorumaq prinsipi diqqət mərkəzində saxlanmalıdır. Çünki özünütəsdiq milli-tarixi köklərə arxalanır. Bir sıra mətbuat orqanlarında heç bir ölçü gözləmədən dərc olunan deviant davranış mövzularda yazılar, bəzi televiziya kanallarının nümayiş etdirdiyi gənclərin psixikasını pozan etikadan kənar, reallığa uyğun gəlməyən filmlər uşaqların, yeniyetmə və gənclərin mənəviyyatına mənfi təsir edir. Bununla əlaqədar hamımızın ümumi işi  bütün istiqamətlərdə mədəni-mənəvi mühitin saflaşdırılmasına nail olmaqdır. Bu işdə təhsil işçilərinin üzərinə böyük vəzifə düşür. Burada müəllimlərin özlərinin əxlaqi-mənəvi kamillik, intellektual hazırlıq səviyyəsi, ənənəvilik və müasirliyin vəhdətinə münasibət kriteriyası mühüm əhəmiyyət kəsb edir. Cəmiyyət dəyişdikcə, yeni yetişən gənc kadrların tərbiyə sistemi, onlara verilən biliklərin məzmununa münasibət də dəyişməlidir.

Hər bir cəmiyyətdə tərbiyə onun başlıca vəzifəsi hesab edilir. İnsan amilinin əsas yer tutduğu müasir dövrdə gənc nəslin dünyagörüşünə, yüksək əxlaqi keyfiyyətlərə malik olan, sosial cəhətdən fəal olan, mənəvi zənginliyi, əxlaqi saflığı, fiziki kamilliyi və fiziki mədəniyyəti özündə birləşdirən şəxsiyyət kimi tərbiyə olunması bir vəzifə kimi qarşıda durur.

İnsanların öz nəslini artırıb inkişaf etdirməsi, tərbiyə edib formalaşdırması cəmiyyətin mədəni inkişafı üçün zəruridir. Yaşlı insanlar həm öz nəsillərini, həm də ümumilikdə cəmiyyəti yaşatmaq və inkişaf etdirmək üçün uşaqları ictimai həyata hazırlamalı, onları tərbiyə etməlidirlər. Bu isə onu göstərir ki, tərbiyə insanların ictimai əmək fəaliyyəti prosesində yaranmış, bəşəriyyətin praktik tələbatından asılı olmuş və cəmiyyətin yarandığı ilk vaxtlardan meydana gələrək onun inkişafına təsir göstərən mühüm bir vasitə olmuşdur.

Zəhmətkeş xalq tərbiyə sahəsində bir sıra adət-ənənələr, qayda-qanunlar yaratmışdır. Heç bir yerə yazılmamış olan bu adət-ənənələrin, qayda və qanunların əhatə dairəsi olduqca geniş olub, insanın öz-özünə, başqalarına, vətənə, təbiət və cəmiyyət hadisələrinə münasibətinə, bununla yanaşı, təlim-tərbiyənin mahiyyətinə, məzmununa, məqsədinə, forma və üsullarına aiddir. Bütün bu məsələlər barəsində zəhmətkeş insanların ifadə etdiyi dəyərli fikirlər tarix boyu maarifpərvər və yaradıcı şəxslərin inkişaf edib formalaşmasına qüvvətli təsir göstərmişdir.

Adət-ənənələr əsasında dayanan əxlaqi-mənəvi dəyərlər xalqın ülvi hislə-

rinin parlaq ifadəsidir. Bəşəriyyətin yüz illər boyu əldə etdiyi, zənginləşdirdiyi və gələcək nəsillərə ötürdüyü əxlaqi-mənəvi dəyərlər şəxsiyyətin formalaşmasında mühüm amil kimi çıxış edir. Bununla yanaşı, insanın sosial-mənəvi mühitdə mövqeyi, intellektual səviyyəsi, daxili aləmi, həyat tərzi, mentaliteti onun şəxsiyyət kimi formalaşmasını təmin edir.

Əxlaqi-mənəvi keyfiyyətlər insanların fəaliyyəti ilə sıx bağlıdır. Nəzərə almaq lazımdır ki, ayrı-ayrı kollektivlərdə yaxşı tərbiyə görmüş, yüksək əxlaqi-mənəvi keyfiyyətlərə malik olan insanların olması yerinə yetirilən işin effektli olmasına təkan verdiyi kimi, ümumilikdə cəmiyyətdə də belə insanların olması cəmiyyətin mədəni inkişafının əsas hərəkətverici qüvvəsi kimi çıxış edir. Belə insanlar ayrı-ayrı adamlara, kollektivə və cəmiyyətə yüksək dərəcədə fayda verdikləri kimi, özləri də cəmiyyətdən daha səmərəli şəkildə faydalanırlar.

İnsanın əxlaqi-mənəvi keyfiyyətləri həm sosial mühitin təsiri ilə, həm tərbiyənin, pedaqoji amillərin təsiri ilə, həm də onun şəxsi fəallığı və iradi keyfiyyətləri ilə sıx bağlıdır. İnsan cəmiyyətdə yaşayır, cəmiyyət isə insan əxlaqına, onun mənəvi simasına, əxlaqa zidd hərəkətlərinə etinasız yanaşa bilməz. Çünki əxlaqi keyfiyyətlər nəinki tərbiyə prinsipi, həm də bəşəri dəyərlərdir.

Ailə mühitindən başlayaraq təhsilin müxtəlif pillələrində və səviyyələrində davam edən ümumi tərbiyə prosesi şəxsiyyətin formalaşmasında əhəmiyyətli olan milli, əxlaqi-mənəvi münasibətlər zəminində qurulur. Əlbəttə bu münasibətlər insanın həyat və fəaliyyətinin müxtəlif sahələrinə nüfuz edir, onun şəxsi keyfiyyətlərinə, başqa insanlarla əlaqəsinə, özünü qiymətləndirməsinə təsir göstərir. Gənc nəslin yiyələndiyi mədəni-mənəvi münasibətlər onlarda yüksək əxlaqi prinsiplərlə fəaliyyət göstərməyə, kollektivçilik və birgə yaşayış qaydalarına əməl etməyə daxili tələbat oyadır. Y.A.Komenskinin təbirincə desək, biz insanın tərbiyəsi ilə məşğul oluruqsa, bu sahədə uğur qazanmaq istəyiriksə, insanın mahiyyətini düzgün öyrənməliyik. İnsanlar bir-birindən öz qabiliyyətlərinə görə nə qədər fərqlənsələr də, onlara eyni üzvlərə malik bəşəri-təbiət xasdır [8, 91].

Müasir dövrdə Şərq xalqlarının, o cümlədən İslam dünyasının tarixən yaratdığı adət-ənənələrin, milli-mənəvi dəyərlərin öyrənilməsi imkanlarından səmərəli istifadə edilməsi aktual əhəmiyyət kəsb edir.

Milli-mənəvi tərbiyənin imkanları dedikdə, buraya şəxsiyyətin formalaşmasına təsir göstərən dəyərlər şamil edilir. Milli-mənəvi tərbiyə pedaqoji prosesdə həyata keçirilən müxtəlif növlü fəaliyyətin stimullaşdırılması və təşkilini nəzərdə tutur. O, şəxsiyyətdə praktik bacarıqlar, sosial və mənəvi münasibətlər formalaşdırır.

Əxlaqi-mənəvi dəyərlər ictimai həyata və onun bütün təzahürlərinə qida verən tükənməz, canlı bir mənbədir. Müdriklik, gözəllik, insan mükəmməlliyi, bir sözlə, cəmiyyətin yüksək idealları məhz bu mənbədən təşəkkül tapmışdır. Cəmiyyətimizin riayət etdiyi və hazırda əsas götürdüyü başlıca əxlaqi prinsiplər də öz başlanğıcını bu mənbədən götürmüşdür.

Əxlaqi-mənəvi dəyərlər üçün ədalətsizliyə, haqsızlığa, zülmə və özbaşınalığa dərin nifrət xasdır. Xalq yaradıcılığı nümunələrində həmişə azad, həqiqi məhəbbət, azadlıq uğrunda mübarizə tərənnüm edilmişdir. Bu nümunələrdə təsvir edilən qəhrəmanlar, adətən, mənəvi eybəcərliklərə qarşı mübarizə apararaq, qeyri-əxlaqi çətinlikləri aradan qaldıraraq, son nəticədə qarşıya qoyulmuş məqsədə çatır və qələbə çalırlar. Bu xüsusiyyət bütün xalqların xalq yaradıcılığı incilərinə xasdır.

Xalq yaradıcılığının Azərbaycan etik

fikir tarixi üçün böyük əhəmiyyət kəsb etdiyini vurğulayan məşhur alim Mirzə Kazım bəyin fikrincə, qədim əfsanələr və rəvayətlər xalqların ədəbiyyatında və tarixində sonuncu yerdə durmur. Keçmiş zamanlar haqqındakı hekayətlər onları hadisələr ünsürü və faktlar şəklində tarixi məlumatlar kimi əks etdirir, tarix onların tez-tez insan həyatının qaranlıq dövrləri haqqındakı mühüm sirlərinin açılmasına cəlb edir, ədəbiyyat onlardan zəngin xəzinə kimi, özünün zinətlənməsi üçün qiymətli material əxz edir. Əfsanəsiz xalq, rəvayətsiz ölkə yoxdur, köçərilərdə onlar nəsildən-nəslə şifahi hekayətlərdə keçir, yarımmədənilərdə onların inamlarının əsaslarını onların yazılarının, ədəbiyyat və tarixlərinin əsas məzmunu təşkil edir, mədəni ölkələrdə isə onlar müqəddəs xalq təsəvvürü üçün zəngin mənbə rolu oynayır [4, 31].

Bir çox halda kiçik yaşlarından başlayaraq nağılları, dastanları, əfsanələri, dinləməyən, onları sevməyə alışmayan uşağın mənəvi varlığında böyük bir boşluq yaranır. Belə boşluqlar əhatəsində böyüyən uşaq mənsub olduğu xalqın gözəlliklərlə dolu zəngin mənəviyyat xəzinəsindən nəinki xəbərsiz qalır, həm də bütün bunlara etinasız, laqeyd münasibət göstərir.

Cəmiyyətin mədəni inkişafı probleminə ümummilli lider Heydər Əliyevin irəli sürdüyü konsepsiya baxımından yanaşsaq, qeyd edə bilərik ki, milli dəyərlərin, əxlaqi-mənəvi keyfiyyətlərin gənc nəslə çatdırılması və inkişaf etdirilməsi üçün aşağıda göstərilən cəhətlərə yüksək səviyyədə əməl edilməsi mühüm şərtdir:

- azərbaycançılıq;
- müstəqilliyin, milli dövlətçiliyin qorunması və ona məhəbbət;
- ana dilinin qorunması və onun təbliği;
- hüquqi dövlətin Əsas Qanunu, bayrağı, himni, gerbi və başqa atributlarına hörmət və onların qorunması;
- milli-mənəvi sərvətlərin qorunması və onlara qayğı;
- mədəniyyət abidələrinin qorunması və onlara qayğı;
- dini dəyərlərə hörmət və s.

Bu baxımdan İslam mənəvi dəyərlərinin gənc nəslə mənimsədilməsi çox önəmlidir. Mövcud şəraitin, milli adət-ənənələrin, təlim alanların yaşayış tərzinin, mənəvi səviyyəsinin nəzərə alınması böyüməkdə olan nəslin İslam mənəvi dəyərləri əsasında tərbiyəsinin səmərəliliyində mühüm şərtdir. İslam dəyərləri zəngin nəzəri bazaya malikdir. Bu, özünü müqəddəs "Qurani-Kərim"də, Məhəmməd Peyğəmbərin hədislərində daha aydın surətdə göstərir.

Hazırda respublikamızda gənclərlə bağlı strategiyalar, müxtəlif layihələr icra olunur. "2015-2025-ci illərdə Azər-baycan gənclərinin İnkişaf Strategiyası" bunlardan biridir. Strategiyanın məqsədi 2015-2025-ci illəri əhatə edən müddətdə Azərbaycan gəncliyinin potensialını müasir dövrün tələblərinə uyğun inkişaf etdirmək, həmin potensialdan Azərbaycan Respublikasının mənafeləri naminə istifadə etmək, yeni nəsildə fəal vətəndaşlıq mövqeyi formalaşdırmaqdır [9].

Strategiyada gənclərin ayrı-ayrı sosial qrupları münasibətdə hərtərəfli yanaşma formalaşdırmaq baxımından, bu qrupların statusunu və identifikasiya meyarlarını müəyyənləşdirmək zəruri hesab edilmişdir. Əsas hədəf kimi sağlamlıq imkanları məhdud və əlil olan, qaçqın və məcburi köçkün gənclərdən tutmuş ümumtəhsil məktəblərinin yuxarı siniflərinin və ilk peşə-ixtisas təhsili müəssisələrinin şagirdləri, orta ixtisas və ali təhsil müəssisələrinin tələbələri, gənc alimlər, hərbi xidmətdə, istehsal və digər xidmət sahələrində çalışan gənclərədək bütün sosial qrupları maraqlandıran kriteriyalar strategiyada konkret formada

əks olunub.

Cəmiyyətdən kənarda, tənha şəkildə insan kimi yaşamaq qeyri-mümkündür. Çünki insan yaradılışı etibarilə bir-birinə qarşılıqlı təsir göstərən sosial varlıqdır. Bu qarşılıqlı təsir prosesində əxlaq normalarına düzgün riayət edilməsi ümumilikdə cəmiyyətin inkişafı üçün zəruridir. Bu inkişafın mədəni formada təmin olunması üçün insanlar arasındakı qarşılıqlı münasibətlər əxlaqi-mənəvi müstəvidə qurulmalıdır.

Burada şəxsiyyət faktoru əsas götürülür. Başlıca cəhət kimi bir insanın başqa birinə hörmətlə yanaşmasının əxlaqi dəyər olduğu vurğulanmalıdır. Əxlaqi dəyərlərin çalarları insanın başqalarının fikir və düşüncələrini nəzərə alıb ona hörmətlə yanaşmasında, öz hərəkət və davranışına diqqət yetirməsində, digər insanlarla şəxsiyyət kriteriyasının meyarlarına uyğun münasibət qurmasında özünü qabarıq şəkildə büruzə verir. Bir insanın başqalarına pislik etməklə əxlaqi baxımdan ucalması qeyri-mümkündür. Eyni zamanda, müvafiq əxlaqi-mənəvi dəyərləri yüksək səviyyədə mənimsəmədən cəmiyyətin mədəni inkişafına nail olmaq mümkün deyil. Əxlaqi dəyərlər cəmiyyətdə nə qədər dərin kök salarsa, ona münasibət nə qədər şüurlu olarsa, cəmiyyət tərəfindən bir o qədər yüksək səviyyədə mənimsənilər.

Ümummilli lider Heydər Əliyev gənclərimizin əxlaqi-mənəvi dəyərlərə hörmət və məhəbbət ruhunda tərbiyə olunması üçün onların milli-mənəvi dəyərlərimiz əsasında tərbiyə edilməsini vacib hesab edirdi. O, insanın mənəvi cəhətdən zənginləşməsinə birinci dərəcəli əhəmiyyət verərək deyirdi ki, insanın çoxlu pulu, malı, dövləti ola bilər. Amma onun mənəviyyatı yoxdursa, onların da heç bir dəyəri, qiyməti yoxdur. Mənəvi, əxlaqi dəyərlər sırasında və mənəvi tərbiyə prosesində ana dilinin böyük əhəmiyyəti Heydər Əliyevin nəzəri irsində xüsusi əhəmiyyət kəsb etmişdir. Öz ədəbiyyatını, ana dilini yaxşı bilməyən gənc mənəvi cəhətdən tam zəngin ola bilməz. Ona görə də bir nömrəli vəzifə ondan ibarətdir ki, gənc nəsil öz xalqının milli-mənəvi dəyərlərini, keçmiş nəsillərin ideya-mənəvi irsini dərindən dərk etsin və onlardan sərbəst istifadə edə bilsin.

Heydər Əliyevin mənəvi, əxlaqi irsində Azərbaycan xalqının tarixi şəxsiyyətlərinə diqqət, onların həyatını, fəaliyyətini dərindən öyrənmək məsələsi önəmli yer tutur ki, gənclərin mənəvi tərbiyəsində bu nümunələr xüsusi əhəmiyyət kəsb edir. Bununla əlaqədar ulu öndər Azərbaycan Gənclərinin Birinci Ümumrespublika Forumundakı nitqində demişdir: “Xalqımızın tarixinin əsasını təşkil eləyən bütün mərhələlərdə, keçmiş əsrlərdə yüksək mənəviyyat olmuşdur. Keçmiş tariximizdən bizə qalan simaları bu gün dünyada məşhurlaşdıran və bizim üçün nümunə edən onların yüksək mənəviyyatıdır, yüksək amallarıdır...” [7].

Xalqların mədəni inkişafında, onların milli şüurunun formalaşmasında tarixən yaranmış əxlaqi-mənəvi dəyərlər mühüm rol oynayır. Çünki hər bir xalqın milli-mənəvi dəyərlərini şərtləndirən dil, din və adət-ənənə onun mənəvi aləminin formalaşmasına həlledici təsir göstərən amillərdəndir. Ölkəmizdə xalqımızın əxlaqi-mənəvi dəyərlərinin qorunması və mədəniyyətinin inkişaf etdirilməsi vətəndaşların milli birliyinin təmin olunmasına xidmət edir.

Müasir dövrdə hər bir xalqın əxlaqi-mənəvi dəyərlərini qoruyaraq gələcək nəsillərə ötürmək dövlətin üzərinə düşür. Müstəqillik qazandıqdan sonra Azərbaycan xalqı qədim tarixə və mədəniyyətə malik bir xalq kimi artıq bütün dünyada tanınmışdır.

Heydər Əliyev dünyanın mütərəqqi mənəvi dəyərlərindən istifadə edərək, gənc nəsli daha da sağlam əhvali-ruhiyyədə, saf

əxlaqi ruhda tərbiyələndirməyin dövlətimiz, xalqımız qarşısında ən zəruri, həlli qaçılmaz vəzifələr olduğunu tarixi bəyanatında da söyləmişdir: "Hər xalqın öz adət-ənənəsi var, öz milli-mənəvi və dini dəyərləri var. Biz öz milli-mənəvi dəyərlərimizlə, öz dini dəyərlərimizlə, adət-ənənələrimizlə fəxr edirik. Bizim xalqımız yüz illərlə, min illərlə adət-ənənələrimizi, milli-mənəvi dəyərlərimizi yaradıblar və bunlar indi bizim xalqımızın mənəviyyatını təşkil edən amillərdir" [3].

Ümumilikdə yaşadığımız cəmiyyətin dünyanın digər ölkələri arasında sivil və mədəni bir cəmiyyət kimi tanınmasında əxlaqi-mənəvi dəyərlərin formalaşmasının, ona qayğı və hörmətlə yanaşılmasının əhəmiyyətli dərəcədə təsiri vardır.

Təhsil müəssisələrində qarşıya qoyulan vəzifələrin uğurla həyata keçirilməsi isə orada çalışan müəllimlərin pedaqoji-psixoloji hazırlığı, onların işə yaradıcı münasibəti və pedaqoji ustalığı ilə sıx bağlıdır. Yalnız yüksək savada və intellektual potensiala malik olan, tədris etdiyi fənnin metodikasını, onun tərbiyəedici və inkişafetdirici xüsusiyyətlərini, müasir təlim metodlarını mükəmməl bilən, pedaqoji texnologiyalardan yaradıcılıqla istifadə etməyi bacaran müəllim bu işlərin öhdəsindən layiqincə gələ bilər. Çünki təlim-tərbiyə prosesində nəzəriyyə ilə praktikanın vəhdəti mühüm şərtdir.

***Rəyçi: prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat


1. Ağayev Ə. Seçilmiş pedaqoji əsərləri. 2 cilddə. I cild. Bakı: Mütərcim, 2011.
2. Azərbaycan Respublikasının Təhsil haqqında Qanunu. Bakı: Qanun, 2009.
3. Ədəbiyyat qəzeti, 2001, 13 avqust.
4. Əfəndiyev P. Azərbaycan şifahi xalq ədəbiyyatı. Bakı, Elm və təhsil, 2012
5. Əliyev P., Əhmədov H. Gənclərin milli-mənəvi dəyərlər əsasında tərbiyəsi. Bakı: Təhsil, 2006.
6. Heydər Əliyev. Müstəqil Azərbaycan Respublikası Gənclərinin Birinci Forumundakı nitqi // Azərbaycan qəzeti, 6 fevral, 1996.
7. Heydər Əliyev. Müstəqilliyimiz əbədidir Birinci kitab. Bakı: Azərnəşr, 1997.
8. Komenski Y. Böyük didaktika. Bakı: Elm və təhsil, 2012.
9. www.president.az


**А.Алиев**

**Роль формирования морально-нравственных ценностей в культурном развитии общества**

**Резюме**

В статье определяются особенности нравственно-моральные ценности, присущи азербайджанскому народу, влияющие на воспитание подрастающего поколения.

**A.Aliyev**

**The influence of moral values on the cultural development of society**

**Summary**

In this article influence of specific moral-spiritual values of Azerbaijan nation on manners of young generation has been definied. Moral-spiritual values that effect public's cultural improvement has been analyzed.



# ŞAGİRD KOLLEKTİVİNİN PSİXOLOJİ İQLİMİ-YENİYETMƏLƏRİN FORMALAŞMASINDA MÜHÜM AMİL KİMİ

**Arzu Məmmədova,**
***Bakı şəhəri, 18 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *şagird kollektivi, yeniyetmə, psixoloji iqlim, şəxsiyyət.*
***Ключевые слова:*** *коллектив учащихся, подросток, психологический климат, личность.*
***Key words:*** *student collective, teenager, psychological climate, personality.*

Məktəb şagirdin yeni dostlar tapdığı, öz imkan və tələbatları baxımından maraqlı işlə məşğul olduğu, ünsiyyətə girməyi öyrəndiyi, həmyaşıdları və böyüklərlə münasibət qurduğu yerdir. Məhz şagird kollektivində onun gələcəyini müəyyən edən həyat təcrübəsi əldə olunmağa başlayır. Bunun əsasında şagird şəxsiyyəti formalaşır, onun həyata və insanlara münasibətinin mürəkkəb sistemi müəyyən olunur. Buna görə də müəllim başa düşməlidir ki, kollektivdə əlverişli psixoloji iqlimin yaradılması şagirdin özünü sakit hiss etməsinə, dərs zamanı inamlı və rahat olmasına, şəxsi keyfiyyətlərinin aşkar olunmasına, çətin həyati situasiyalara adaptasiya olunmasına kömək edir.

Yeniyetməlik dövrü əxlaqi şüurun formalaşması dövrüdür. Məhz bu dövrdə yeniyetmə mənsub olduğu kollektivin üzvü kimi onun bir sıra xüsusiyyətlərini mənimsəyir, gələcək həyat və fəaliyyətində bu xüsusiyyətləri nümayiş etdirir. Ə.Ə.Əlizadənin qeyd etdiyi kimi, kollektivin əxlaq norma və qaydaları tədricən yeniyetmələrin özlərinin əxlaq, norma və qaydalarına çevrilir. Yeniyetmələr yaşlıların irad və cəza tədbirindən qorxmayaraq, özlərinin tələb və normalarını inamla müdafiə edirlər (1).

Şagirdin özünü məktəbdə necə hiss etməsi, hər şeydən əvvəl, kollektiv, qrup, sinif daxilindəki qarşılıqlı münasibətlərlə müəyyən olunur.

Mütəxəssislər təsdiq edir, eyni zamanda təcrübə də göstərir ki, sinifdəki emosional əmin-amanlıq yeniyetmənin şəxsiyyəti kimi formalaşmasında vacib amillərdən biridir. Buna görə də şagird kollektivlərində psixoloji iqlimin öyrənilməsi, fikrimizcə, son dərəcə aktualdır.

Sinfin psixoloji iqlimi, əsasən, nədən asılıdır? İlk növbədə, bu suala şagirdlərlə birlikdə cavab tapmaq lazımdır. Psixoloji iqlim, hər şeydən əvvəl, insanın işə münasibəti ilə müəyyən olunur. Çünki qrup və ya kollektiv, əslində, hər hansı bir işə nail olmaq üçün mövcud olur. Məktəbdə əsas məqsəd-oxumaqdır, əsas iş isə - tədrisdir. Əlverişli iqlim yalnız hər bir uşağın öz vəzifəsinə vicdanlı və doğru münasibətindən asılıdır. Hər kəs mövcud problemlərdən asılı olmayaraq tədrisdə, ictimai işdə və s. müsbət nəticəyə nail olmaq üçün səy göstərməlidir. Yalnız bu halda münasibətlər bərabərləşir və hər kəsə hörmət mövcud olur. Müəllim siniflə birlikdə "Təhsilə vicdanla yanaşma" mövzusunu müzakirə edə bilər. Təhsilə vicdanlı münasibətin psixoloji iqlimə təsiri şagirdlərlə birlikdə təhlil oluna bilər.

Şagirdlərə çatdırmaq lazımdır ki, təlim fəaliyyətindən razı qalmaq uşaqların əhvali-ruhiyyəsinə təsir edir. Bu isə yalnız o halda baş verir ki, hər kəs biliklərə yiyələnmək yolunda uğurlara can atır, sinif yoldaşlarının onun işləri ilə maraqlandığını bilir, dəstəklərini hiss edir və özü də öz növbəsində yoldaşlarına kömək etməyə hazır olur. Təbii ki, hər bir şagirdin müvəffəqiyyət dərəcəsi müxtəlif ola bilər: biri bütün fənləri asanlıqla mənimsəyir, digəri humanitar fənlərdə, başqa birisi isə texniki fənlərdə uğur qazanır. Əlbəttə, bəzən müvəqqəti uğursuzluqlar da qaçılmazdır. Əsas odur ki, hər kəs müəllimin, yoldaşlarının köməyi ilə çətinliklərin öhdəsindən gəlsin, proqram materiallarını mənimsəməyə nail olsun.

Müasir psixologiya elmində psixoloji iqlim dedikdə, ilk növbədə, şəxsiyyətlərarası münasibətlər başa düşülür. Bu da öz növbəsində birgə fəaliyyətin və qrupda şəxsiyyətin hərtərəfli inkişafını təmin edən psixoloji şəraitin məcmusu kimi özünü büruzə verir. Son illərdə aparılan tədqiqatların nəticələrinə əsasən belə bir ümumi qənaətə gəlmək olar ki, əksər məktəblərin müxtəlif siniflərində məktəbdaxili psixoloji iqlim heç də istənilən səviyyədə deyil. Müasir məktəbdə əlverişli psixoloji iqlimin formalaşdırılması problemi özünü kəskin şəkildə büruzə verir.

Məktəb təcrübəsində elə hallara rast gəlmək mümkündür ki, şagird bir fənni sevir, onunla maraqlanır və şagirdin bu sahədə xüsusi istedadı olduğu özünü büruzə verir. Lakin həmin fənni tədris edən müəllimin digər bir müəllimlə əvəz olunması şagirddə həmin fənnə qarşı olan maraq və həvəsin sönməsinə səbəb olur. Ə.Ə.Əlizadə bu məsələnin mahiyyətini düzgün bir şəkildə ifadə edərək yazmışdı: “Marağın strukturunda hislər xüsusi yer tutur. Şagird bu hislərin ılıq nəfəsində müəllimlə fənni asanlıqla doğmalaşdırır. Onun üçün sevimli müəllim həm də maraqlı dərs deməkdir. Müəllimi sevməyəndə isə ...saygısız müəllimin dərsi yeniyetməni cəlb etmir, ona cansıxıcı, darıxdırıcı, maraqsız görünür”(1).

Şübhəsiz ki, yeniyetməlik dövründə də müəllim-şagird münasibətlərindən çox şey asılıdır. Müəllim öz nümunəsində yeniyetmə şəxsiyyətinin formalaşmasında mühüm rol oynayır. Belə ki, yeniyetməlik dövründə müəllim-şagird münasibətlərinin ikinci plana keçməsi, şagird-şagird münasibətlərinin daha əhəmiyyətli rol oynadığı psixoloji ədəbiyyatlarda tez-tez vurğulanır.

Müəllim-şagird münasibətlərinin müvəffəqiyyəti dərsdə o zaman gerçək təzahür edir və pozitiv istiqamətdə formalaşır ki, onlar bir-birini başa düşür, hörmət edir, ən nəhayət bir-birinə inanırlar. Ancaq belə bir prinsip üzərində, yəni bir-birinə qarşılıqlı hörmət və inam əsasında qurulmuş münasibətlər məktəblinin şəxsi sərvətinə çevrilir (3).

Psixoloji iqlimin formalaşdırılması və idarəolunması yollarını bilmək müəllim üçün çox vacibdir. Psixoloji iqlim - sinifdə təhsilalanların birgə işinin, onların şəxsiyyətlərarası qarşılıqlı fəaliyyətinin nəticəsidir. Sinifdə psixoloji iqlimin formalaşdırılmasının və mühafizə edilməsinin daha səmərəli yolları aşağıdakılardan ibarətdir:

-sinifdə həmrəyliyə səbəb ola biləcək ümumi maraqları tapmaq və onun əsasında ümumi işi təşkil etmək;

-sinfin ənənələrini formalaşdırmaq və məktəbin ənənəvi işlərində iştirak etmək;

-asudə vaxt varsa, şagirdləri onu birlikdə keçirməyə cəlb etmək, gəzintilərə, ekskursiyalara getmək;

-sinifdə emosional həmrəyliyə nail olmaq, əhəmiyyətli hadisələr zamanı kollektiv şəkildə başqasının dərdinə şərik ola bilmək;

-ümumi insani dəyərləri şagirdlərə aşılamaq, səmimiliyi, xeyirxahlığı rəğbətləndirmək, neqativ emosiyaları uzaqlaşdırmaq,

bir-birinin fikirlərinə müdaxilə etməmək, hamının maraqlarını nəzərə almaq, ümumi, həmrəy qərara gəlmək;

-kommunikativ mədəniyyəti, ünsiyyət və əməkdaşlıq vərdişlərini inkişaf etdirmək.

Psixoloji iqlim uşaqların mənəvi vəziyyəti ilə bağlıdır və müsbət istiqamətdə cərəyan etdiyi hallarda xeyirxahlıq, vicdan, namus, mərhəmət kimi vacib anlayışlar mənəvi psixoloji iqlimdən xəbər verir.

Əlverişli psixoloji iqlim zamanı şagirdin hiss etdiyi əsas üstünlük təşkil edən emosiyalar bunlardır: xeyirxahlıq, müdafiə olunma, mobillik, kreativlik, optimizm, təşəbbüskarlıq, işə qabillik, öz "mən"inin azadlığı.

Əlverişsiz psixoloji iqlim zamanı isə şagirdin hiss etdiyi əsas üstünlük təşkil edən emosiyalara daxildir: müdafiə olunmama, tənbəllik, süstlük, aqressivlik, ruh düşkünlüyü, sıxılma, passivlik.

Əlverişli psixoloji iqlim tədris materiallarının şagird tərəfindən yaxşı mənimsənilməsinə, şəxsiyyətin hərtərəfli inkişafına zəmin yaradır. Buna görə də sinifdə əlverişli psixoloji iqlimin yaradılması pedaqoji işin mühüm komponentlərindən sayılır, çünki psixoloji cəhətdən sağlam, yaradıcı, öz gücünə inamlı insanlar müasir cəmiyyət üçün xüsusi əhəmiyyət daşıyırlar.

Yeniyetmə psixologiyası özünəməxsus xüsusiyyətləri və öz daxili inkişaf qanunauyğunluqlarına malikdir. Bu yaş dövrü özünün mürəkkəblikləri ilə seçilir: yeniyetmə artıq uşaq deyil, ancaq böyük də deyil. Yeniyetmənin özünüqiymətləndirməsi qeyri-sabitdir, hər söz və hərəkət ona tez toxunur, hər şeyə tənqidi yanaşır, sərbəstliyə can atır. Əgər müəllim münasibətlərdə yeniyetmənin yaş xüsusiyyətlərini nəzərə almırsa bu halda yeniyetmə ya özünə qapanır, ya da mübahisə edir, konflikt yaradır. İstənilən cisim və hadisələrə müəllim və yeniyetmənin münasibəti müvafiq yaş dövrünə uyğun olaraq müxtəlifdir.

Yeniyetməlik dövründə şagirdin özünəməxsus dəyərlər sistemi formalaşır. Bu yaş dövründə insan üçün ən vacib dəyər ünsiyyət və müəyyən insanlar qrupuna daxil olmaqdan ibarətdir. Məhz burada bir çox yeniyetmələrin problemləri başlanır. Problemlər təkcə oxumaqla bağlı deyil, tez-tez valideynlərlə də müxtəlif anlaşılmazlıqlar yaşanır. Yeniyetmənin təhsilə maraq göstərib-göstərməməsi çox vaxt daxil olduğu qrupdan asılı olur: qrup daxilində oxumaq, savadlı olmaq başlıca dəyər kimi qiymətləndirilirsə yeniyetmə də təhsilə maraq göstərir, ona uğur mənbəyi kimi baxır. Əksinə qrup daxilində təhsilə maraq yoxdursa yeniyetmə üçün oxumaq, təhsil almaq öz dəyərini itirir. Birinci halda yeniyetmə təhsilə maraq göstərdiyi üçün məktəblə heç bir problem yaşamır. Çünki o müvəffəq şagirdlərin qrupunda olmağa can atırsa, onların səviyyəsində qalmaq üçün çalışacaq.

Yeniyetmələrin fəaliyyətində əsas motiv təhsildir. Bu prosesin səmərəliliyi, yüksək nəticələrin əldə olunması ən vacib amillərdən biridir.

İstər yeniyetməlik dövründə, istərsə də ilk gənclik dövründə insanın həyatında onun həmyaşıdları ilə münasibəti mühüm əhəmiyyət kəsb edir. Yeniyetmə həmyaşıdlarına bəzən valideynlərindən də artıq inanır. Bütün bunlar isə onunla bağlıdır ki, yeniyetmə ünsiyyətə, ilk növbədə isə başqası tərəfindən başa düşülməyə can atır. Bu isə digər insanlarla müqayisədə yeniyetmənin həmyaşıdları ilə münasibətlərində daha da uğurlu alınır. Professor Ə.Ə.Əlizadə yeniyetmələrın yoldaşları ilə yaxınlıq dərəcəsinin üç tipinin fərqləndiyini göstərmişdir: sadəcə olaraq yoldaş, yaxın yoldaş və şəxsi dost. Yeniyetmə belə hesab edir ki, həmyaşıd uşaqlarla münasibətlər onun şəxsi münasibətləridir; heç kəsin buna qarışmağa haqqı yoxdur (1).

Yeniyetmələrin dostluğu üçün ən xarakterik cəhət emosionallığın yüksək olmasıdır. Onların dostluğu müxtəlif hislərin güclü axını ilə müşayiət olunur. Onlar küsürlər, barışırlar, bir-birlərinə qarşı olan dostluqlarını sınağa çəkir, yaranmış münasibətlərin möhkəmliyinə inanır və onu qorumağa çalışır, bəzən bir-birlərini sədaqətsizlikdə ittiham edir, dostlarını başqalarına qısqanırlar və s.

O məktəblərdə ki, müəllimlər təkcə uşaqların təhsili ilə deyil, həm də sosial və emosional tələbatları ilə maraqlanırlar şagirdlər üçün təhsil, şəxsi inkişaf, qarşılıqlı fəaliyyət üçün təhlükəsiz mühit yaratmış olurlar.

Birincisi, uşaqlar, daha çox da yuxarı sinif şagirdləri, yeniyetmələr hər zaman böyüklərin sözlərinə qulaq asmır, baş verən problemləri başqalarını dinləmədən özləri həll etməyə çalışırlar. Bundan başqa bütün tövsiyələr, məsləhətlər yalnız o vaxt reallaşa bilər ki, insan özü bunu istəyir, özü qərar qəbul edir, özü nəyəsə nail olur. Tərbiyə işinin planlaşdırılması və onun vəziyyətinin reallaşmasında üç qarşılıqlı əlaqədə olan səviyyənin məntiqi əlaqəsinə üstünlük veririk: məktəb, sinif, şəxsiyyət. İnkişaf proqramı bu üç səviyyənin qırılmaz əlaqəsinə əsaslanır. Fəaliyyəti bu üç səviyyədən biri, yaxud ikisi üzərində qurmaq istəyi bütün sistemin bütöv və ya ayrı-ayrı komponentlərinin nəticəsinin aşağı düşməsinə səbəb olur.

Bizim məktəbin tərbiyə sistemi konkret tərbiyə şəraitini özündə əks etdirən xüsusiyyətlərə malikdir: şagird kontingenti, ənənələr, mühitin xüsusiyyətləri, pedaqoji kollektivin imkanları.

Yeniyetmə və gənclik yaşında ünsiyyətə olan yüksək tələbat tənhalığa, təkliyə olan tələbatla uyğun gəlir: daimi söhbətlər, birgə vaxt keçirmə yeniyetmələrin tək qalmaq cəhdi ilə əvəz olunur. Tənhalıq, başa düşülməmək, özünü lazımsız hiss etmək kimi vəziyyətlər yaranır. Bəzən bu hal yeniyetməyə çox əziyyət verir. Lakin bu cür “yeniyetmə tənhalığı” keçici xarakter daşıyır. Bu vacib, lakin tez ötüb keçən hal yeniyetmə şəxsiyyətinin inkişafından irəli gəlir. Yeniyetmənin yaxınları ilə müvəqqəti yadlaşması, ünsiyyətdən doyması, tənhalığa can atması halları ola bilər. Bəzən yeniyetmə hər şeydən yorulur, hətta sevgi, valideynlərin məhəbbəti də onu yorur. Bu halda yeniyetmənin daimi münasibətlərdən yorulub özünəməxsus istirahət etmək istəyini başa düşmək lazımdır.

Yeniyetmənin özünü sinifdə nə qədər təhlükəsiz hiss etdiyini müəyyən etmək üçün qeyd olunan metodlardan istifadə etmək olar:

-Yeniyetməni müşahidə etmək. Müşahidə zamanı qorxu ilə bağlı qeyd etdiyimiz davranış xüsusiyyətlərinin olub-olmamasına fikir vermək olar.

-Yeniyetmənin tez-tez gecikmələri və dərsdən yayınmaları onu göstərir ki, o sinifdə olmaq istəmir.Yeniyetmənin emosional vəziyyəti barədə onun pozasını müşahidə edərək məlumat əldə etmək olar.

-Valideynlərlə söhbət. Müəllim şagirdin sinfə həvəslə gəlib-gəlmədiyini, sinif haqqında söhbət və danışdıqlarını müəyyən etməlidir. Məktəbdən sonra və ya səhərlər əzginlikdən şikayət edirmi? Yeniyetmə dərslərini necə hazırlayır: müstəqil yerinə yetirir, yoxsa valideynlərin təzyiqi ilə.

Yeniyetmənin özünü məktəbdə evdəki kimi rahat hiss etməsi üçün müəllim bu üsullardan istifadə edə bilər:

-Yeniyetmələrin ümumi məkanın tərtibatında iştirak etməsi, məsələn: sinfin daxili quruluşunu birlikdə təşkil etmək.

-Yeniyetmələr öz siniflərinin qayda-qanunlarının yaranmasında iştirak etmək imkanına malik olmalıdırlar.

-Şagirdlərin bir-birlərini, eyni zamanda müəllimi daha yaxşı tanıya bilmələri üçün

***3**

müxtəlif üsullardan istifadə etmək olar. Birgə gəzintilər, ekskursiyalar uşaqları və müəllimi bir-birlərinə yaxınlaşdırır.

-Dostluq münasibətləri qurmaq və onu qorumaq insanın ən vacib qabiliyyətlərindən biridir. İnsan bununla həm özünün emosional əlaqəyə olan tələbatını ödəyir, həm də öz dəyərlərini müdafiə etməklə inkişaf etdirir. Böyüklər kimi yeniyetmələr də dostluq münasibətlərindən çox şey öyrənə bilərlər. Dostlar öz hislərini və qorxularını bölüşür, problemlərini ətraflı müzakirə edə bilərlər. Bəzən yeniyetmələr xarakter cəhətdən özlərindən çox fərqli olan dostlar seçirlər. Tez ünsiyyətə girməyi bacaran, cəld bir yeniyetmə qapalı, astagəl bir yeniyetmə ilə dostluq edə bilər. Lakin çox vaxt dostluq münasibətləri xarakter etibarilə bir-birinə çox oxşayan, maraqları üst-üstə düşən insanlar arasında baş tutur. Sinifdəki ümumi psixoloji iqlimə yeniyetmənin özünə əminlik dərəcəsi böyük təsir göstərir. Özünə inamı yüksək olan şagirdlə yanaşı, özünə inamı aşağı olan, daim öz gücünə, bacarığına, ümumi işdə uğura şübhə ilə yanaşan şagird üçün də sinfə uyğunlaşmaq çətin olur. Buna görə də sinifdə gərgin, əsəbi şərait, iqlim yarana bilər.

Daimi ünsiyyət zamanı başqa insanın ləyaqətinə hörmət etmək məsuliyyətli işdir. Özünü başqa insanın yerinə qoymaq, başqasının dərdinə şərik olmağı bacarmaq dostluq münasibətləri qurmaq üçün çox vacib keyfiyyətlərdir. Qarşılıqlı münasibətlərdə mədəniyyətin vacib göstəricisi-özünü və öz mövqeyini obyektiv qiymətləndirməkdən ibarətdir. Öz səhv və nöqsanlarını etiraf etməkdən heç vaxt qorxmaq lazım deyil.

Sözsüz ki, şagirdin özünə münasibəti bir çox hallarda müəllimdən asılıdır. Müəllimin yaxşı münasibəti uşağı müdafiə edir, onun özünə hörmətini artırır, bütün situasiyalarda qəbul olunduğunu nümayiş etdirir. Bunun üçün müəllim müxtəlif üsullardan da istifadə edə bilər.

Kollektivin psixoloji iqlimi - bu emosional psixoloji əhvaldır, emosional səviyyədə kollektiv üzvlərinin şəxsi və işgüzar qarşılıqlı münasibətləri, mənəvi normaları və maraqları, sərvət meyilləri ilə müəyyən olunur. Kollektivin psixoloji iqlimi ünsiyyət prosesində yaranır və meydana çıxır, bunun fonunda şəxsiyyətlərarası və qrup tələbatları reallaşır.

Qeyd olunduğu kimi, sağlam psixoloji iqlim məktəbdə şagirdlərin və müəllimlərin səmərəli fəaliyyətinin mühüm göstəricilərindən biridir. Məhz məktəbdaxili psixoloji iqlimin əlverişli olduğu şəraitdə həm müəllimlər, həm də şagirdlər özünü təsdiq etməyə müvəffəq olur, real imkanlarını obyektiv qiymətləndirməyi bacarır. Psixoloji tədqiqatlar nəticəsində o da aydın olmuşdur ki, şəxsiyyətin özünüdərketməsinə daxil olduğu qrupa münasibəti də təsir göstərir. Şəxsiyyətin qrupdakı münasibətlərdən razı qalması, qrupdakı mövqeyindən məmnunluğu onun özünüdərketməsinə, özünüqiymətləndirməsinə təsirsiz ötüşmür. Psixoloji iqlimin əlverişli olduğu kollektivlərdə həmrəylik müşahidə olunur, kollektiv üzvləri bir-birlərinə dəstək olur. Bütün bunlar ümumi ruh yüksəkliyinə səbəb olaraq, kollektivin əmək fəaliyyətinin güclənməsinə zəmin yaradır. Həmrəyliyin güclü olduğu kollektivlərdə baş vermiş istənilən konflikti aradan qaldırmaq daha asan olur.

Sinifdə psixoloji iqlimin yaxşılaşdırılması təlim-tərbiyə işinin səviyyəsinin yüksəlməsinə səbəb olur. Sinfin həyat fəaliyyətinin, psixoloji iqliminin elə vacib tərəfləri var ki, demək olar ki, bütünlüklə rəhbər tərəfindən müəyyən olunur:

1. Ümumi kollektiv işin, birgə təəssüratların təşkili: şagirdlərin ad günündə kollektiv təbrik, qəmli hadisələr, xəstəlik, uğursuzluq zamanı sinif tərəfindən şagirdin yanında olduqlarını hiss etdirmək, birgə eks-

kursiyaların təşkili, konsert və tamaşalara birlikdə getmək, bayram günlərinin birgə qeyd olunması.

2. Müəllimin şagirdlərlə düzgün qarşılıqlı ünsiyyət qurmaq bacarığının olması:

a) şagirdlər arasında sosial statusa görə fərq qoymamaq, özü ilə uşaqlar arasında yaş fərqini nəzərə almadan mehribanlıq yaratmaq;

b) şagirdlərin fərdi xüsusiyyətlərini, müxtəlif vaxtlardakı əhvalını, onun sizə qarşı olan münasibətini nəzərə almaq;

c) başqa insanların fikirlərinə hörmətlə yanaşmaq;

ç) layiq olduqları halda şagirdlər haqqında xoş sözlər demək;

d) tənqid forma və məzmununa görə insanlara hörmətsizliklə göstərməmək.

Aydındır ki, şagird kollektivinin psixoloji iqliminin əlverişli olması yeniyetmə şəxsiyyətinin formalaşmasına mütləq şəkildə təsir göstərən amillərdəndir. Bu baxımdan problemin öyrənilməsi istiqamətində işlər xüsusi aktuallıq kəsb edir.

Qeyd etmək lazımdır ki, şagird kollektivinin psixoloji iqliminin yeniyetmə şəxsiyyətinin formalaşmasındakı mühüm rolunu nəzərə almaqla aparılan işlərin elmi-nəzəri əhəmiyyəti çoxdur.

***Rəyçi: prof. H.Əlizadə***

## İstifadə edilmiş ədəbiyyat

1. Əlizadə Ə. Yeni pedaqoji təfəkkür. Bakı: Adiloğlu, 2001, 162 s.
2. Əliyev R. Tərbiyə psixologiyası. Bakı: Nurlan, 2006, s.185.
3. Əliyev B., Cabbarov. R. Təhsildə şəxsiyyət problemi. Bakı: Təhsil, 2008, 134 s.
4. Əmrahlı L., Rzayeva N. Uşaq psixologiyası.Bakı: Nurlar, 2015, 342 s.
5. Под редакцией Реана А.А. Психология подростка. Прайм-Еврознак, 2007, 480 с.

**А.Мамедова**

### Коллектив учащихся в формировании личности подростка как важнейший условия

**Резюме**

Формирование подростка в основном происходит в школьные годы. С этой точки зрения к какой атмосфере подросток принадлежит от этого многое зависит. Образовании психологического климата в школьном коллективе помогает подростку чувствовать себя спокойно, во время занятий быть уверенным, выявлению качеств личности, адаптации в сложных жизненных ситуациях.

**A.Mammadova**

### Students' psychological climate as a great factor in teenagers' formation

**Summary**

The active development of personality,the main base of quality is formed and it happens durinq school years. From this viewpoint, it depends on the social atmosphere where teenagers belong.

Personality of teenagers is formed the process of sociality with people around him.

As a result of this the student personality is formed and the complicated system of his approach to people and to life is defined.

By having suitable psychological climate, the teenagers feel quiet, looks ahead with confidence during the lesson, the personal quality helps to adapt the difficult vital sitmation in student collective.

# XARAKTERİN İNKİŞAFI VƏ HƏR BİR ŞAGİRDİN ŞƏXSİYYƏT KİMİ NƏZƏRƏ ALINMASI



**Tünzalə Bağırova,**
***Şamaxı şəhəri, 2 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *xarakterin inkişafı, şagird şəxsiyyəti, şagird- müəllim münasibətləri.*
***Ключевые слова:*** *развитие характера, личность учащегося, отношения между учащимся и учителями.*
***Key words:*** *character development, student personality, student-teacher relations.*

Müasir pedaqogika-psixologiya nəzəriyyəsinə əsasən xarakter, ilk növbədə, məhz təhsilin mənəvi dalğalarında formalaşır. Professor Ə.Əlizadənin sözləri ilə desək: "Təhsil şəxsiyyəti formalaşdırır, bu gün şəxsiyyətyönümlü təlim prinsipi müasir təhsil nəzəriyyəsinin ən başlıca prinsiplərindən biri kimi dəyərləndirilir".

Söhbət müasir məktəbdən getdiyindən şagird xarakterinin inkişafından bəhs edərək burada təhsil kurikulumlarının xarakterinə görə iki yerə ayrılması, onlardan birincisinin fənyönümlü, ikincisinin isə şəxsiyyətyönümlü olması nəzərdən qaçırılmamalıdır. Belə bir prosesdə şagirdlərin xarakterinin müəyyənləşməsində əqli fəaliyyətlə bağlı qabiliyyətlərin formalaşdırılmasının ön plana çəkilməsinin zəruriliyi əsas təsiredici amil kimi götürülməlidir.

İngilis alimi Şadler müxtəlif ölkələrdə təhsilə münasibəti xarakterizə edəndə belə bir mülahizə söyləmişdir: "Təhsildən söz düşəndə alman - nə biləcəm, fransız - hansı imtahanlar olacaq, amerikalı - nə bacaracam, ingilis - karyeram necə olacaq deyə soruşur". Göründüyü kimi, şagird xarakterinin formalaşmasında onun düşdüyü mühitin, mentalitetin rolu az deyildir. Ona görə də, şagirdin xarakterindən danışdıqda milli-mənəvi dəyərlər həlledici amil kimi çıxış edir. Bizim məktəblinin xarakteri Azərbaycan xalqının sabahına, millətin gələcəyinə hesablanmalıdır.

"Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı"nın uğurlu davamı kimi fənyönümlü təhsil sistemindən şəxsiyyətyönümlü təhsilə keçidin əsası qoyuldu. 2006-cı ildə "Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulum)" sənədi imzalandı. 2007-ci ildən sonrakı illər isə fənn kurikulumlarının tətbiqi dövrü kimi tarixə düşdü.

Kurikulumun tətbiqindən sonra şagirdlərin ümumi inkişafı, meyil və maraqlarının nəzərə alınması və əlverişli təlim şəraitinin yaradılması prinsipləri ön plana çəkildi. Bütün bunlar isə şagirdlərdə universal bacarıqların formalaşdırılmasına imkan yaradır. Onların xarakterində bir sıra dəyişiklikləri zəruri edir. Əlbəttə, yeni, müasir tələblərə cavab verən davranış formalarının müəyyən edilməsi bəzi prinsiplərə tənqidi münasibətin bəslənməsini də meydana qoyurdu.

Yeni şəxsi düşüncə və idrak özünün fəaliyyəti ilə yeni dəyərləndirmələr gətir-

məyə başladığı üçün şagirdlərin xarakterinin inkişafına təlimin məzmununa uyğun yollar açırdı. Bu isə şagird xarakterinin pedaqoji-psixoloji əsaslarının işlənməsi və həyata keçirilməsi kimi problemlərin həll olunması zərurətini yaradır. Hər şeydən əvvəl, müəllim dərs prosesi zamanı şagirdə bir şəxsiyyət kimi baxmalı, onun söylədiyi fikirlərə hörmətlə yanaşmalıdır. Bu, çox böyük bacarıq tələb edən bir vəzifədir və burada başlıca məsuliyyət müəllimin elmi-pedaqoji hazırlığı və metodiki ustalığının səviyyəsi ilə qiymətləndirilir. Bu tələblərlə üzləşən müəllim təbiəti də kökündən dəyişməli və şagirdi dərketmə, başadüşmə bacarıqlarına sahib olmalıdır. Bu bir tərəfdən narahatlıq doğursa da, intellektual və emosional baxımdan məmnunluq hissi aşılayır və xoş duyğu yaradır. Müəllimlər inanırlar ki, şagird-müəllim münasibətlərinə yeni yanaşma, yəni bu münasibəti yenidən qurmaq böyük səy tələb edir. Bu günün şagirdləri artıq həm böyümə, həm də bilikləri genişləndirmə kimi davamlı bir prosesin axarına düşüblər. Onlar həmişəki uşaqlar deyillər. Xarakterləri nəinki ildən-ilə, aydan-aya inkişaf edir.

Pedaqogikanın öyrətdiyi kimi, dərs dediyimiz hər bir şagird təkrarolunmaz dərəcədə fərdi insandır. Şagirdə müəyyən bir mədəniyyətin, ailənin, mühitin sağlamlıq dərəcəsinə, eləcə də özünəməxsus temperamentə və şəxsiyyətə malik fərd kimi yanaşılması zamanın diqtəsidir. İndi artıq onun xarakterini yalnız məktəblər formalaşdırmır. O internetlə tanışdır. Müxtəlif ictimai-siyasi proseslər onda yeni fikirlər, durumlar oyadır. O sanki dünənki uşaq, dünənki adam deyildir. Düşünmə vərdişləri uşaqlara imkan verir ki, onlar informasiyalardan daima istifadə etsin.

Qeyd etmək lazımdır ki, xarakterin inkişaf etməsi, şagirdin bir şəxsiyyət kimi formalaşması prosesi tərbiyənin önəmli istiqamətlərindən biridir. Yalnız çoxtərəfli fəaliyyət və dərketmə xarakterin tərbiyəsi, mənəvi dəyərlər əsasında mənəvi keyfiyyətlərin formalaşmasında xüsusi əhəmiyyət kəsb edir.

Fəaliyyətin düzgün təşkili son nəticədə özünütərbiyəyə xidmət edir. Özünütərbiyə isə şəxsiyyəti formalaşdırır. Şagird mühitinin və proqramın məzmununun planlaşdırılmasında şagirdin inkişaf faktorları nəzərə alınmalı, bu prosesdə hər bir uşağın öz potensial imkanlarının tam üzə çıxması ilə həmahəng olmalıdır. Belə münasibətlər fonunda şagird də müəllim tərəfindən irəli sürülən fikirlərə hörmət və sevgiyə qarşılıqlı reaksiya verir, sərbəstlik qazanır, düşündüklərini çatdırmaqda çətinlik çəkmirlər.

Müəllimlər uşaqlarla kifayət qədər, həm də ardıcıl işləməli, onların fərdi xüsusiyyətlərinin, maraqlarının düzgün istiqamətləndirilməsinə diqqət yetirməlidirlər. Müasir dövrdə insan amilinin xüsusi sosial-pedaqoji əhəmiyyət kəsb etdiyi bir şəraitdə şagird xarakterinin formalaşması cəmiyyətin dəyərli mənəvi proseslərindən biri kimi çıxış edir. Çünki tədris prosesi əhəmiyyətli dərəcədə şagirdlərin şəxsiyyətindən, onların böyüklərə və bir-birinə qarşılıqlı münasibətindən çox asılıdır. Tədqiqatlar nəticəsində müəyyən edilmişdir ki, pedaqoji qabiliyyətlər sistemli xarakter daşıyır, onlar bir-biri ilə qırılmaz tellərlə bağlıdır. Həmçinin “şagird bir şəxsiyyət kimi bənzərsizdir” (Ə.Əlizadə). O, bir şagird kimi təlim-tərbiyə prosesinin mərkəzi hadisəsidir. Təlimin məzmunu da məqsəd deyil, şagird şəxsiyyətinin inkişafı üçün ancaq vasitədir. Ona görə də, müəllimlər hər bir şagirdin məziyyətlərini görməli və onun cücərti halında olmasını nəzərə almalı və onun gələcəyinə inanmalıdır.

Şagird xarakterinin inkişaf etdirilməsində biz müəllimlərin vəzifəsi, nəyi tədris etməklə bərabər, həm də necə tədris

etməli məsələsini müəyyənləşdirməkdir. Şagirdlər isə özlərinə edilən rəftardan mənəvi nəticələr çıxararaq və özləri də başqaları ilə necə rəftar etmək lazım olduğunu öyrənməli və bunları öz xarakterində büruzə verməlidir.

Təəssüflə qeyd etmək lazımdır ki, bəzi hallarda müəllimlər təlimdə geridə qalan uşaqlarla rəftarda fərqli yanaşmalarda yanılırlar. Onlar təlim prosesində olduğu kimi, tərbiyə işində də diferensiallığın zəruriliyini gözdən qaçırırlar. Halbuki istedadlı, əlaçı şagirdlər kimi təlimdə geridə qalanlar da cəmiyyətin inkişafında əqli, fiziki, məhsuldar qüvvədirlər və onlar bu bölgüdə böyük əksəriyyət təşkil edirlər. Ona görə də, belə şagirdlər üçün gələcək əmək fəaliyyətində xarakterin başlıca əhəmiyyət kəsb etdiyini nəzərə alıb, onlarla daha həssas pedaqoji-psixoloji təsirlərə əl atmalıdırlar.

Təlimdə geridə qalmaq illər boyu məktəbin ağrılı problemi olsa da, burada "müəllim-valideyn", "müəllim-şagird" münasibətlərinə də istinad edilməlidir. Pedaqogika elmi təsdiq etmişdir ki, "müəllim-şagird" münasibətləri köklü təlim-tərbiyə məsələsidir. Bu münasibətlər şagird xarakterinin formalaşmasında da az rol oynamır. Şagirdlərlə hesablaşmaq, bir şəxsiyyət kimi onun tələblərinə hörmət etmək də şagird xarakterinin uğurlu insani xarakterlərlə zənginləşməsinə kömək edir. Xarakterin sabitləşməsində onun fərdi-psixoloji xassələrinin inkaredilməz həqiqət olduğu da təsdiq olunmuşdur. Bir sözlə, qarşılıqlı münasibətlərdə neqativliyə yol verilməməlidir.

Bu yolla müəllim hər bir uşağın zehnini öz qayğı və diqqəti ilə inkişaf etdirib, onun xarakterinə yeni cizgilər əlavə etməyə nail olur.

***Rəyçi: prof. O.Həsənli***

## İstifadə edilmiş ədəbiyyat

1. Əlizadə Ə., Əlizadə H. Pedaqoji psixologiya. Bakı, 2010.
2. Rüstəmov F. Pedaqoji qeydlər, resenziyalar, müsahibələr. Bakı, 2010.
3. Cəbrayılov İ. Şəxsiyyətyönümlü təhsil və vətəndaş cəmiyyəti. Bakı, 2011.
4. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.

**Т.Багирова**

**Характер учащегося и некоторые моменты в его развитии**

**Резюме**

В статье коснулось некоторых рекомендуемых рекомендуемых в практикев связи с развитием характера учащегося.

**T.Bagirova**

**Character development and treating students as individuals**

**Summary**

In the article it is touched upon some aspects of the development of student characters.



# ELMDƏ VƏ TƏHSİLDƏ VARİSLİK PROBLEMİ

**Adil Balıyev,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi***

**Açar sözlər:** *varislik, determinizm, inteqrasiya, təlim.*
***Ключевые слова:*** *преемственность, детерминизм, интеграция, обучение.*
***Key words:*** *continuity, determinizm, integration, trainings.*

Sivil dünyanın inkişafı kontekstində özünü büruzə verən demokratikləşmə, fərdin və toplumun doğal haqları Azərbaycan cəmiyyətinin də prioritetlərinə çevrilir, bu nlar isə millətin formalaşmağı sahəsində qarşımıza çox ciddi vəzifələr qoyur. Bu vəzifələrin effektli, təkmil həlli yolu təhsil sistemimizi irəliyə aparmağa qadir, müasir təlimin məzmundan doğan tələblərə cavab verə bilən yeni metodik sistemin yaradılmasından və bu yeniliyin keçmiş irsə - varisliyə istinad üzərində xətasız qurulmasından keçir. Cəmiyyətdə nəsillərarası, təlimdə mərhələlər və siniflərarası varislik müasir dünyamızın ən narahatedici, aktual sosial problemlərindəndir. İnsanlığın gələcək, taleyi, intellektual fəaliyyəti müəyyən mənada gənc nəslin düzgün oriyentasiyasından asılıdır. İctimai tərəqqidə sağlam irsi qoruyub mühafizə etməklə gələcək nəslə çatdırmaq biliklər potensialı ilə birdəfəlik həll oluna bilən bir riyazi məsələ, bir iqtisadi çözüm deyildir. Belə demək mümkünsə, varislik, irsə münasibət kimi elmin, insanlığın “əbədi” problemidir.

Azərbaycan təhsilinə, bütövlükdə Azərbaycan cəmiyyətinə əvvəlki illərdə böyük zəhmət hesabına ərsəyə gəlmiş elmi-pedaqoji əsərlərin, dərslik və monoqrafiyaların, bədii sənət nümunələrinin inkarı deyil, onların varisliyə əsaslanmaqla obyektiv və ciddi təhlili, araşdırılması, yeni təfəkkür fazasında yanaşılmağı daha çox mənfəət gətirə bilər.

Bu gün tədris prosesinin ilkin mərhələlərində əxz olunmuş bilik, bacarıq və vərdişlər sistemi intellektual bütövləşmənin əsas atributu kimi çıxış edir. Bu bütövləşməni təmin edə bilən başlıca prinsip isə varislikdir. İndinin keçmişə istinad etməsi (varislik) və sabah üçün elmi zəmin yaradılması (perspektivlilik) təlimin mühüm didaktik prinsiplərindəndir. Buna görə də pedaqoji elmimiz tərəfindən təhsilin bütün mərhələləri arasında varisliyin forma və yolları kompleks araşdırılıb öyrənilməli, kortəbii, epizodik yanaşmalar aradan qaldırılmalı, sistemli elmi dəlillərlə mənimsədilmiş biliklər perspektivdə öyrəniləcəklər üçün ciddi istinad nöqtəsi olmalıdır. Fərziyyələr, mülahizələr, faktlar sistemləşdirilməklə təlimi nəticəyə aparan yolların elmi-nəzəri və praktik istiqamətləri də bu məqsədlər üçün işlənilib hazırlanmalıdır.

Təlimin struktur və məzmununun kökündən dəyişməsi, yeni təlim texnologiyalarının, yeni metodik sistemin tətbiqi, əslində, digər elmlər kimi ədəbiyyatın da daxili mahiyyətinə, ədəbi əsərlərin spesifik xüsusiyyətlərinə yeni yanaşmaları bir daha labüdləşdirir. Təbiidir ki, ədəbiyyatın özünün daxili mahiyyətində bir irsilik, bir ideya, mövzu, süjet qohumluğu var. Yəni ədəbiyyat özü bir mirasdır və ayrı-ayrı dövrlərdə böyük bədii nümunələr yaranmaqla ədəbiyyat, əsasən, öz fasiləsizliyini təmin edir. Bu mahiyyətin özü varisliyi ədəbiyyatı öyrənmə prinsipinə çevirir.

Yəni mərhələlər, mövzu və ideyalar, bədii konflikt və kompozisiyalar arasında

həmişə optimal bir əlaqə mövcuddur. Bəzən varislik xronoloji ardıcıllıq, sələf-xələf münasibətləri kimi qəbul edilir, təlim prosesinin özünün psixoloji, pedaqoji və məntiqi tərəfləri arasında olan zəncirvarı əlaqə unudulur.

Yadda saxlamaq lazımdır ki, varislik bir yöndən məcburi xronoloji əlaqədirsə, digər istiqamətdən bilik, bacarıq və vərdişlərlə bağlı təbii təlim prosesinin doğurduğu nəticədir. Yəni varisliyi yalnız fənnin məzmunu, tarixi ilə bağlı xronikasında deyil, təlimi nəticələrə hesablanmış pedaqoji-psixoloji tərəflərdə, məzmun xətləri və standartlarda, ədəbiyyatın toxunduğu həyat həqiqətlərində, şifahi və yazılı nitqin inkişaf trayektoriyasında da axtarmaq lazımdır.

Müşahidələrimiz belə deməyə əsas verir ki, əksər müəllimlər varisliyə təfəkkür prosesini irəliyə doğru aparan inkişafedici prinsip kimi deyil, tarixi-xronoloji düzüm olaraq yanaşır. Halbuki təlimdə bütövləşməni, inteqrasiyanı təmin edə bilən başlıca prinsip varislikdir. Müasir təlimdəki inteqrativlik varisliyə də yeni prizmadan baxışı zəruri edir, xüsusilə şaquli inteqrasiyada varisliyin mövqeyi çox güclüdür.

Ənənəvi təlimdə də fəndaxili, fənlərarası əlaqələr qismən gözlənilsə də, varislik müəllimin peşə sistemogenezisinin əsas şərti kimi çıxış etmirdi. Bugünkü fəal təlimdə isə dərsin məzmununu, quruluşunu, mənimsədilmə yollarını onsuz təsəvvür etmək mümkün deyildir. İnduktiv-deduktiv metod situasiya, inteqrasiya (şaquli və üfüqi) müasir dərsdə varisliyin başlıca təminatçısıdır.

Əslində fəndaxili və fənlərarası inteqrasiya varisliyə əsaslanır və təlimdə fasiləsizliyi təmin edən atribut kimi çıxış edir. Keçmişə istinad bir didaktik sistem kimi fəal dərsdə iştirak etmirsə, nə keçmişdə mənimsədilmişlərin gündəlik tətbiqindən, nə gələcək bilik, bacarıq və vərdişlərin formalaşacağından danışmaq olmaz.

Tarixi dəyişikliklər və yaşadığımız indiki dövr bir daha sübut edir ki, varislik nəsillərarası informasiya mübadilələrində, cəmiyyətdaxili təkmilləşmədə, yeni intellektual kapitalın formalaşmasında və bütün bunları təmin etməyə zəmin olan təlim prosesində aktuallığını saxlayan daimi problem olaraq qalmaqdadır. Bu daimi problemin pedaqoji prosesdə oynadığı rolu dəqiqləşdirməkdən qabaq, onu fəlsəfi nöqteyi-nəzərdən araşdırmaq mühüm əhəmiyyət kəsb edir.

Təlimdə varisliyi araşdıran bəzi tədqiqatçılar belə bir müddəa ilə çıxış edirlər ki, fəlsəfi kontekstdə anlaşılan varislik metodik ədəbiyyata pedaqoji prosesin özünün fəlsəfi konsepsiyasından daxil olmuşdur və bu daxilolma birbaşa keçmiş biliyə istinadla, köhnənin üzərində yenini qurmaqla əlaqəlidir.

Nəzərə alsaq ki, aşağı siniflərdə şagirdin aldığı bəzi sadə biliklər yuxarı siniflərdə yeni biliyin mənimsənilməsi, tədrisi üçün zəmin rolunu oynayır, onda varislik münasibətlərinə tam və hissə anlayışları arasındakı nisbət prizmasından yanaşmaq lazım gəlir.

Varislik tədris prosesinin mühüm momentini təşkil edir və yeninin əmələ gəlməsini, təşəkkül tapmasını şərtləndirir. Bu baxımdan yeni biliyin daha əvvəl tədris olunmuş köhnə bilik üzərində mənimsədilməsi tədris prosesində varisliyin təhlili üçün metodoloji əhəmiyyət kəsb edir. Lakin nəzərdə tutmaq lazımdır ki, bəzən yeninin köhnə ilə əlaqələndirilməsi hər cür dəyişikliklərlə eyniləşdirilməsi halına rast gəlinir ki, bu varisliyin mahiyyətinin və təzahür xüsusiyyətlərinin düzgün açılmasına maneçilik törədir.

Varislik prinsipini əsas tutaraq bədii-nəzəri materialların tədrisinin sadəcə olaraq dəyişdirilməsi hələ varislik demək deyildir. Bu proses yeni biliklərə keçid, köhnə biliklərin yeniləşməsi məqamında dominant rolunda çıxış etməlidir.

İnkişaf dəyişikliklərə nisbətən mürəkkəb

prosesdir o, dəyişikliklər aktının bütöv keyfiyyətinin yeniləşməsini əhatə edir və varislik anlayışının mahiyyətinin və sərhədlərinin dəqiq aşkarlanmasına imkan yaradır.

İnkişafı dəyişikliklərin qeyri-müəyyən axınına buraxmaq və ya prosedur normalara tabe etdirmək doğru deyildir. Metodoloji baxımdan ona özündə struktur və sistem təşkili formasında stabillik, yeniləşmə elementlərini birləşdirən proses kimi yanaşma varisliyin mahiyyətinin də açılmasına xidmət edir, hadisə və proseslər arasında varislik əlaqəsinin dialektik mahiyyətinin dərk olunmasına imkan yaradır.

Varislik əlaqəsi həm konkret, həm də ümumi əsasda təzahür etməsinə baxmayaraq, onun özü də dəyişilməz qalmır, əksinə, inkişaf prosesinin gedişində təkmilləşir və zənginləşir. Belə ki, varislik əlaqələri ədəbiyyatşünaslığın ayrı-ayrı bölmələrinin ən ümumi əsasını və konkret halını mühafizə edərək bədii materialların tədrisində yenini dərketmə faktoru rolunda çıxış edir.

Varislik prinsipi ilk növbədə ədəbiyyat fənni üzrə müxtəlif siniflərdə şagirdlərə aşılanan bilik və vərdişləri reallaşdıraraq nisbi sabitliyin və dayanıqlığın mövcud olmasını şərtləndirməklə bərabər, tədris prosesinin sonrakı inkişafına impuls verən daxili determinant kimi də çıxış edir. O, determinant funksiyasını yerinə yetirərkən pedaqoji prosesin özünü müəyyənləşdirməsini də ifadə edir.

Beləliklə də, varislik köhnə biliklərlə yeni bilikləri bağlayan körpü rolunu oynayır. Bu baxımdan varisliyin mahiyyəti köhnənin təzədə, keçmişin indi də davamı kimi aşkar olunur. Lakin qeyd edək ki, bədii materialların tədrisi prosesində istənilən mühafizə olunma varislik əlaqəsi demək deyildir.

Bəzən elə hallar müşahidə olunur ki, mühafizəkarlıq zahirən varisliyi ifadə etməsinə baxmayaraq, əslində, tədris prosesində əlaqə funksiyasını yerinə yetirmir. İstənilən varislik əlaqəsi pedaqoji prosesi təşkil etmədiyi kimi, hər bir mühafizəkarlıq nümunəsi də varisliyi ifadə etmir. Digər tərəfdən varislik əlaqəsi yalnız köhnənin aradan qaldırılması deyil, eyni zamanda yeni biliklərə keçidi ifadə edən mühafizə olunma prosesində özünü göstərir.

Yeninin əmələgəlmə mexanizmi işə düşdükdə varislik prosesin zəruri elementi kimi çıxış edir, tədris prosesinin nəticələrini, həmçinin reallaşmamış şəkildə mövcud olan imkanları özündə cəmləşdirir. Məhz həmin imkanlar da tədris prosesinin zənginləşməsinin əsasını təşkil edir, mövcud şəraitə uyğun olaraq özünümüəyyənləşdirmə xüsusiyyəti qazanaraq inkişaf prosesində dialektik determinator rolunu oynayır. Təlimi problemlərin həllində determinizm rolunda çıxış etməklə yanaşı nəticəyönlü reallaşmaya da istiqamət verir. Determinizmin ardıcıl dialektik tətbiqi pedaqoji prosesin təhlilində diqqəti yalnız daxili deyil, eləcə də xarici əlaqə və xüsusiyyətlər üzərinə yönəldir.

Qeyd etdiyimiz kimi, varislik sistematik olaraq pedaqoji prosesin inkişafında daxili əlaqəni ifadə edir, lakin onun reallaşması xeyli dərəcədə müəllimdən də asılıdır.

Varislik özündə daxili və xarici faktorlar arasındakı qarşılıqlı əlaqələrin xüsusiyyətlərini cəmləşdirərək şagirdlərin aşağı siniflərdə aldığı biliklərlə yeni verilənlər arasındakı qanunauyğunluqlarla şərtlənir.

Qeyd edək ki, varisliyin düzgün anlaşılmasında daxili və xarici faktorların dialektikası pedaqoji prosesin inkişaf istiqamətliliyini müfəssəl təhlil etmək üçün də imkan yaradır. Pedaqoji prosesin inkişaf istiqamətliliyi, sadədən mürəkkəbə, asandan çətinə aparan yol da dialektika nəzəriyyəsinin inkarı inkar qanunauyğunluğuna əsaslanır. Bu isə müxtəlif siniflərdə reallaşan tədris proseslərinin qeyri-xəttiliyinin düzgün şərh olunmasına kömək edir.

Varislik pedaqoji prosesin çox mühüm tərəfi kimi özündə fasiləliklik fasiləsizlik, dayanıqlıq - dəyişkənlik, mühafizə etmək - itirmək, yeni - köhnə kimi zidd başlanğıcların və istiqamətlərin mübarizəsini realizə edir.

Elmi tədqiqatlarda inkişaf prosesindəki varisliklə təkrarlıq, təkrarçılıq haqqında bir-birinə zidd mövqelər mövcuddur. E.A.Ballerin fikrincə, təkrarlıq varisliyin formasıdır və mahiyyətcə təkrarlıq varisliyin içərisindədir.

Digər tədqiqatçılar (A.M.Milkin, V.A.Podolski, M.P.Palesovov və b.) isə adı çəkilən anlayışların üst-üstə düşmədiyini, hətta bir-biri ilə ziddiyyətdə olduğunu qeyd edərək göstərirlər ki, əgər varislik bütövlük və qarşılıqlı əlaqə yaradırsa, bu halda varisliyin əsas əlamətləri prosesin diskretliyi, fasiləliyi və çıxış nöqtəsinə qayıdışdır.

M.P.Palesovoya görə təkrarlıqla inkarı inkar qanunu arasındakı münasibət tam və hissə arasındakı nisbət xarakterini daşıyır, təkrarlıqla paralel verilən yeni biliklər həmişə köhnəyə qayıtmanı özündə ehtiva etmir. Bizim müşahidələrimizə görə bəzən müəllimlər təkrar dərsləri varisliyin əsas elementi kimi qəbul edir, belə düşünürlər ki, yeni biliyi təkrar dərsdən sonra daha yaxşı çatdırmaq mümkündür. Halbuki, təkrarlayıcı dərs bəzən yeni dərslə əlaqədə olmaya da bilər. Bu momentdə isə tavtologiya ilə təkrar arasında bərabərlik işarəsi də qoymaq olmaz. Müxtəlif janrları və ədəbi cərəyanları, müxtəlif ideya və məzmunu özündə daşıyan bədii ədəbiyyat üçün bu xüsusilə xarakterikdir.

Yeni bilik qazanarkən oxşar və fərqli informasiyaların tutuşdurulması, müqayisə obyektinə çevrilməsi həmişə zəruridir. Məhz təkrarlayıcı dərslə yeni məzmunlu dərsin fərqinin araşdırılması, hansında əlaqənin daha dinamik olması varisliyin başlıca şərtidir.

Varisliyin ümumi inkişafdakı rolunu biokimya sahəsi üzrə mütəxəssis, böyük türk alimi Əziz Sancarın Nobel mükafatı təqdimetmə mərasimindəki sözləri ilə yekunlaşdırmağı məqsədəuyğun bilirik: “Elmi tədqiqatlar vakuumda aparılmır, bizdən əvvəlkilərin və müasirlərimizin işləri əsasında aparılır”.

***Rəyçi: dos. Ə.Abbasov***

## İstifadə olunmuş ədəbiyyat

1. Полесовой М. Проблема повторяемости в философии и эстествознании. Горький: Волго, 1970.
2. Богданова О., Леонов С. Чертов В. Методика преподавания литературы, М.: Академ А, 1999.
3. Mikayılov Ş. Elmi-metodiki əsərlərdən seçmələr. Bakı, “Araz”, 2009.

**А.Балыев**

**Проблема преемственность в науке и в образовании**

**Резюме**

В статье исследуется преемственность, перспективность, наследственность и важные дидактические принципы, играющие роль в обучении литературе. В статье анализируются наследственность, перспективность, в общем наследство - вечная проблема науки, литературы, человечества.

**A.Balıyev**

**Inheritance problem in science and education**

**Summary**

The article deals with the inheritance. Perspective and the inner essence of literature. In teaching of literature it position is analyzed as a important didactic principle. It follows that the inheritance is the eternal problem of science and literature.

# ƏQLİ FƏALİYYƏTİN FORMALAŞMASI



**Samir Həsənov,**
***18 nömrəli Bakı Peşə Liseyinin müəllimi***

***Açar sözlər:*** *əqli fəaliyyət, tədris fəaliyyəti, orientirləmə, alqoritm.*
***Ключевые слова:*** *умственная деятельность, учебная деятельность, ориентировка, алгоритм.*
***Key words:*** *mental activities, learning activity, orientation, algorithm.*

Müasir dövrdə pedaqogika, psixologiya üzrə aparılmış eksperimental tədqiqatların nəticələri bilavasitə riyazi statistik metodlarla təhlil olunur. Bu tədqiqatlara xas olan yerlərdən birini də əqli fəaliyyətin formalaşması tutur. Bunları müəyyənləşdirmək müəllimdən yüksək sosial-psixoloji məharət tələb edir. Burada R.Dekartın sözlərini xatırlamaq yerinə düşər. O yazırdı: “Təkcə yaxşı ağıla malik olmaq kifayət deyil, başlıca məsələ - onu yaxşı tətbiq etməkdən ibarətdir”. O da məlumdur ki, intellektual bacarıqlar təlim prosesinin köklü məsələlərindən biridir. Onların şagirdlərdə formalaşmasının özünəməxsus xüsusiyyətləri vardır və bu xüsusiyyətlərin hər birinin müxtəlif inkişaf səviyyələri, əsasən, tədris prosesində müəyyən edilir.

Təlimin forması təlim prosesinin elə tərəfidir ki, o, tədris kollektivinin işinin təşkili ilə əlaqədardır. Yəni kollektivi ayrı-ayrı qruplara necə bölməli, kollektiv üzvləri arasında qarşılıqlı əlaqəni necə müəyyən etməli, müəllim bütövlükdə kollektivin, ayrı-ayrı qrupların və ayrı-ayrı şagirdlərin işinə necə müdaxilə etməlidir? Təlim üsulları bu prosesin elə xarakteristikasıdır ki, şagirdlərin sayından və onların qarşılıqlı əlaqəsindən asılı olmadan hər bir şagirdin tədris fəaliyyətini təsvir edir. Öyrətməyi hansı formada aparmağımızdan asılı olmayaraq biz ona nail olmalıyıq ki, məsələn, Pifaqor teoremini hər bir şagird öyrənsin və onu tətbiq etməyi bacarsın. Bunun üçün isə o, mətnlə və onun köməyi ilə həll olunan məsələ tipləri ilə tanış olmalıdır. O, bu məsələlərin həlli üsulları ilə tanış olaraq, bu üsulları tətbiq etməyi bacarmalıdır. Bütün bu fəaliyyət hər bir şagird tərəfindən aparılmalıdır, baxmayaraq ki, müxtəlif şagirdlər onu müxtəlif cür: biri tez, digəri yavaş-yavaş yerinə yetirirlər. Beləliklə, “təlim üsulları” termini hər bir şagirddən nəyisə ala bilmək fəaliyyəti ilə eyniləşdirilir.

Şagirdlərin biliyi mənimsəmə prosesi necə gedir, müəllimin verdiyi bilik onların beynində necə həkk olunur? Keçən əsrin ortalarında görkəmli psixoloq P.Y. Qalperin bu suala cavab vermişdir. Qalperinə görə, insanlar hər bir əqli fəaliyyəti mərhələlər üzrə öyrənir. Birinci mərhələdə insanlar onun üçün yeni olan fəaliyyətə istiqamət götürür, baxır ki, o, hansı əməliyyatlardan ibarətdir. İkinci mərhələdəisə o, bu əməliyyatı yerinə yetirməyi sınaqdan keçirir, bu zaman hər bir addımının düzgünlüyünü yoxlayır.

Bununla əlaqədar olaraq Qalperin əqli fəaliyyəti aşağıdakı mərhələlər üzrə yerinə yetirməyi tövsiyə edir:

-şagirdləri yeni fəaliyyətə istiqamətləndirmək;

-fəaliyyətin maddi (maddiləşmiş) yerinə yetirilməsi;

-daxili planda fəaliyyət.

Müəllimlər üçün Qalperinin aşağıdakı tələbi daha çox mühümdür: Əgər göstərilən mərhələlərdən birini şagird mənimsəyə bilməyibsə, onda onu əvvəlki mərhələyə qaytarmaq lazımdır.

Nəzərə alınmalıdır ki, ikinci mər-

hələdən üçüncü mərhələyə keçid (daxili planda fəaliyyət) heç də asan deyildir. Qalperin onu yerinə yetirmək üçün əlavə mərhələlər göstərir: xarici nitq və daxili nitq (öz-özünə nitq).

Qalperin nəzəriyyəsi indi hamıya məlumdur. Əgər kimsə nəyə görəsə, onu bilmirsə, Qalperinin “Diqqətin təcrübi formalaşması” kitabını oxumalıdır.

Alqoritmləri öyrənərkən çox rahat və sadə şəkildə Qalperinin nəzəriyyəsi istifadə olunur. Məsələn, $y = ax^2 + bx + c$ funksiyasının qrafikini qurmaq üçün aşağıdakılar lazımdır:

a) Parabolanın təpə nöqtəsinin absisini $x_0 = - b/2a$ düsturu ilə tapmaq;

b) Parabolanın təpə nöqtəsinin $y_0$ ordinatını $y_0 = - b^2-4ac/4a$ , ya da $y_0 = ax_0^2 + bx_0 + c$ düsturu ilə tapmaq olar;

c) Koordinat müstəvisində parabolanın M ($x_0$ $y_0$) təpə nöqtəsini qurmaq;

d) $y = ax^2$ parabolasını $\vec{OM}$ vektoru qədər paralel köçürmək.

Belə bir qurma nümunəsini biz bu və ya digər üsulla şagirdin görüş sahəsinə yerləşdiririk və nəticədə Qalperinin dili ilə desək, fəaliyyətin istiqamətlənmiş əsası alınır. Elə bu birinci mərhələ əqli fəaliyyətin formalaşması mərhələsi – orientirləmə mərhələsidir. Alqoritmlə bu adi praktik işi düşünərkən, hətta fikirləşmək olar ki, Qalperin yeni bir şey kəşf etməyib. Əslində isə Qalperinin bu elmi nailiyyəti kəşfdir, belə ki, bu prosedura adamda yalnız alqoritmin mənimsənilməsi fəaliyyəti deyil, istənilən əqli fəaliyyətin formalaşmasının xüsusiyyətlərinə uyğundur. P.Y.Qalperinin nəzəriyyəsindən istifadə yalnız alqoritmlərin tədrisinin texnoloji prosesini yox, həm də tərif və teoremlərin texnoloji prosesini qurmağa imkan verir.

Qeyd edək ki, biz istənilən təsiri avtomatizmə çatdırmağa çalışmırıq. Əgər məqsədimiz hər hansı fəaliyyət haqqında bilik verməkdən ibarətdirsə, onda iş orientirləməyə qədər gedib çıxır: əgər məqsəd bu fəaliyyəti yerinə yetirmək bacarığıdırsa, onda iş maddiləşməyə gedib çıxır, məqsəd yalnız vərdiş yaratmaqdırsa, onda interiozasiyanı özündə ehtiva edən tam emal işi aparılır.

Məktəb təhsilində P.Y.Qalperinin nəzəriyyəsindən istifadənin bəzi çətinlikləri də vardır. Hər şeydən əvvəl, bu onunla əlaqədardır ki, bu üsulla materialın öyrənilməsinə çox vaxt gedir, ona görə də onu hər bir öyrənilən alqoritm üçün tam həcmdə istifadə etmək olmur. Bundan başqa şagirdlər arasında elə uşaqlar vardır ki, əqli fəaliyyətin formalaşması mərhələlərinin üstündən keçir. Ona görə də, Qalperinin nəzəriyyəsindən tam həcmdə istifadə etmək pedaqoji cəhətdən təsdiq edilməmiş olardı. Lakin bu nəzəriyyəni, əvvəla, xüsusi hallarda, ikincisi isə biliklərin korrektə edilməsində istifadə etmək çəqsədəuyğundur.

***Rəyçi: prof. A.Adıgözəlov***

## İstifadə edilmiş ədəbiyyat

1. Левитас Г. Методика преподавания математики в основной школе. Астрахан, 2009.

2. Болтянский В. Математические методы оптимального управление. Москва: изд. “Наука”, 1969.

3. Столяр А. Методы обучения математики. Минск:Высшая школа, 1966.

**С.Гасанов**

**Формирование умственной активности**

**Резюме**

В данной работе описывается процесс усвоения знаний учениками. С этой целью, на основании теории выдающегося психолога П.У. Гальперина исследуются этапы выполнения умственной деятельности.

**S.Hassanov**

**The formation of intellectual activity**

**Summary**

This paper describes the process of digestion of knowledge by pupils. To that end execution steps of mental activities are investigated in accordance with the theory of the prominent psychologist P.U. Halperin.



# MƏKTƏBİN İDARƏ EDİLMƏSİ MƏSƏLƏLƏRİ

**Nərminə Gündüzlü,**
***Bakı şəhəri, 5 nömrəli tam orta məktəbin direktoru***

***Açar sözlər:*** *idarəetmə, aktual məsələ, sistem, innovasiya, kreativ, lider, peşəkar, səriştə.*

***Ключевые слова:*** *менеджмент, актуальный вопрос, система, инновация, креативный, лидер, профессиональ, компетентность.*

***Key words:*** *management, urgent issue, system, innovation, creativity, leadership, professional, competence.*

Təhsilin məzmunun, təhsilin idarəetmə sisteminin və təhsil infrastrukturunun qabaqcıl beynəlxalq təcrübəyə və Azərbaycanın inkişaf konsepsiyasına uyğun yenidən qurulması təhsil orqanlarını, hətta ayrı-ayrı məktəbləri düşündürən ən aktual məsələlərdəndir. Məktəbin idarə edilməsinin təşkilati-metodik məsələləri özündə bir çox fəaliyyət işlərini birləşdirərək sistemli səciyyə daşımaqla yanaşı, həm də daim aktuallıq kəsb edir. Burada metodik işə rəhbərlik məktəbin idarə edilməsinin mühüm sahələrindən biridir. Təcrübə göstərir ki, məktəbdə müəllimlərlə metodik işin təşkili idarəetmənin ən çətin, mürəkkəb, enerji tələb edən yeni innovasiyalarla müşayiət olunan bir proses kimi çıxış edir.

Ona görə də məktəb rəhbərinin metodik işin məqsədi, formaları ilə bağlı pedaqoji taktları mükəmməl bilməsi çox zəruri məsələlərdəndir.

Elmi-pedaqoji ədəbiyyatda qeyd olunan müddəalara uyğun olaraq məktəbdə metodik işin məqsədi reallaşdırıldıqda aşağıdakı əməli işlər önə çəkilir:

- Müəllimlərin pedaqoji-metodik hazırlığını yüksəltmək;
- Müəllimləri özünütəhsilə və yaradıcı fəaliyyətə cəlb etmək;
- Müəllimlərin ixtisasının artırılması və peşə ustalıqlarının yüksəldilməsi üçün şərait yaratmaq.

Məktəbdə metodik işin məqsədinə aid olan bu istiqamətlər üzrə kollektivimizdə kifayət qədər əməli işlər görülsə də, hələlik gözlənilən nəticələri qazanmaq üçün pedaqoji fəaliyyətlə metodik hazırlığını yüksəldilməsi, özünün səriştə və peşəkarlığının inkişaf etdirilməsi müəllimin daim ehtiyacı olduğu problemlərdəndir.

Təcrübə göstərir ki, metodik işin məzmunu haqqında müəllimlərin təsəvvürlərinin genişləndirilməsinə daima ehtiyac duyulur. Qeyd olunan məsələ ilə əlaqədar pedaqoji kollektivdə aydınlıq yaratmaq məqsədilə bir sıra tədbirlərin reallaşdırılması qarşıda bir vəzifə kimi durur.

İlk növbədə elmi-pedaqoji yeniliklərin öyrənilməsinə ardıcıl diqqət yetirilməlidir. Həmçinin vaxtaşırı yeni nəşr olunmuş dərslik və ya metodik vəsaitlərin, jurnal və qəzet məqalələrinin müzakirəsi keçirilməlidir. Məhz bunlar nəzərə alınaraq, pedaqoji kollektivimizin yaradıcı müəllimləri müxtəlif mövzularda məqalələrlə metodik jurnal və qəzetlərdə çap olunurlar.

Aydın məsələdir ki, Təhsil Nazirliyinin təlimatlarının, metodik tövsiyələrin öyrənilməsi və tətbiqi, müəllimlərin özünün təhsilə cəlb edilməsi, həmçinin müəllimlərin tədris

planları və təhsil proqramları (kurikulumları) ilə yaxından tanışlığı; onların tədqiqat işlərinə cəlb edilməsi; müxtəlif elmi-metodik konfranslar, müsabiqələrdə ("Ən yaxşı müəllim", "Ən yaxşı məktəb" və s.) iştirakı təcrübədə yeni texnologiya, metod və formaların sınaqdan keçirilməsi və b. məktəbdə təhsilin keyfiyyətinin yüksəldilməsinə, şagird şəxsiyyətinin inkişafına müsbət təsir göstərir. Onu günün vacib vəzifəsinə keçirir.

Məktəbdə tədris olunan fənlərin kurikulumlar üzrə metodik işlərin aparılmasının düzgün istiqamətləndirilməsi rəhbərliyin iş prinsiplərinə daxildir. Düzdür, hər bir müəllim tədris etdiyi fənnin təhsil proqramı (kurikulumu) ilə əlaqədar müvafiq treninqdən keçərək sertifikat almışdır. Ancaq fənnin təliminin məzmununa aid olan ümumi təlim nəticələri; məzmun xətləri, məzmun xətləri üzrə nəticələr; fəaliyyət xətləri; məzmun standartları, fəndaxili və fənlərarası inteqrasiya, təlim strategiyaları, şagird nailiyyətlərinin qiymətləndirilməsi kimi kurikulumun məzmununu əks etdirən anlayışların mahiyyətini dərk etməyə, onlardan səmərəli faydalanmağa kömək edən metodik işlərin fasiləsiz təşkilinə həmişə ardıcıl fikir verilməlidir.

Məktəbin metodik işin fərdi və kollektiv formaları ilə əlaqədar geniş tədbirlər planı vardır. Bu istiqamətdə görülən işlər pedaqoji kollektivin üzvlərinin elmi-nəzəri və metodiki hazırlığının yüksəldilməsinə kömək edir.

Bu prosesdə nəzərə alınır ki, xüsusi plan əsasında fəaliyyəti tənzimlənən istər ibtidai siniflər, istər fənlər üzrə və eləcə də sinif rəhbərlərinin metod-birləşmələri kollektiv metodik iş formalarının optimallaşdırılmasına, pedaqoji əməkdaşlığın yaxşılaşmasında özünü başlıca vasitə kimi göstərir və metodik işi tənzimləyir.

Məktəbin idarəolunmasında - direktorun peşə standartı ilə əlaqədar dünyanın ən yaxşı təhsil sistemlərindən biri olan Avstraliya təcrübəsi inteqrasiya baxımından daha çox diqqəti cəlb edir. Bu baxımdan məktəb direktorunun fəaliyyətinin iki böyük sahəyə ayrılması lazım sayılır:

a) Liderlik-özündə müəyyən missiyaları, məqsədləri, məktəbin dəyərlərini təcəssüm etdirən rəhbərlik;

b) Menecment-məktəbin cari fəaliyyətinin təşkilini nəzərdə tutaraq, müəllimlərin dərslərinin yüksək səviyyədə qurulması, müxtəlif resurslardan istifadə, valideynlər və ictimaiyyətlə işə nəzarət.

Artıq bütün dünyada qəbul edilmişdir ki, qloballaşma şəraitində iqtisadiyyat və cəmiyyət zəminində, sürətlə dəyişən dünyada bütün insanlar daha çox bir-biri ilə bağlı və eyni zamanda asılı vəziyyətdə olurlar. Bu cür yanaşmada XXI əsrdə təhsil uğurlu vətəndaş olmaq üçün bütün insanlarda bilik, anlama, bacarıq və dəyərlərin formalaşmasında əsas və vacib yer tutur. Məktəb direktoru idarəetmənin məhz bu kontekstdə həyata keçirilməsinə nail olmağa səy etməlidir.

Bir sıra ölkələrin təcrübəsində lider direktor üçün üç tələb irəli sürülür:

- Təhsilin dəyər və məqsədlərinin dərk edilməsi;
- Peşəkar biliklərinin yüksək səviyyədə olmasına səy edilməsi;
- Şəxsi keyfiyyətlər, sosial bacarıq və şəxsiyyətlərarası ünsiyyət vərdişlərinin etik normalar səviyyəsinə qaldırılması.

Bu məqsədlə qeyd olunan tələblərin beş əsas sahədə peşəkarlıqla həyata keçirilməsi də tövsiyə edilir:

- Tədris prosesinə düzgün rəhbərliyin təmin edilməsi;
- Özünün və tabeliyində olanların peşəkarlıq səviyyəsinin yüksəldilməsi;
- İnnovasiyaların tətbiqi və liderlik məktəbinin təkmilləşdirilməsi;
- Məktəbin idarəolunmasında liderliyə nail olunması;

• Məktəbin idarəolunması işinə ictimaiyyətin cəlb edilməsi.

Hazırda idarəetmədə yeni yanaşmaların tətbiqinə diqqət artırılması öncül məsələlərdən biridir. Tədris prosesinə rəhbərlik, ilk növbədə idrak fəaliyyətinin təşkili və idarəolunması metodlarının məcmusu sayılan fəal təlimin reallaşması ilə şərtlənir. Məktəb direktorunun özünün və kollektivdə çalışan müəllimlərin peşəkar inkişafının göstəricisi kimi fəal təlim üçün səciyyəvi olan bir sıra cəhətlərin pedaqoji prosesdə həllinə çalışılması uğurlu nəticələr verir.

Bunlar, əsasən, müəllim tərəfindən şüurlu surətdə idrakın inkişafını diqqət mərkəzində saxlaması; problemin həlli prosesində şagirdlərin fəal tədqiqatçı mövqeyinin stimullaşdırılması; şagirdlər üçün yeni və zəruri olan biliklərin müstəqil kəşfi, əldə edilməsi və mənimsənilməsinə şəraitin yaradılmasıdır.

Aparılan müşahidələr göstərir ki, yeni yanaşmanın tətbiqi şagirdlərin yaddaşının təkcə yeni biliklərlə zənginləşdirilməsinə deyil, eyni zamanda təfəkkürün daim inkişaf etdirilməsi əsasında daha çox öyrənməyə, şəxsi keyfiyyət və qabiliyyətlərin qazanılmasına səbəb olur. Məktəbin idarə olunmasında pedaqoji innovasiyaya, mövcud yeniliklərdən istifadənin elmi əsaslarına da önəm verilməlidir. “İnnovasiya” latın sözü olub mənası “in”- daxili, “novasiya”- yenilik deməkdir. Pedaqoji innovasiya dedikdə, təhsil sistemində baş vermiş yeniliklər başa düşülür. Pedaqoji ədəbiyyatda bu anlayış haqqında qeyd edilir: “Pedaqoji prosesin innovasiyası, başlıca olaraq, ümumən pedaqoji sistemdə, təhsil müəssisələrində, pedaqoji nəzəriyyələrdə, müəllim və şagirddə, pedaqoji texnologiyalarda, təlim-tərbiyənin məzmununda, forma, üsul və vasitələrində, idarəetmədə, məqsəd və nəticələrdə gedir”.

Azərbaycan təhsilində uğurla həyata keçirilən islahatlar prosesində yeni konsepsiyalar, məzmun standartları, inteqrativ fənlər, təhsil texnologiyaları, qiymətləndirmə mexanizmləri, təlim vasitələri, yeni dərslik və dərs vasitələri yaranmışdır. Bütün bunlar təhsildə yeni nailiyyətlərin qazanılmasına yönəlmiş innovasiyalardır.

Pedaqoji sistem kimi innovasiyaları hazırlayan təhsil işçiləri innovatorlar adlanırlar.

Təhsil innovasiyalarının idarəolunması məktəb direktorunun səriştə və peşəkarlığı ilə çox bağlıdır. Burada menecmentlik bacarığı da mühüm əhəmiyyət kəsb edir. Açıq etiraf etməliyik ki, hazırda insan fəaliyyətinin bütün sahələrində innovasiyalardan geniş istifadə olunur. Bəşəriyyətin inkişafı məhz innovasiyalar hesabına mümkün olmuşdur. Son 20 ildə İKT-nin sürətli inkişafı çoxsaylı innovasiyaların yaranması, onların qlobal bazara çıxış imkanlarının artması, bütün tətbiq olunan sahələrin, o cümlədən təhsilin inkişafına səbəb olmuşdur. Müasir təhsildə qlobal proseslər gedir. Bu səbəbdən təhsildə fasiləsiz olaraq baş verən modernləşmə yüksək keyfiyyətin qazanılmasının təmin olunmasına yönəlmişdir.

İnnovasiyaların idarəolunması baxımından hər bir təhsil müəssisəsinin yeniləşmə prosesində üç mərhələdən keçməsi məqsədəuyğun sayılır:

• Təşəkkül (yeni təhsil müəssisəsinin, yeni kollektivin yaranması və ya kollektivin böyük hissəsinin təzələnməsi);

• Fəaliyyət (təlim-tərbiyə prosesinin ənənəvi, stabil proqram və pedaqoji texnologiyalar əsasında işinin təşkili mərhələsi);

• İnkişafı (təlim-tərbiyənin köhnə məzmunu və mövcud pedaqoji texnologiyalar yeni sosial-iqtisadi tələblərə cavab vermədiyindən yeni məzmun, forma və texnologiyaların yaranması və tətbiqi mərhələsi).

“Azərbaycan 2020: gələcəyə baxış” İnkişaf Konsepsiyasında elmi potensialın və

innovasiya fəaliyyətinin dəstəklənməsi prioritet kimi nəzərdə tutulmuşdur.

Təhsildə innovasiya texnologiyalarının tətbiqi kreativ pedaqoji təfəkkürə əsaslanır.

Kreativ pedaqoji təfəkkür dedikdə, öyrənmə prosesində fərdin yaradıcılıq qabiliyyəti, prinsipial yeni ideyaların yaradılması və qəbul edilməsinə hazır olmağı xarakterizə edən problemləri həll etmək bacarığı başa düşülür.

Amerikan psixoloqu Abraham Maslou bu barədə deyir: "Kreativlik hər bir insanda anadangəlmə mövcud olan, lakin bir çoxları tərəfindən düzgün tərbiyənin, sosial təcrübənin və təhsilin olmadığından itirilən daxili istedaddır". Məktəbdə oxuyan şagirdlər kreativliyi yalnız tədris prosesində üzləşdikləri çətinliklərin fərasət və zirəkliklə həll yolunu tapmaqla nümayiş etdirə bilərlər.

Metodist alimlər təhsildə keyfiyyətin yüksəldilməsində və idarəetmənin aşağıdakı təşkilati mexanizminə daxil olan komponentlərinin tətbiqini də vacib sayırlar.

- Sosial sifarişçilərdən informasiyaların toplanması (Təhsildə maraqlı olan bütün tərəflərin tələblərinin, arzu və istəklərinin öyrənilməsi).
- Sosial sifarişin formalaşdırılması (Məktəb direktoru-müxtəlif baxışlara malik sosial sifarişləri təhlil etməklə, onlarla məsləhətləşmələr aparmalı).
- Məktəbin üstün tutulacaq vəzifəsinin müəyyənləşdirilməsi.
- Hər bir şagirdin əqli fəaliyyəti ilə bağlı diaqnostik metodikanın hazırlanması və tətbiq edilməsi.
- Şagirdlərin təhsil nəticələrinin proqnozlaşdırılması.
- Qazanılan nəticələrin fərqli məqsədlərlə müqayisə edilməsi və keyfiyyətin müəyyənləşdirilməsi.

Mövzu ilə bağlı onu da qeyd etməyi lazım bilirik ki, məktəbin idarə edilməsində aktuallıq kəsb edən, elmi-pedaqoji axtarışlar aparmağı zəruri edən məsələlər çoxdur, həm də mürəkkəb və çoxcəhətlidir. Cəmiyyətdə sosial-iqtisadi inkişaf artdıqca, məktəbin idarə edilməsi keyfiyyətcə yeni məzmun kəsb edir. Ona görə də, məktəb direktoru gündəlik fəaliyyətində kreativlik nümayiş etdirməklə idarəetmədə qabaqlayıcı mövqe tutmağa nail olmaq proseslərini həmişə əsas tutmalıdır.

***Rəyçi: dos. N.Nəcəfov***

## İstifadə edilmiş ədəbiyyat

1. İsmixanov M. və b. Məktəbin idarə edilməsi. Bakı, 2012.
2. Veysova Z. Fəal interaktiv təlim. Bakı, 2007.
3. Qasımova L., Mahmudova R. Pedaqogika. Bakı, 2003.
4. Məmmədzadə R. Təhsildə keyfiyyət aparıcı istiqamətlərdən biri kimi. Bakı, 2010.

**Н.Гюдюзлю**

**Некоторые вопросы управления школой**

**Резюме**

В статье теоретически и практически прокомментировано научно-педагогические направлении методических работ предусматривающие управление образования, важные аспекты деятельности директора школы, обращены на образцы что были признаны как лучшая работа в мире в этой области.

**N.Gunduzlu**

**The issues of school management**

**Summary**

The paper theoretically and practically commented on scientific and pedagogical direction of teaching work providing education management, important aspects of activity of the school director, addressed to the samples that have been recognized as the best job in the world in this field.

# TƏHSİLDƏ FƏNDAXİLİ İNTEQRASİYA ANLAYIŞININ İNKİŞAF YOLU



**Əli Hüseynov,**
***pedaqogika üzrə elmlər doktoru, professor, əməkdar müəllim***
**Sevinc Mehdiyeva,**
***fəlsəfə proqramı üzrə doktorant***

***Açar sözlər:*** *fəndaxili inteqrasiya, tarixi zaman, təhsilin məzmunu, təhsil proqramları, didaktika, təhsil islahatı.*

***Ключевые слова:*** *внутрипредметная интеграция, историческое время, содержание образования, учебные программы, дидактика, реформы образования.*

***Key words:*** *intradisciplinary, historical time, content of education, training programs, didactics, education reforms.*

Təhsildə inteqrasiya yeni məsələ deyildir. Bu yanaşmaya görə şagird məktəbdə tədris olunan fənlər vasitəsilə müxtəlif sahələr üzrə seçilmiş məzmunu öyrənməli və tətbiq etməyi bacarmalıdır. Nəzərə almaq lazımdır ki, biologiya fənninin məzmunu yüksək dərəcədə inteqrativdir. Buna görə də fəndaxili inteqrasiya prinsipi gözlənilmədən gedişatı anlamaq mümkün deyildir. Bu prinsipə riayət olunduqda fənnin hər bir mərhələsində fənlərarası inteqrasiyaya ehtiyac duyulur.

Bir neçə əsrdir ki, təbiət elmlərinin diferensiasiyası dövrü davam edir. Belə ki, yalnız kimyaçılar maddələrin tərkibini, bioloqlar canlıların morfologiyası təsnifatını, geoloqlar yer qabığını və s. tədqiq edirlər. Diferensiasiya təbiət elmlərini ayırmış müəyyən baryerləri yaradaraq, onların proqressiv inkişafını ləngitmişdir. Zaman-zaman diferensial yanaşmalar hissələrə bölünməni, ayrılmaları tənzimlədiyi kimi, inteqrasiya prosesləri də bütövləşmələrin, tamamlanmaların nəticəsi kimi meydana çıxmışdır.

İnteqrasiya termini XVII əsrdə riyazi anlayış kimi formalaşmışdır. XVIII-XIX əsrlərdə bu termin riyaziyyatın hüdudlarından çıxaraq universal ümumi elmi kateqoriya statusunu əldə etdi. İnteqrasiya anlayışı əsrlər boyu təhsilin məzmununda birləşmə, bağlılıq, sintez mənasını verən müxtəlif terminlərlə adlandırılmışdır. Didaktikada "kompleks metodu", "fənlərarası əlaqə", "korrelyasiya" və nəhayət, "inteqrasiya" adı öz əksini tapır. "İnteqrasiya" anlayışı ilə "sintez" anlayışını birləşdirmək cəhdləri də olmuşdur. Ancaq bir sıra tədqiqatçılar hesab edirlər ki, sintez inteqrasiya prosesinin son mərhələsi ola bilər, lakin nəticəsi ola bilməz. İnteqrasiya problemi məşhur pedaqoqların: Y.A.Komenski, İ.F.Herbart, K.D.Uşinski və başqalarının pedaqoji fikirlərində öz əksini tapmışdır. Onlar təhsilin məzmununda inteqrasiyanı ehtiyac kimi görürdülər. Dünyanın vahid obrazını tədris prosesində əks etdirmək, tədqiqat obyektləri və hadisələri zəncir kimi birləşdirmək və bunları şəxsiyyətin harmonik inkişafında zərurət hesab edirdilər. Y.A.Komenski müxtəlif biliklərin ümumi bir kökdən tədricən inkişaf edərək və biliklərin ardıcıllıqla fasiləsiz əlaqədə təqdim edilməsini vurğulayırdı. O

yazırdı: "Daimi əlaqədə bir-biri ilə münasibətdə olan hər şey eyni əlaqədə də tədris olunmalıdır".

Pedaqoji prosesdə inteqrasiyanın vacibliyini ilk dəfə vurğulayan İ.F.Herbart olmuşdur. Herbart bir-biri ilə əlaqəsi olmayan fənlərə daxil olan mövzuların birləşdirilməsi ideyasını irəli sürmüşdür. O, təlimi dörd hissəyə ayırmışdır: aydınlıq, assosiasiya, sistem və metod. Birinci iki pillə biliyin əldə edilməsinə yönəldilmişdisə, iki son mərhələ isə əlaqənin yaradılması, yeni biliklərə yiyələnmək üçün körpü rolu oynayırdı. Sonralar Herbartın ideyası əsası C.Dyui tərəfindən qoyulmuş proqressiv təhsil hərəkatının mahiyyətinə çevrildi. C.Dyui deyirdi: "Bütün elmlər mənbəyini dünyadan alır. İnsanlar vahid dünyanın müxtəlif sahələrini öyrənirlər. Dünya isə məkan, zaman və canlı, cansız varlıqların vəhdətidir. Bu dünyada həyatını düzgün təşkil etməyə qadir olacaq insanların təhsili bu dünya ilə əlaqəli şəkildə həyata keçirilməlidir" (1).

Biologiya fənninin tarixən birləşdiril-miş kurs tərkibində və sərbəst predmet kimi öyrənilməsinə dəfələrlə cəhdlər edilmişdir. Biologiya tədrisinin tarixi V.F.Zuyevin dərsliyi ilə başlayır. O, məktəb fənninin məzmununda təbiət, bitki və heyvanlar arasında mövcud daxili əlaqələrin təməlini qoydu və fəndaxili əlaqənin əsasında təbiyyat dərsliyini yaratdı. Dərslik üç şöbədən ibarət idi: qazıntılar aləmi, cücərtilər aləmi, heyvanlar aləmi. V.F.Zuyev dərsliyində elmi biliklərlə təcrübəni əlaqələndirmiş, orqanizmləri ətraf mühitlə qarşılıqlı əlaqədə öyrədirdi.

1860-cı ildə alman alimi E.Rosmesler isə təbiət elmlərində inteqrasiya ideyasını irəli sürmüşdür. O hesab edirdi ki, təbiətin tamlığı, bütövlüyü haqda dünyagörüşünü formalaşdırmaq üçün təbiət elmləri bir-biri ilə əlaqədə öyrədilməlidir. Rusiyanın görkəmli pedaqoqu A.Y.Herdə görə ibtidai məktəblərdə təbiət haqqında biliklər ayrı-ayrı fənlərdə deyil, ancaq bir fəndə tədris olunmalıdır. A.Y.Herd ibtidai məktəblər üçün "Cansız təbiət" adlı dərslik yazmışdır. Fənnin məzmununda torpaq, ilin fəsilləri, bitki, heyvan və insan haqqında interaktiv biliklər əks olunurdu. Bioloji bilikləri metodoloji və nəzəri baxımdan ümumiləşdirmək alman müəllimi F.Yunqe tərəfindən həyata keçirilmişdir. O, təbiət elminin səkkiz anlayışını (həyat tərzi; canlıların quruluşu və yaşayış mühitinə uyğunlaşmaq; hər bir canlı varlıq tamlığın bir hissəsidir; sadədən mürəkkəbə doğru inkişaf; orqanizmlərin adaptasiyası, diferensiasiyası və inteqrasiyası; formalaşma prosesində qarşılıqlı təsir; orqanların korrelyasiyası; təbiətin iqtisadiyyatı, vaxtda qənaətçilik) emprik ümumiləşdirmənin ətrafında öyrədilməsini vacib sayırdı. F.Yunqeni təbiət elminin tarixində inteqrasiyanı tətbiq edən ilk tədqiqatçı hesab etmək olar. Onun ideyasını rus pedaqoqu D.N.Kayqorodov reallaşdırmaq istəmişdir. O, botanika və zoologiya fənnini ləğv edərək təbiyyat kursunda birləşdirmişdi.

XX əsrin başlanğıcında inteqrativ təhsilin yaradılması yolunda çox maraqlı axtarışlar olmuşdur. 1910-1915-ci illərdə "Moskva şəhərinin müəllimlər dərnəyi" tərəfindən proqram hazırlanmışdı. İnteraktiv xarakter daşıyan bu proqram yalnız ibtidai siniflərdə tətbiq edilmişdir. Tədris materialının inteqrasiyasına böyük diqqət 1915-1916-cı illərdə də olmuşdur. O illərdə "Vətənşünaslıq" fənninin tədrisi əsas götürülürdü. Fənnin əsas məzmunu təbiət, heyvanlar aləmi, insan haqqında materialların məcmusundan ibarət idi. Birləşdirilmiş materiallar konsentrik prinsipə əsaslanırdı. Qeyd edək ki, təlimdə inteqrasiya ilk dəfə Böyük Britaniyada, daha sonra Avropa və ABŞ-da reallaşmışdır. Xarici mütəxəssislər

hesab edirdilər ki, təhsildə inteqrasiya təlim-tədris prosesinə, şəxsiyyətin hərtərəfli inkişafına, kadr hazırlığına müsbət təsir göstərir.

İnteqrasiyanın inkişaf tarixi pedaqoji nəzəriyyədə üç müxtəlif mərhələyə aid edilir. Birinci mərhələ - XX əsrin 20-ci illərinin sonu: təhsildə inteqrasiya ideyalarının inkişafına baxmayaraq, inteqrasiya termini alimlər tərəfindən tədqiq olunmurdu. 1927-ci ildə hazırlanmış tədris proqramları kompleksliyi ilə fərqlənirdi. Bu dövrdə inteqrasiya tədris proqramlarının hazırlanmasına yeni yanaşmada öz əksini tapdı. Bu yanaşma “hərtərəfli yanaşma” adını aldı. Kompleks proqramlarda bilik və bacarıq üç əsas ideya ətrafında formalaşırdı: təbiət, cəmiyyət, əmək. Əmək bölməsi istehsalat prosesləri haqqında biliklər, digər bölmələr (təbiət, cəmiyyət) isə biologiya, kimya, fizika, tarix və s. elmi biliklər yığımından ibarət idi. Kompleks proqrama əsasən botanika və zoologiya kursları ləğv edilmiş, tədris materialları ümumi mövzulara birləşdirilmişdir. Botanika əvəzinə kənd təsərrüfatı istehsalatı öyrədilirdi.VII sinifdə “İmperializm və fəhlə sinfinin mübarizəsi” mövzusunun tədrisində təkamül təlimi, VIII sinifdə “Torpağın xüsusiyyətləri və həyati proseslərin fiziki-kimyəvi əsasları”, IX sinifdə “Təkamül təlimi” öyrədilirdi (2). Kompleks proqramlar müəllimlər tərəfindən tənqidə məruz qaldı. Onların fikrinə görə, həddən artıq kompleksləşdirmə fənnin tam inkarına gətirib çıxardı. Hərtərəfli yanaşmanın əsas ideyası təhsil ətrafında bilik və bacarıqların birləşməsi idi. Bu proqramın çatışmazlıqları onun ideyasında deyil, reallaşdırılmasında idi, çünki vahid sistemi yaradan bu kompleksin arasında məntiqi əlaqələr qurulmamışdı. Kompleks sistemin tətbiqinə tədris prosesində inteqrasiya əlaqələrinin qurulmasının birinci cəhdi kimi baxmaq olardı.

1925-1927-ci illərdə milli respublikaların Xalq Maarif Komissarlıqlarına ümumdövlət proqramlarını dəyişdirib onlara yerli materiallar daxil etmək ixtiyarı verilir və kompleks proqramlar nəşr edilir. Biologiyanın tədrisi metodikası öz inkişafını ölkəmizdə keçmiş Sovet hakimiyyəti qurulduqdan sonra tapmışdır. Qeyd edək ki, ana dilində Camo Cəbrayılbəylinin “Təbiətə ilk addım”, “Təbiəti öyrən”, “Müxtəsər nəbatat”, ”Heyvanat dərsləri” nəşr olunur. Dərsliklər kompleks proqram əsasında hazırlanmışdır. Bu kitablar 1923-cü ildən 1929-cu ilə qədər məktəblərdə tədris olunurdu. Növbəti illərdə rus dilində yazılmış kitabların tərcüməsindən istifadə edilirdi.

İkinci mərhələ - XX əsrin 50-80-ci illəri: inteqrasiya fəndaxili və fənlərarası əlaqə formasında çıxış edir. Fənlərarası əlaqə ideyasının özü, tədris materialının məzmununda təbiətin bütövlüyünün əks edilməsi yollarının axtarışı gedişatında yarandı. 1931-1932-ci ildə bioloji təhsilin inkişafında yeni mərhələ başlandı. Təbiətşünaslıq üzrə kursların növbəti sistemi tədris planına daxil edilmişdir: təbiət haqqında elementar məlumatlar (II sinif), cansız təbiət (IV sinif), botanika (V-VI siniflər), zoologiya (VI-VII siniflər), anatomiya və fiziologiya (VIII sinif), təkamül təlimi (IX sinif), mineralogiya və geologiya (X sinif). Təklif olunan bu sistem A.Y.Herdin qurduğu sistemə uyğun gəlirdi. Məhz o, ilk dəfə bitki və heyvanların təkamül əsasında öyrənilməsini nəzərdə tutan kurs tərtib etmişdir.

30-cu illərdən 60-cı illərə qədər olan dövr biologiya fənninin məzmununun təkmilləşdirilməsi yollarının axtarışı ilə səciyyələnir. Tədqiqatçıların əksəriyyəti hesab edir ki, inteqrasiyaya didaktik prinsip kimi 60-cı illərdə baxılıb. Həmin illərdə biologiyanın tədrisi metodikasında fəndaxili əlaqələr sayəsində əhəmiyyətli materiallar yığılmış və inteqrativ məktəb kursunun qurulmasında onları əks etdirmək cəhdləri

edilmişdir. Bioloji təhsildə inteqrasiya əlamətləri var idi. Bunlardan biri bioloji tədrisin məzmununa ekoloji biliklərin daxil edilməsidir. Məhz 60-cı illərdə məktəb təhsilində təbiəti qoruma aspekti güclənmişdir, belə ki, bu aspekt təbiətin ümummilli mühafizəsi sistemi ilə əlaqədar idi. Beləliklə, biologiya və ekologiya arasında fənlərarası inteqrasiya meydana çıxmışdır. Bioloji təhsilin inteqrasiyasının digər əlaməti yeni fənnin - "Ümumi biologiya"nın yaranması oldu. Bu inteqrasiya cəhdi çox da uğurlu olmadı. Belə ki, ümumi biologiya kursu üzvi aləmin əsas qanunauyğunluqlarına tabe olan, əvvəllər öyrənilmiş faktların sistemləşdirilməsinə əsaslanıb. Deməli, sistemləşdirmə hələ inteqrasiya demək deyil. 1970-ci illərin əvvəlləri məktəb fənlərinin təbiət elmləri silsiləsində biologiya, fizika və kimyanın daha sıx qarşılıqlı əlaqəsinə yönəldilmiş inteqrasiyanın yeni istiqaməti işlənmişdir. 1981-ci ilin "biologiya" tədris proqramı özündə fənlərarası əlaqələri əks etdirmişdir: botanika təbiətşünaslıq və coğrafiya, zoologiya fizika, kimya, riyaziyyat və ümumi biologiya tarixlə əlaqələndirilmişdir. 1960-1980-ci illərdə biologiya kursunda çatışmazlıq onun məzmunun tam olmamasında idi. Kursu təşkil edən fənlər botanika, zoologiya, insan anatomiyası və fiziologiyası, ümumi biologiya bir-birindən təcrid olunmuş, əlaqəsiz, qapanmış formada tədris planında ifadə olunurdu. Bir bioloji fəndən digərinə keçid zamanı daxili ardıcıllığın mövcud olmaması aşkarlanırdı.

1985-ci ildə B.V.Vsesvyatski məktəb biologiya kursunun yeni təhsil konsepsiyasını təklif etmişdir. O, biologiya kursunun yeni sistemində botanikadan sonra heyvan biologiyası, insan biologiyası, ümumi biologiya, həyatın təşkili formaları (növ, populyasiya, biogeosenoz, biosfer) və Yer kürəsində həyatın tarixi inkişafı haqqında bioloji anlayışları ardıcıl surətdə inkişaf etdirmək fikrində idi. Onun fikrinə görə, botanika və zoologiyada morfoloji-sistematik quruluşdan, insan kursunda isə anatomik fizioloji quruluşdan imtina etmək lazımdır. Botanika kursunu bitki biologiyası, zoologiyanı heyvan biologiyası kimi qurmaq, insan anatomiyası və fiziologiyasının əvəzinə insan biologiyasını, yekun kurs kimi isə ümumi biologiyanı daxil etmək lazımdır. Nəticədə, bitkilərin, heyvanların, göbələklərin, bakteriya və virusların, insan həyat fəaliyyəti və bioloji qanunlara həsr olunmuş bölmələri olan vahid biologiya kursu formalaşacaq. Məktəb biologiyasının bütün kursunu əhatə edən və onun daxili bütövlüyünü təmin edən bu bioloji kateqoriyalar olmalıdır: hüceyrə, orqanizm, növ, populyasiya, biogeosenoz, təkamül. Şübhəsiz ki, o dövrlər üçün B.V.Vsesvyatskinin fikirləri yeni idi. Onun bioloji təhsilə dair yanaşması fəndaxili inteqrasiya ilə məhdudlaşırdı. Onun hazırladığı proqramda dünyagörüşün, şəxsiyyətin formalaşmasının təmin edilməsi məsələləri nəzərdə tutulmamışdır. Botanika və zoologiyanın "Canlı aləm" adlı vahid tədris fənnində birləşdirilməsini B.S.Kubantsev də təklif etmişdir. Fənn bitki və heyvanların öyrənilməsində ibtidai formalardan ali formalara doğru ardıcıllığın saxlanılmasını nəzərdə tuturdu. Müəllifin fikrinə görə, botanika və zoologiyanın vahid tədris fənnində birləşdirilməsi, canlıların öyrənilməsində sistemli yanaşma imkanı, təbii sistemlərdə müxtəlif orqanizmlərin qarşılıqlı əlaqələri, planetimizdə həyatın bütövlüyü haqda, təbii biosistemlərin strukturu barədə təsəvvürlərin formalaşmasını əhəmiyyətli dərəcədə təmin edərdi. Pedaqoqlar inteqrasiyanı mövzular arasında mövcud olan əlaqələrin dərk edilməsi, müxtəlif fənlərdə məntiqi əlaqələrin qurulması, tədris materialının ikiləşməsinin aradan qaldırılması, dünyaya baxışın bütöv sistem kimi formalaşma-

sının üstünlüklərini qeyd etmişlər.

1987-ci ildə məktəb biologiya fənni üzrə təkmilləşdirilmiş proqram təklif edilmişdir. Ona uyğun olaraq məktəbdə vahid “Biologiya” kursu tədris olundu. O özündə: bitkilər, bakteriya, göbələklər, şibyələr, heyvanlar, insan və onun sağlamlığı, ümumi biologiya bölmələrini birləşdirmişdir. Proqramda təkamül, sitoloji, ekoloji anlayışların ardıcıl inkişafı hesabına kursun bölmələri arasında varislik əlaqələri gözlənilirdi. Məsələn, hüceyrə haqqında anlayış 6-cı sinifdə bitkidə, 7-ci sinifdə təkhüceyrəli və çoxhüceyrəli heyvanlar bölməsində inkişaf edir, 9-cu sinifdə insan orqanizmi səviyyəsində öyrənilərək biliklər dərinləşir və 11-ci sinifdə genişlənir, bioloji anlayışların və hadisələrin izahı üçün tətbiq edilir.

Rus alimləri A.Q.Xripkova, A.N.Myaqkova, Q.S.Kalinova qeyd edirlər ki, biologiya təlimi inteqrallaşdırılmış proqram əsasında qurulmalıdır. Onların rəhbərliyi ilə təbiət haqqında bütöv təsəvvürün formalaşdırılması zərurəti ilə inteqrativ kurs olan “Təbiətşünaslıq” yaradıldı və 1989-cu ildə məktəb proqramına əlavə olundu (3). A.Q.Xripkova qeyd edir ki, bu kurs sayəsində sistemli yanaşmanı həyata keçirməyə imkan verəcək belə ki, şagirdlər qeyri-üzvi (atomdan planetə qədər) və üzvi (orqanizmdən ekosistemə qədər) sistemlərlə tanış olacaqlar. Onlar həmçinin təklif edirlər ki, inteqrallaşdırılmış proqram nəinki aşağı və orta siniflərdə, eləcə də X-XI siniflərdə tədris olunmalıdır. V.İ.Qorovoyanın fikrincə, təbiət elmlərinin inteqrallaşdırılması insan-təbiət-cəmiyyət kimi bütöv bir sistemi qarşılıqlı formada öyrənilir. İnteqrallaşdırılmış proqramın zəruri olduğunu əsaslandırır. Müəllif inteqrallaşdırılmış təbiətşünaslıq kursuna çox üstünlük verir və belə proqramın həyata keçirilməsinin tərəfdar olduğunu bildirir.

Üçüncü mərhələ - XX əsrin 90–cı illəri bioloji təhsilin yeni mərhələsi, dövlət prioritetlərinin kəskin dəyişiklikləri ilə bağlıdır. Azərbaycan təhsil sistemi 1990-cı illərə qədər sovet təhsil sisteminin tərkibində idi. Tədris planı mövzu başlıqlarından ibarət idi. Kitablar yalnız mərkəzdən yazılıb tətbiq olunurdu. Təhsil sistemində mövcud olan sovet ideologiyasından uzaqlaşmaq bütövlükdə təhsilin məhvinə səbəb ola bilərdi. İslahatların yalnız tədricən həyata keçirilməsi dəyişikliklərin bütövlükdə təhsil sisteminə ciddi zərbə vurmadan tətbiq edilməsinə imkan verə bilərdi. 1991-2001-ci il tarixləri arasında tətbiq olunan fənn proqramı da mövzu başlıqları ilə köhnə sovet proqramını xatırladırdı. Lakin yeni əsrin əvvəllərindən başlayaraq Azərbaycan təhsil sisteminə yeni pedaqoji terminologiya – kurikulum daxil oldu və bununla da ölkənin təhsil sistemində yeni bir mərhələ başlandı. 1999-cu ildə təsdiq olunmuş “Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı” Azərbaycan təhsilinin yeni inkişaf yolunu müəyyənləşdirdi. Azərbaycan hökuməti tərəfindən 30 oktyabr 2006-cı ildə təsdiq olunmuş Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası sənədində təhsilin inteqrativliyi əsas prinsip kimi nəzərdə tutuldu. Ölkəmizdə fənn kurikulumları hazırlanarkən inteqrasiyanın iki növü: fəndaxili və fənlərarası əlaqələr əsas götürüldü. Fənlərarası və fəndaxili əlaqələrin inteqrasiya müstəvisinə gətirilməsi, onun mühüm təhsil prinsiplərindən biri olaraq nəzərə alınmaqla tətbiq olunması məqsədəmüvafiq hesab edildi.

2013-2014-cü tədris ilindən ümumi təhsil pilləsinin ümumi orta təhsil səviyyəsində yeni biologiya kurikulumlarının tətbiqinə başlandı. Yeni kurikulumun tətbiqi ilə biologiya fənninin tədrisinə 6-cı sinifdən başlanır. Biologiya dərsliklərində kurikuluma əsasən 4 məzmun xətti üzrə əsas və alt standartların reallaşdırılması nəzərdə tutulmuşdur. Fəndaxili inteqrasiya nəticəsində

biologiya fənn kurikulumunda canlılar aləmi haqqında biliklər biologiyanın ayrı-ayrı sahələrində (botanika, zoologiya, insan, ümumi biologiya) deyil, canlıların quruluşunun, onlarda baş verən fiziki, kimyəvi, bioloji proseslərin, canlıların bir-biri ilə, ətraf mühitlə qarşılıqlı əlaqəsinin konsentrik prinsipə əsaslanan vəhdətində təqdim edilmişdir.

Kurikulumda ümumi orta təhsil səviyyəsində canlı aləmin yaranması, quruluşu, funksiyaları, təsnifatı, yayılma qanunauyğunluqları, inkişafı və mühafizəsi, onların bir-biri ilə və cansız aləmlə qarşılıqlı əlaqəsi, maddi aləmin vəhdət təşkil etməsi təsbit olunub. Tam orta təhsil səviyyəsində isə şagirdlərdə həyatın əmələ gəlməsi, hüceyrə, üzvi aləmin inkişafı və təkamülü, insanın mənşəyi, genetika və seleksiyanın əsasları, ekologiyanın problemləri və həlli yolları, biotexnologiya, bionika, mikrobiologiya haqqında bilik və bacarıqlar, onun dərkedilməsi və həlli yolları sadədən mürəkkəbə doğru istər mərhələlər, istərsə də siniflər üzrə şaquli və üfüqi inteqrasiya nəzərə alınmaqla təqdim edilir. Bununla da canlılar aləminin və bütövlükdə dünyanın vahid bir sistem kimi qavranılmasına nail olmaq mümkün hesab edilmişdir.

Qeyd edək ki, təhsildə inteqrasiya anlayışı heç də yeni deyil, sadəcə onun tətbiqinə obyektiv və subyektiv səbəblər mane olub. Yeni təhsil islahatının təşəkkül tapdığı müasir dövrdə isə inteqrasiya fənn kurikulumunda bir prinsip, məzmun komponentlərinin biri kimi qəbul edildiyindən biologiya fənninin tədrisində də zəruri bir vəzifə kimi qarşıya qoyulub.

***Rəyçi: prof. Ə.Məmmədov***

## İstifadə edilmiş ədəbiyyat

1. Süleymanova A. Müasir kurikulumlarda yeni təlim yanaşmaların tarixi kökləri.// Kurikulum, 2008, №2.
2. Hüseynov Ə. Biologiya tədrisinin ümumi və xüsusi metodikası. Dərslik. Bakı, 2009, 184 s.
3. Хрипкова А., Мягкова А., Каминова Г. О создании интегрированного курса "Естествознание".// Биология в школе. 1988 г., №5.
4. Хрипкова А., Мягкова А. Создание интегрированного курса - объективная необходимость.// Биология в школе, 1990 г., №1.
5. Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün biologiya fənn kurikulumu. Bakı, 2013, 76 s.
6. Hüseynov Ə. Orta məktəbdə biologiya tədrisinin nəzəri və metodiki əsasları. Bakı, 2000.
7. Зверев И. Интеграция и интегрированный предмет.// Биология в школе, 1991 г., №5.

**А.Гусейнов,**
**С.Мехтиева**

**Пути развития понятия внутридисциплинарной интеграции в образовании**

**Резюме**

В статье были сравнительно проанализированы взгляды педагогов и ученых, относительно внутридисциплинарной интеграции и обосновано, что понятие «интеграция» имеет исторические корни.

**A.Husseinov,**
**S.Mehdiyeva**

**The development of concept of intra-subject integration**

**Summary**

In the article the views of some teachers and scientists regarding intradisciplinary integration were comparatively analyzed and it was substantiated that "integration" concept has historical roots.



# TƏHSİL PROSESİNİN İSTİQAMƏTLƏNDİRİCİSİ VƏ KOORDİNATORU

**Firidə Mustafayeva,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı filialının kafedra müdiri***

***Açar sözlər:*** *tələb, keyfiyyət, peşəkar fəaliyyət, təhsil prosesi.*
***Ключевые слова:*** *требование, качество, профессиональной деятельность, процесс образования.*
***Key words:*** *demand, guality, professional activity, teaching process.*

Təhsilin inkişafı ölkədə əhalinin rifahının yaxşılaşması üçün zəmin yaradır. Təhsil insanlara texnologiyaları çevik mənimsəmək, əmək bazarında layiqli yer tutmaq və ömür boyu əlavə təhsil prosesinə qoşulmaq, sağlam həyat tərzi, ətraf mühitə münasibətdə düzgün mövqe tutmaq imkanı verir. Bu konseptual xarakterli fikirlər ölkə başçısının 24 oktyabr 2013-cü il tarixli sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda təsbit olunmuşdur [2,3].

Müəllim peşəsinin ictimai nüfuzunun artırılması, onun yüksək maddi və mənəvi motivasiyası islahatın uğurla həyata keçirilməsi üçün ən vacib amillərdəndir.

Müəllim məktəbdə, dərsdə həmişə aparıcı sima olmuşdur. Hər bir təhsil sisteminin gücü bu sistemdə fəaliyyət göstərən müəllimlərin peşəkarlığından asılıdır.

Vaxtilə A.İ.Gertsen yazırdı ki, şagirdlərə təkcə müəllimin biliyi deyil, onun şəxsiyyəti də, ruhi keyfiyyətləri də əsaslı təsir göstərir. Doğrudan da, müəllim şəxsiyyəti lazımi səviyyədə formalaşmazsa, cəmiyyətin onun qarşısında qoyduğu sosial sifarişi, öz vəzifə borcunu layiqincə yerinə yetirə bilməz. Müəllim şəxsiyyəti onun pedaqoji əməyinə yeni məna, düzgün istiqamət verir. Müəllim şəxsiyyətinin strukturuna onun əməyinin xarakterini müəyyənləşdirən psixi keyfiyyətləri, qabiliyyətləri, xarakteri və s. aid etmək olar. Hər bir müəllim özündə bu vacib keyfiyyətləri formalaşdırmalıdır. Çünki xalq ən qiymətli xəzinəsini, yəni uşaqlarını ona - müəllimə etibar edir.

Bu qiymətli “xəzinə” isə pedaqoji prosesdə yetişir, püxtələşir. Pedaqoji işin uğurlu alınması üçün müəllimin dözümlü və səbirli olması da zəruri şərtlərdəndir.

Müasir tələblərə cavab verən dərs haqqında düşünən müəllim öyrənənləri elə formada təlim etməlidir ki, hər bir fərdin sərbəst olaraq qloballaşan dünyamızın tələblərinə cavab verən elmi səviyyəsi olsun, texnologiyaları çevik mənimsəmək bacarığına yiyələnsin.

Dünyada baş verən dəyişikliklər və sürətli yeniləşmələr məktəb və təhsil qarşısında yeni, rəngarəng və eyni zamanda mürəkkəb məsələlər qoyur. Kompyuter, audio-video və digər təhsil vasitələrinin geniş vüsət aldığı müasir dövrdə müəllimin rolu dəyişir: o, informasiya aşılayan subyektdən ən səmərəli təhsil fasilitatoru vəzifəsini yerinə yetirən subyektə çevrilir. Bu dəyişmə zamanın tələbidir, inteqrasiya olunduğumuz dünyanın tələbidir, yəqin ki,

bu durum uzun müddət həm milli təhsilimizdə, həm də dünya təhsilində öz yerini saxlayacaqdır. Həmin problemi həyata keçirən adamlar isə valideyn-məktəb-cəmiyyət üçbucağının ən vacib tərəfi olan müəllimlərdir.

Bu günün müəllimi şagirdlərin yaddaşına hazır bilikləri doldurmaq əvəzinə, ilk növbədə, onların müstəqil fəaliyyəti, nəticələrin onların özləri tərəfindən qazanılması vərdişlərini də aşılamalıdır.

Təhsil müəssisələrində də, cəmiyyətdə də müəllim daim diqqət mərkəzində olan insanlardandır. Ona görə də o, işinin ustası kimi formalaşmaq üçün müntəzəm olaraq öz üzərində çalışmalıdır. Əlavə təhsil məsələsinin müəllim üçün başlıca amal, məqsəd, iş metodu olduğu unudulmamalıdır. Öyrənmək hər zaman lazımdır. Başqalarına nəyisə mənimsətmək və öyrətmək üçün müəllim, ilk növbədə, savadlı və müasir təhsil problemlərindən baş çıxaran pedaqoq olmalıdır. O da nəzərdən qaçırılmamalıdır ki, tədris prosesində müəllim nəinki təhsilalanları öyrədir, o həm də özü öyrənir, zəngin təcrübə qazanır. Bu tələblərə də o zaman cavab vermək olar ki, müəllim daima peşəkarlığını artırmaq üçün çalışsın, şagirdləri düşündürən məsələlərə cavab tapmağı öyrənsin. Yalnız belə olduqda o, şagirdlərin həyata baxışlarının formalaşmasına nüfuz edə bilər. Bir sözlə, müəllimin pedaqoji ustalığı olmalıdır.

Müəllim tədrisi keyfiyyətcə yaxşılaşdırmaq üçün elə üsul, vasitələr seçir ki, bu zaman şagirdlər dərsdə özlərini daha rahat və sərbəst hiss edirlər. Şagirdlərin bir-biri ilə əməkdaşlıq və fəal ünsiyyəti üçün hər bir dərsdə hərtərəfli şərait yaranır. Müəllim öz avtoritar mövqeyindən tamamilə uzaqlaşır və şagirdləri passivləşdirən ənənəvi metodlardan imtina edir.

Müəllim pedaqoji-psixoloji yanaşmalarındakı yenilikləri dərindən öyrənməklə, milli və beynəlmiləl xüsusiyyətləri də nəzərə almaqla şagirdlərini daha üstün nəticələrin qazanılmasına yönəldir. Tədrisdə müasir pedaqoji texnologiya tədris prosesinin ənənəvi təlimdən fərqli olaraq yüksək səviyyədə idarə olunmasını təmin edir. Pedaqoji texnologiyanın tədris prosesində müəllim fəaliyyətinin bir çox funksional komponentləri vardır: qnostik (idrak), layihələşdirici, konstruktiv, təşkilatçılıq, kommunikativ (ünsiyyət).

Pedaqoji texnologiyanın tədrisdə tətbiqi üçün müəllim müəyyən əməliyyatlar həyata keçirməlidir: zəngin bilik qazanmaq, pedaqoji prosesin təşkili, bilikləri şagirdlərə ötürmək.

Fəal təlim metodlarından tədris prosesində istifadə imkanlarınının texnoloji cəhətdən düzgün müəyyənləşdirilməsi də müəllimdən peşəkarlıq və səriştəlilik tələb edir. Tədrisdə yeni pedaqoji təfəkkürə əsaslanmaq müasir dərsin tələblərindən biri olub, təhsilin demokratikləşdirilməsi, diferensiallaşdırılması və fərdiləşdirilməsinin təmin olunmasını zəruri edir. Müəllim pedaqoji texnologiyaları tətbiq edərkən şagirdlərin tədqiqat fəaliyyətini stimullaşdırmalıdır [4].

Göründüyü kimi, dərslərin interaktiv üsullarla tədrisi zamanın tələbidir və müəllimlər də bu işi həyata keçirməyə hazır olmalıdır. Müəllim öz işini həmin tələblərə uyğunlaşdırmağa borcludur.

Müasir məktəbdə müəllimin bir subyekt kimi mövqeyi böyük əhəmiyyət kəsb edir. Əvvəllər bu mövqeyə müəllimin təlim prosesini idarə etməsi nöqteyi-nəzərindən baxılırdı. Lakin bu gün müəllimin mövqe məsələsi yeni məzmun kəsb edir. O, məktəb səviyyəsində idarəçilik qərarlarının qəbulu prosesinə, təlim prosesinin dəyişdirilməsi üzrə təcrübi işin təşkili və aparılmasına qoşulur, alınan nəticələrə, qəbul etdiyi qərar və dəyişikliklərə görə məsuliyyət daşıyır,

qarşılıqlı anlaşma və əməkdaşlıq əsasında ictimai münasibətlər qurur. Bu baxımdan, demək olar ki, müəllim iki istiqamətdə həyata keçirilən idarəçilik vəzifəsini icra edir: təhsillə bağlı qərarlar qəbul etmək və təhsil şəraitində təhsil prosesinin subyektlərinin fəaliyyətini əlaqələndirmək [5]. Müasir açıq təhsil şəraitində təhsil prosesində yalnız müəllim və şagirdlər iştirak etmir. Məktəb həm də fəal şəkildə valideynlərlə, elm və mədəniyyət ocaqları ilə əməkdaşlıq edir. Məhz bu səbəbdən müəllimin idarəçilik vəzifəsini həyata keçirməsi üçün təhsil prosesi subyektlərinin fəaliyyətinin əlaqələndirilməsi zərurəti meydana çıxır. Bu və ya digər təhsil fəaliyyətinin əlaqələndirilməsinə görə müəllimin öz öhdəsinə məsuliyyət götürməsi onun peşəkar fəaliyyətində yaranan yeni funksiyalarına aiddir.

Beləliklə, müəllim təhsil prosesinin istiqamətləndiricisi və koordinatorudur. Təhsilin keyfiyyətini yüksəltmək istəyən hər bir müəllim daim yeni-yeni qabaqcıl pedaqoji-psixoloji və elmi nailiyyətlərə yiyələnməlidir.

***Rəyçi: dos. N.Nəcəfov***

## İstifadə edilmiş ədəbiyyat

1. Heydər Əliyev. Təhsil millətin gələcəyidir. Bakı: Təhsil, 2002.
2. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, №5.
3. www. President. az – Sənədlər – Sərəncamlar.
4. Ağayev Ə. Seçilmiş pedaqoji əsərləri. Bakı: Nasir, 2011.
5. Mehrabov A. Müasir təhsilin konseptual problemləri. Bakı: Mütərcim, 2010.

**Ф.Мустафаева**

**Организатор и координатор процесса образования**

**Резюме**

Статья посвящена учительской деятельности в процессе образования. Отмечается, что учитель должен работать над собой постоянно, всесторонне трактуется формы изменения профессиональной деятельности, а также роль педагога в обеспечении качества преподавания.

**F.Mustafayeva**

**Guide and coordinator of educational process**

**Summary**

In the article it is talked about teacher’s role in the teaching process. It is also shovn that each teacher must vork hard on yourself. It is dealt vith teacher’s role in creating guality of teaching and changing activity.

*Tərbiyə məsələləri*



# ŞƏXSİYYƏT VƏ ONUN FORMALAŞMASI PROBLEMİ

**İntiqam Cəbrayılov,**
***pedaqogika üzrə elmlər doktoru, professor***

***Açar sözlər:*** *şəxsiyyət, formalaşma, anlayış, insan, təhsil, şagird, məktəb, sinif, inkişaf, cəmiyyət, dəyər, amil.*

***Ключевые слова:*** *личность, формирование, понятие, человек, образование, ученик, школа, класс, развитие, общество, ценность, фактор.*

***Key words:*** *personality, formation, concept, person, education, pupil, school, class, development, society, significance, factor.*

Ümummilli lider Heydər Əliyev haqlı olaraq deyirdi ki, "Təhsil millətin gələcəyidir". Həqiqətən, cəmiyyətin gələcək inkişafında xalqın təhsilə münasibəti, böyüyən nəsillərin zəruri elmi biliklərə, dəyərlərə sahib olması mühüm rol oynayır.

Bu gün respublikamızda məqsədyönlü, uğurlu təhsil islahatları aparılır. Ölkəmizdə təhsil sistemi xeyli təkmilləşdirilmiş, müasir təhsil modeli formalaşdırılmışdır. Təhsilin bütün pillə və səviyyələrində köklü məzmun dəyişiklikləri təhsilalanların intellektinin, bilik və həyati bacarıqlarının, milli və bəşəri dəyərlərin daşıyıcısı olan müasir şəxsiyyətin formalaşması və inkişafı üçün əlverişli imkanlar yaradır.

Təcrübə və araşdırmalar göstərir ki, son illərdə təhsilin keyfiyyətinin artırılması sahəsində həyata keçirilən tədbirlər öz bəhrələrini verir. Bu baxımdan, həllini tapmış aşağıda qeyd olunan məsələlər mühüm əhəmiyyət kəsb edir: Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti Mehriban Əliyevanın rəhbərliyi ilə Fondun yeni layihə olan məktəbəqədər təhsil müəssisələrinin inkişafı proqramına uyğun Bakının 89 ümumtəhsil müəssisəsində məktəbəqədər hazırlıq qruplarının fəaliyyətə başlaması; 2015/2016-cı tədris ilindən tam orta təhsil səviyyəsində, müəyyən olunmuş qaydalar üzrə ilkin olaraq X siniflərdə tədrisin təmayüllər üzrə aparılması; 2014/2015-ci tədris ilindən ölkəmizdə sağlamlıq imkanları məhdud uşaqların ümumtəhsil müəssisələrində inklüziv təhsilə cəlb olunması üçün nəzərdə tutulan "İbtidai təhsil səviyyəsi üzrə inklüziv təhsilin tətbiqi" layihəsinin tətbiqi. Bu istiqamətdə görülən işlərə Bakı şəhərində fəaliyyət göstərən məktəblərin ibtidai sinif müəllimlərinin əməyini stimullaşdırmaq və peşəkarlığını yüksəltmək üçün Təhsil Nazirliyinin "Təməl" təqaüd proqramını həyata keçirməyə başlaması; 2014/2015-ci tədris ilindən ümumtəhsil məktəblərinin VIII siniflərində "Qarabağ tarixi" adlı fakültativ kursun tədrisinə başlanması; Azərbaycanın ümumtəhsil məktəblərinin XI sinif şagirdləri üçün Heydər Əliyev mərkəzlərində "Müstəqil Azərbaycan tarixi" mövzusunda əlavə dərslərin təşkili; "Mütaliə mədəniyyətinin və oxuya motivasiyanın yüksəldilməsi" layihəsinin tətbiqi və s. aid etmək olar. Müəllimlərin əlavə-ixtisa-

sartırma təhsili, ali məktəblərə aparılan tələbə qəbulunun nəticələri də keyfiyyətin yüksəldilməsi ilə bağlı ciddi irəliləyişlərin olduğunu göstərir. 2015-ci ildə ali məktəblərə qəbul zamanı keçid balının 200 baldan aşağı salınmaması, 700 bal toplayan gənclərin əvvəlki illərlə müqayisədə sayının çoxluğu, əslində, elmi biliklərə yiyələnməyə ciddi əhəmiyyət verilməsinin zəruriliyini bir daha təsdiqləyir. Pedaqoji təmayüllü ali məktəblərə tələbə qəbulunda stimullaşdırma hallarının tətbiqi, ölkəmizdə ilk dəfə olaraq ali məktəblərdə təhsil alan xüsusi istedadı və təlim uğurları ilə diqqəti cəlb edən tələbələrdən ibarət "Sabah" qruplarının yaradılması gənclərin elmə, təhsilə marağını xeyli artırır, onlar arasında rəqabəti gücləndirir.

Azərbaycan təhsilinin inkişafı sosial-iqtisadi, mədəni həyatda, bütövlükdə dövlətin, cəmiyyətin inkişafında mühüm əhəmiyyət kəsb edir.

Müasir dövrdə təhsilalanların seçdiyi peşələrə dərindən yiyələnməsində, onların peşə səriştəliliyinin formalaşması və inkişafında, eyni zamanda vətəndaş-şəxsiyyət kimi yetişmələrində həyata keçirilən məqsədyönlü tədbirlər böyük rol oynayır.

Xalqımızın ümummilli lideri Heydər Əliyev böyüməkdə olan nəsillərin şəxsiyyət kimi formalaşması məsələsinə həmişə xüsusi diqqət yetirmiş, onların təhsil almasını, düzgün tərbiyə olunmasını ən vacib məsələlərdən biri kimi göstərmişdir. Ulu öndərin təbirincə desək, "böyüyən nəsilləri, gəncləri birinci növbədə Azərbaycanın müstəqilliyi prinsiplərinə sadiq olmaq ruhunda tərbiyə etmək lazımdır.

Qeyd etmək lazımdır ki, insan həyatı, onun fəaliyyəti cəmiyyətlə sıx bağlıdır. İnsan – cəmiyyət, cəmiyyət – insan münasibətləri şəxsiyyətin cəmiyyətdəki yerini müəyyənləşdirməyə imkan verir. Filosoflar N.D.Naumov, V.S.Solovyov, N.A.Berdyayev, N.O.Losski və başqaları insanın təbii varlıq kimi mövcudluğunu əsas götürərək hesab edirlər ki, insan kosmosun bir hissəsidir. Bu baxımdan, insana kosmik yanaşma ideyası bir sıra tədqiqatçıların əsərlərində əksini tapmışdır. (2)

A.E.Ozerov insana struktur-analitik baxımdan yanaşan L.P.Karsavinin insan və şəxsiyyətlə bağlı baxışlarına xüsusi əhəmiyyət verir. Belə qənaətə gəlinir ki, dünya bir-birinə sıx bağlı olan insanların iyerarxik halıdır. Bununla da şəxsiyyət dünyanın və onun məzmununun dərkində mərkəzi, çıxış kateqoriyası kimi başa düşülə bilər (3).

Araşdırmalar göstərir ki, hələ qədim zamanlardan insan mövzusu filosofları çox düşündürmüş və bu gün də insanın təbiəti, mahiyyəti ilə bağlı məsələlər, müxtəlif dünyagörüş mövqeləri tədqiqat obyektinə çevrilir. Tədqiqatlar göstərir ki, şəxsiyyət ilk növbədə fərd və fərdilik (fərdiyyət) anlayışları ilə sıx bağlıdır. Belə ki, insan bir fərd kimi dünyaya gəlir, daha sonra onda konkret fərdi xüsusiyyətlər yaranır, o öz fərdiliyi ilə seçilir və nəhayət, növbəti inkişaf mərhələsində şəxsiyyətə çevrilir. İnsanın fərd kimi mövcudluğu şəraitində, ilk növbədə, onun fiziki və psixi keyfiyyətləri diqqəti cəlb edir. Sonralar tədricən fərdi xüsusiyyətlər meydana gəlir.

B.Q.Ananyev göstərir ki, şəxsiyyət bütövlükdə bəşəri özünəməxsusluğun strukturunu müəyyən edir. Fərdiyyət və fəaliyyət subyektin və şəxsiyyətin tamlığı üçün vacib amildir. Şəxsiyyətə ictimai mövqedən yanaşsaq, qeyd edə bilərik ki, o, əslində, vahid ümumi qanunlar əsasında formalaşır.

Sosial-psixoloji və fəlsəfi yanaşmalara əsasən şəxsiyyətin formalaşması prosesinin üç mərhələdən ibarət olduğunu qeyd edə bilərik:

- şəxsiyyətin ilk əsası kimi fərdin meydana gəlməsi və insanın fizioloji xüsusiyyətlərinin təkamülü;
- fərdiliyin (fərdiyyətin) inkişafı (bu

prosesə biogenetik meyilləri ilə yanaşı, cəmiyyətin ümumi qanunlarının təsiri);

- ruhi, mənəvi, daxili şüurlu fəaliyyətin nəticəsi kimi şəxsiyyətin yaranması (3,4 ).

Şəxsiyyət fərdin tədricən sosiallaşması prosesində meydana gəlir. Bu anlayış insanın özünəməxsus ümumi və xüsusi əlamətlərini, həm də təkcə, təkrarlanmayan xüsusiyyətlərini ifadə edir. İnsanın sosial fərdiliyi, sosial keyfiyyətlərinin səciyyəviliyi onun şəxsiyyət kimi formalaşdığını qeyd etməyə əsas verir.

Şəxsiyyət probleminə fəlsəfi yanaşma insanın şəxsiyyət kimi mahiyyətini daha geniş mənada izah etmək zərurətini doğurur. Burada həm də belə bir suala cavab axtarmaq lazım gəlir. Bizi əhatə edən dünyada və bütövlükdə tarixdə şəxsiyyətin yeri və rolu nədən ibarətdir? Bu sual şəxsiyyətin formalaşmasında mühüm rolu olan 3 başlıca amilə diqqəti cəlb edir:

1) biogenetik meyillər (fiziki şəxsiyyət və ya fiziki "Mən");
2) sosial amillərin təsiri (sosial şəxsiyyət);
3) psixoloji özək (mənəvi, ruhi şəxsiyyət).

Fiziki "Mən" insanın bədənini, onun təşkilini ifadə edir. Bu da şəxsiyyətin əsas komponentlərindən biridir.

Sosial şəxsiyyətin formalaşması, ilk növbədə, uşağın öz anası ilə ünsiyyəti əsasında yaranmağa başlayır, daha sonra isə digər insanlarla, qrup və kollektivlə ünsiyyəti, fəaliyyəti nəticəsində davam edərək formalaşır və inkişaf edir.

Mənəvi, ruhi şəxsiyyət isə mənəvi dəyərləri əxz edən, mənəvi ideallar uğrunda öz daxili, ruhi dünyasını təkmilləşdirməyə can atan insandır. İnsan mənəviyyatı xarici əlamətlə, insanın təhsili ilə müəyyən edilmir, o, şəxsiyyətin struktur elementi olub ali mənəvi-ruhi düşüncə mərkəzi rolunu oynayır.

İnsanın şəxsiyyət kimi rolu əksər hallarda daha çox onun cəmiyyətdə sosial funksiyalarını nə dərəcədə yerinə yetirməsi, davranışı ilə müəyyən edilir.

Qeyd etmək lazımdır ki, insanın sosial-psixoloji xüsusiyyətləri, o cümlədən dünyagörüşü, dəyərlərə münasibəti, mənəvi və estetik idealları, sosial-siyasi inancları, özünəqiyməti, təfəkkür tərzi və s. onun şəxsiyyətinin müəyyənləşdirilməsində böyük rol oynayır.

Şəxsiyyət valideynlərin, müəllimlərin, mühitin təsiri altında inkişaf edərək müəyyən formanı qəbul edir, o zaman onda düşünülmüş xüsusiyyətlər meydana çıxır. Fəlsəfi baxımdan formalaşma prosesi anlamına gəlir.

Müasir elmi araşdırmalarda əsas istiqamətlərdən biri kimi inteqral insan konsepsiyasının yaradılması problemi diqqəti cəlb edir. Bu, fəlsəfi antropologiyanın başlıca ideyasıdır. Fəlsəfi antropologiyanın tədqiqat predmeti isə insanın ruhi, mənəvi həyat sahəsidir. İnsanın həyat fəaliyyəti, mədəniyyət, hüquq və mənəviyyatın antropobioloji əsasları məhz fəlsəfi antropologiya tərəfindən öyrənilir.

Elmi araşdırmalar göstərir ki, ümumiyyətlə, insan və cəmiyyətin qarşılıqlı əlaqəsinin mürəkkəb, çoxtərəfli xarakteri, bir qayda olaraq, insanın həyat və fəaliyyətinin cəmiyyətin inkişaf səviyyəsi və xarakterinə uyğunluğu qanunu ilə müəyyən edilir. Burada isə cəmiyyətdəki mövcud sosial-iqtisadi münasibətlərlə yanaşı, cəmiyyətdə ictimai münasibətlərin humanistləşmə səviyyəsi də mühüm əhəmiyyət kəsb edir (6). Bütün bunlar şəxsiyyətin formalaşması və inkişafına müəyyən dərəcədə təsir göstərir. Ona görə də şəxsiyyətin formalaşmasından bəhs edərkən geniş mənada formalaşma anlayışının özünə də münasibət bildirmək zərurəti yaranır.

Formalaşma nədir? Elmi araşdırmalar və təcrübə göstərir ki, formalaşma insanın və yaxud şəxsiyyətin ayrı-ayrı tərəflərinin, xarakterin əlamət və keyfiyyətinin inkişafı prosesinin şüurlu şəkildə idarəolun-

ması və onların düşünülmüş formaya (səviyyə, təsir, ideya) gətirilməsidir. Pedaqoji təcrübədə formalaşma şagird şəxsiyyətinə təsir priyomu (tərz) və üsullarının (metodlar, vasitələr) tətbiqi mənasını verir. Burada məqsəd şagirdlərdə müəyyən bilik, bacarıq, dəyər və münasibətlər sisteminin yaradılmasıdır.

Tədqiqatçı-pedaqoq S.M.Vişnyakovanın fikrincə, şəxsiyyətin formalaşması– insanın sosial əhəmiyyətli keyfiyyətlərinin, inamının, baxışlarının, qabiliyyətlərinin, xarakter cizgilərinin müəyyənləşməsi prosesidir.

Ümumiyyətlə, şəxsiyyətin formalaşması sosiallaşma, tərbiyə və özünüinkişaf prosesi və nəticələri kimi izah oluna bilər. İnsanın şəxsiyyət kimi formalaşmasında daha çox sosial amillərin rolu olmaqla bərabər, bioloji mexanizmlər də onun tələbatlarının, maraqlarının ödənilməsində mühüm əhəmiyyət kəsb edir. Bütün bunlar insan şəxsiyyətinin, xarakterinin formalaşmasına güclü təsir göstərir.

***Rəyçi: prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat


1. Əliyev H. Müstəqil Azərbaycan gəncləri 1-ci forumunun 1-ci ildönümü münasibətilə forum nümayəndələrinin bir qrupu ilə görüşdə yekun nitqi. Müstəqilliyimiz əbədidir. Səkkizinci kitab. Bakı: Azərnəşr, 1998.
2. Наумов Н. Философия образования и проблема формирования личности: философский аспект. Вестник Нижневартовского университета. Выпуск № 2, 2010.
3. Озеров А. Проблема формирования личности в трудах современных философов. // Инновации в образовании, 2008, №2.
4. Наумов Н. Личность как социально-психологическая и философская категория. Вестник, 2009, №3.
5. Безрукова В. Основы духовной культуры (энциклопедический словарь педагога). Екатеринбург, 2000.
6. Сулейманов Т. О роли философской концепции в развитии современного образования // Инновации в образовании, 2008, №10.
7. Олешков М., Уваров В. Современный образовательный процесс: основные понятия и термины. Москва: Компания Спутник, 2006.



**И.Джабраилов**

**Проблемы личности и ее формирования**

**Резюме**

В статье исследованы актуальные проблемы формирование личности в современном периоде. В научной литературе было анализировано подходы к концепции личности и формирования, проведено обобщение, обоснованно возможность формирование личности студента. В связи с этим, в статье отражены достижения Азербайджана в области образования в последние годы.



**I.Jabrayilov**

**Challenges of personality formation**

**Summary**

In the article the actual problems of personality formation in modern period has been analyzed. In the scientific literature, the approaches to the concept of personality and formation have been analyzed, summaries are concluded, and the pupil's personality formation chances are based. In this aspect, the article reflects the achievements of Azerbaijan by the field of education in recent years.



# AİLƏDƏ UŞAQLARLA APARILAN VƏTƏNDAŞLIQ TƏRBİYƏSİNİN XÜSUSİYYƏTLƏRİ

**Hamlet İlyasov,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin Qazax filialının baş müəllimi***

Məqalədə ailədə uşaqlarla aparılan vətəndaşlıq tərbiyəsi işinin mövcud vəziyyəti araşdırılır və nəticələri şərh olunur. Göstərilir ki, bu işin səmərəliliyi və keyfiyyəti ailə tiplərindən, onların sosial vəziyyətindən, ziyalılıq səviyyəsindən asılıdır. Eləcə də məqalədə ailədə uşaqlarla aparılan vətəndaşlıq tərbiyəsi işinin xüsusiyyətləri şərh olunur.

***Açar sözlər:*** *vətəndaşlıq tərbiyəsi, müşahidə, ailə tərbiyəsi.*
***Ключевые слова:*** *воспитание гражданства, наблюдение, семейное воспитание.*
***Key words:*** *education for citizenship, observation, family upbringing.*

Ölkəmizdə inkişaf edən cəmiyyət quruculuğu ailədə uşaqların vətəndaşlıq tərbiyəsini daha da aktuallaşdırır. Bu işin təşkilinin əsas xüsusiyyətləri onun elmi əsaslara söykənməsindən asılıdır. Problemə elmi cəhətdən yanaşdıqda ailədə böyüyən uşaqların fərdi xüsusiyyətlərinin və yaş qruplarının nəzərə alınması diqqəti cəlb edir. Uşaqların vətəndaşlıq tərbiyəsinə ailədən başlanmalıdır. Əgər hələ kiçik yaşlarından uşaqlarla müntəzəm və sistemli vətəndaşlıq tərbiyəsi işi aparılarsa, bu proses onların yeniyetməlik və gənclik çağlarında öz bəhrəsini verəcəkdir. Burada valideynlərin üzərinə böyük vəzifələr düşür. Onlar ailədəki vətəndaşlıq tərbiyəsi işinin ölkədəki mövcud vəziyyəti ilə maraqlanmalı, bu sahədə ailələrdə buraxılmış qüsurları aradan qaldıra-qaldıra tərbiyə işini məqsədyönlü qurmalıdırlar. Bu məsələ tədqiqatçılar üçün də maraqlı olduğundan hazırda ailədə kiçik yaşlı uşaqlarla aparılan vətəndaşlıq tərbiyəsi işinin vəziyyəti və tərbiyə işinin xüsusiyyətləri öyrənilir. Ailələrə müvafiq köməkliklər göstərilir. Bu məqsədlə Qazax rayonunda, Gəncə, Bakı, Sumqayıt şəhərlərində müşahidələr aparılmış, valideynlər və ailədəki uşaqlarla müsahibələr və sorğular keçirilmişdir.

Ailələrlə aparılan müşahidə və sorğular göstərir ki, vətəndaşlıq tərbiyəsinin məzmununu bütün ailələr eyni mahiyyətdə başa düşürlər. Onlar vətəndaşlıq tərbiyəsi işinin məzmununa vətənpərvərlik, yaşadığı torpağa məhəbbət, onun düşməndən qorunması, şəhidlərin ruhuna, Milli Qəhrəmanlara ehtiram, düşmənə, əliəyri və fırıldaqçılara, ziyanlı iş görənlərə nifrət, mənsub olduğu millətə ehtiram, hüquqi və əxlaqi normalara riayət edilməsi, intizamlılıq, üzərinə düşən borcu və vəzifəni yerinə yetirmək, dövlətin rəmzlərini bilmək və bayramlarda nümayiş etdirmək, ana dilini, milli adət-ənənələri dərindən sevmək kimi hissləri, praktik əməlləri daxil edirlər.

Müşahidələr göstərir ki, kiçikyaşlı uşaqların vətəndaşlıq tərbiyəsinə onların mənəvi tərbiyəsinin tərkib hissəsi kimi baxılır və bu, uşaqları əhatə edən mühitdə - qarşılıqlı münasibətlər prosesində formalaşır. Bu mühitə ailə ilkin olaraq daxil olur, lakin tanışlar, yoldaşlar, qohumlar – bütün bu kimi

faktorlar da ictimai mühitin mövcudluğunda böyük rol oynayır.

Müşahidələrdən bəlli olur ki, yuxarıda qeyd etdiyimiz bu mühit məktəbəqədər yaşlı uşaqlar üçün daha xarakterikdir. Uşaqlar məktəbə daxil olduqdan sonra yeni bir mühitlə – daimi nizam-intizamı olan, müəllimlərin rəhbərliyi ilə məşğələləri keçirilən, müxtəlif ailələrdən gəlmiş eyni yaşlı uşaqlarla birlikdə fəaliyyət göstərilməsinə şərait yaradan kollektiv mühiti ilə əhatələnirlər.

Uşaqların məktəbə getdiyi gündən birinci sinfi qurtaranadək məktəbin təlim-tərbiyəvi təsirləri ilə aralarındakı dünyagörüşü və ətraf aləmlə tanışlıq fərqi azalır. riayət olunan və rejiminin, eləcə də, məktəb tapşırıqlarının yerinə yetirilməsi sahəsində valideynlərin diqqət və tələbinin nəticəsində kiçikyaşlı uşaqların əksəriyyətinin işgüzarlığı, fəallığı daha yüksək olur.

Öyrənilmiş təcrübə göstərir ki, kiçik yaşlı uşaqların ailədə vətəndaşlıq tərbiyəsinin bazasını məktəb təhsili, orada verilən biliklər təşkil edir. Bu yaşda uşaqlarda müəllimlərinə inam daha güclü olur. Araşdırmalardan belə nəticəyə gəlmək olur ki, ailədə kiçikyaşlı uşaqların vətəndaşlıq tərbiyəsi uşağın məktəb mühiti ilə sıx bağlı aparılmalıdır. Digər tərəfdən, ailələrdə uşaqların vətəndaşlıq tərbiyəsi ailənin hansı sosial qrupa daxil olmasından və valideynlərin təhsil səviyyəsindən də asılıdır.

Azərbaycanın müstəqilliyi, suverenliyi uğrunda aparılan inadlı mübarizə ailələrdə vətəndaşlıq hislərinin güclənməsinə geniş meydan vermişdir. Erməni işğalçılarının Azərbaycan torpaqlarına hücumu, Yuxarı Qarabağ bölgəsində erməni daşnaklarının törətdiyi qanlı qırğınlar, azərbaycanlıların qədim yurdları olan Göyçədən, Zəngəzurdan, İrəvandan və digər yerlərdən zorla qovulması hadisələri də Azərbaycanda yaşayan ailələrdə vətəndaşlıq fəallığına təkan vermişdir.

Azərbaycanın müstəqil dövlət kimi bütün dünyada tanınmasını, inkişafını ölkə əhalisinin hamısı istəyir, lakin vətəndaşlıq tərbiyəsinin məzmununu, onun sistemli şəkildə həyata keçirilməsi yollarını hamı bilmir.

Tədqiqat göstərir ki, ailədə uşaqların vətəndaşlıq tərbiyəsi sahəsində mövcud vəziyyətinin qənaətləndiriciliyi ailə tərkibindən asılı olaraq fərqlidir. İnsanların təhsil səviyyəsinə, maraq və meyillərinə, peşə-ixtisasına, fəaliyyət sahəsinə uyğun olaraq tərbiyədə aparıcılıq bu və ya digər istiqaməti təşkil edir. Bu məsələ ilə əlaqədar Azərbaycan pedaqoqları Əjdər Ağayevin, Yusif Talıbovun, Müseyib İlyasovun və digər müəlliflərin tədqiqatlarında maarifləndirici məlumatlar verilmişdir (1, 2, 3, 4).

Görünür, digər ölkələrdə də uşaqların vətəndaş hazırlığı, vətəndaşlıq tərbiyəsi cəmiyyət quruculuğunda mühüm faktor kimi nəzərə alındığından, bu məsələ ilə əlaqədar tədqiqat əsərlərində müəyyən fikir və mülahizələr söylənmişdir. Pedaqoq alim B.Z.Vulfovun qənaətinə görə, vətəndaşlıq tərbiyəsi adı altında nəyin nəzərədə tutulduğunu anlamaq vacibdir, cəmiyyətin təşkilinin müasir mərhələsində onun məqsədləri və vəzifələri nədən ibarətdir və onlar məktəb və ailələrin real imkanlarına cavab verirlərmi?! “Mənim nəyi və necə etməyimdən, başqa adamlar arasında özümü necə aparmağımdan xalqımın, ölkəmin və özümün taleyim asılıdır; mən hər şey üçün cavabdehəm. Mən hər şeyi vicdanla və qanunauyğun surətdə etməliyəm. Özünüaparmanı müəyyənləşdirən belə dərketmə cəmiyyətin demokratik idarəetməsinin mövcudluğunun və inkişafının əsasıdır” (5 səh, 47-48).

Bazar münasibətləri inkişaf etdikcə, varlanmaq uğrunda rəqabət də artır. Çox təəssüf ki, bu yolda alıb-aldatma, qaçaqmal-

çılıq, şeyləri fantastik qiymətlərlə satmaq, dövlət mülkiyyətindən, narkotika alverindən qazanc məqsədi ilə istifadə etmək, adamların münasibətlərində təmənnalılıq, pulpərəstlik daha çox inkişaf edir. Bunlar da mənəvi saflığa ziyan vurur və bunu bütün uşaqlar görür, hətta, bir çoxu ailələrindəki maddi sıxıntıya, kasıblığa, az əməkhaqqına görə mənəvi narahatlıq da duyur. Belə bir şəraitdə -konkret tarixi mərhələnin kapitalizm ziddiyyətlərini artırdığı bir vaxtda, əlbəttə, uşaqların vətəndaşlıq tərbiyəsinin həyata keçirilməsi xeyli çətinləşir, valideynlərdən xüsusi məharət tələb edir. Eyni zamanda uşaqların təlimi və tərbiyəsinə onların müstəqil düşüncəsini, təşəbbüskarlığını, fikir sərbəstliyini təmin edə bilən mövqedən yanaşılması vacib şərt kimi meydana çıxır. Bu tələbin yerinə yetirilməsi kiçikyaşlı uşaqların gördüklərinə, faktlara, hadisələrə dəyərvermə, qiymətləndirəbilmə bacarıqlarını təmin edir. Onlar nəyin pis, nəyin yaxşı hal olduğunu özləri müəyyənləşdirə bilirlər.

Tədqiqatlar göstərir ki, valideynlərin uşaqlarla apardıqları vətəndaşlıq söhbətləri mühüm əhəmiyyət daşıyır. Çünki məktəbdə, ictimai yerlərdə, ailədə fakt və hadisələrə münasibətin eyniliyi uşaqların vətəndaşlıq mövqeyini daha düzgün formalaşdırır. Bəzən isə elə ailələr də olur ki, valideyn və ya valideynlər ya sosial çətinliklərdən, ya hansısa məmurun onu incitməsindən, narazılıq ifadə edir, bunun təsirinə düşərək ölkədəki inkişaf meyillərini, düzgün qiymətləndirə bilmir. Belə ikili vəziyyətdə kiçik yaşlı uşaqlar vətəndaşlıq haqqında konkret və düzgün mövqeyə yiyələnə bilmirlər.

Bildiyimiz kimi, hazırda İKT, müxtəlif elektron vasitələr məişətimizə daxil olub. Toy şənlikləri, milli bayramlar və digər tədbirlərə aid videokasetlər, disklər, teleradio verilişləri ailədə vətəndaşlıq tərbiyəsinə yaxından kömək edir. Mübarizə hərəkatını əks etdirən verilişlər, Vətənin igid oğullarının torpaqlarımızın qorunması uğrunda mübarizəsinə, dövlətçiliyin qorunması faktlarına uşaqlar hər dəfə televiziya ekranında baxarkən onlarda vətəndaşlıq hosləri daha da artır, özləri də hiss etmədən vətəndaşlıq hazırlığı keçirlər.

Ermənilərin törətdikləri qırğınları ekranda görən hər bir uşaqda Vətənin qorunması, onun düşmən tapdağına çevrilməsinə imkan verilməməsi arzusu yaranır. Xüsusilə uşaqların, qocaların Xocalı qətliamında olduğu kimi, min bir əzab-əziyyətlə öldürülməsi faktlarının ekran təcəssümü onlarda qeyrət və şərəf, ləyaqət və borc hissini coşdurur.

İndi təkcə Bakıda deyil, bir çox rayon və şəhərlərimizdə şəhidlər qəbiristanlığı yaranıb. Hər dəfə bir şəhid haqqında məlumat alan uşaqlarda düşmənə nifrət hissinin coşdurduğu qeyrət və cəsarət hissi baş qaldırır və vətəndaşlıq amalına çevrilir.

Ailədə keçirilən şənlik, sevinc doğuran milli bayramlar, dövlət bayramları uşaqların inkişafına güclü təsir göstərir. Onlar bu bayramların keçirilməsinə valideynlərinin fəal münasibətini gördükdə daha da təsirlənirlər. Bu bayramlar uşaqları adət-ənənələrlə tanış edir, onlarda milli-mənəvi dəyərləri formalaşdırır. Bütün bunlar vətəndaşlıq məzmununa daxil olan keyfiyyətlərdir. Dövlətin təşkilatçılığı ilə keçirilən tədbirlər ailələri də öz məzmununda birləşdirir. Ölkə başçısı bayramlarda, şənlik tədbirlərində iştirak edir, vətəndaşlarla görüşür. Bütün bunları görən uşaqlar Azərbaycanda yaşamaları ilə iftixar hissi keçirir, onlarda vətəndaşlıq mövqeyi formalaşır.

Dövlət tərəfindən qəbul edilmiş tarixi bayramların bilavasitə xalqın həyatı, ənənəsi, mübarizəsi ilə bağlı olması ailədə vətəndaşlıq tərbiyəsi imkanlarını daha da artırır.

Nəticə kimi qeyd etmək olar ki, ölkəmizin ictimai-siyasi həyatında, cəmiy-

yətin yeniləşməsində baş verən proseslər ailədə tərbiyə işinə, o cümlədən vətəndaşlıq tərbiyəsinə güclü təsir göstərməkdədir. Ölkənin müharibə şəraitində olması, müstəqil milli dövlətin yaranması, demokratik düşüncə, söz və fəaliyyət azadlığı vətəndaşlıq hislərinin coşmasına, vətəndaşlığın daha dərindən dərk edilməsinə və vətəndaşlıq fəaliyyəti göstərilməsinə imkan verir. Valideynlərin bu işdə iştirakı və ailə söhbətlərində öz münasibətlərini bildirmələri uşaqların vətəndaşlıq keyfiyyətlərinin nədən ibarət olduğunu anlamalarına təsir edir. Bəzi ailələrdə uşaqların cəmiyyətdə gördüklərini müqayisəli təhlil aparmalarına imkan verilir. Bu təhlillərdə valideynlər, əslində, nəyin, hansı hərəkətin düzgün olmasının dəlilli, sübutlu izahına çalışırlar. Belə olmasa, kiçikyaşlı uşaqların nəticə çıxarması, nəyin düz, nəyin əyri, nəyin gərəkli, nəyin gərəksiz olduğunu bilməsi çətin olur. Tədqiqatdan belə nəticə də hasil etmişik ki, hansı ailələrdə uşaqların tərbiyəsi, o cümlədən vətəndaşlıq tərbiyəsi bilavasitə valideyn nəzarəti və rəhbərliyi ilə gedirsə, orada vətəndaşlıq hazırlığı yüksək olur.

Beləliklə, ailədə uşaqların vətəndaşlıq tərbiyəsi yalnız nəzəri olaraq deyil, praktik olaraq da müasir dövrün tələblərinə uyğun səviyyədə qurulmalıdır.

***Rəyçi: prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat

1. Ağayev Ə. Heydər Əliyev irsində vətəndaşlıq tərbiyəsi məsələləri // Azərbaycan məktəbi, 2005, №3.

2. Talıbov Y. Uşaqlarımızın səadəti naminə. Bakı, Maarif, 1988.

3. İlyasov M., Nəzərov M. Yuxarı sinif şagirdlərinin vətəndaşlıq tərbiyəsi. Bakı, 2003.

4. Воспитание гражданина главная педагогическая задача государства и гражданского общества: Сборник статей / Состав. Е.И.Хаванов. М.:МГПУ, 2007.

**Г.Ильясов**

**О воспитательной работе с детьми в семье**

**Резюме**

В статье рассматривается и анализируется текущая ситуация воспитательной работы, проведенной в семье с детьми. Показывается, что эффективность и качество этой работы зависит от типов семьи, от их социального положения интеллектуального уровня. А также комментируется в статье свойства воспитания по духу гражданства.

**H.Ilyasov**

**The features of children‘s civic education in the family**

**Summary**

In the article it is spoken about current state, and the results of implementation of civic education to children in the families. It is noted that efficiency of this policy depends on the types of families, their social backgrounds and intelligence levels. The features of implementation of civic education to children in the family are also analysed here.

# HACIBƏYLİLƏRİN MÜHACİR QARDAŞI



**Leyla Vəzirova,**
**Nəcəf Nəcəfov,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosentləri***



Məqalədə Ceyhun Hacıbəylinin həyatından, onun ictimai fəaliyyəti və yaradıcılıq yolundan bəhs edilir. Məqalədə C.Hacıbəylinin yaradıcılığının hər iki dövrü: 1905-1919-cu illər və 1919-1962-ci illər əhatə olunmuşdur. Onun irsi mühacirət ədəbiyyatının ən dəyərli nümunələri kimi dəyərləndirilir.

***Açar sözlər:*** *istiqlal mücahidi, mühacirət publisistikası, maraq dairəsi, tərcüməçi, şərqşünas.*

***Ключевые слова:*** *глошатой свободу, эмигрантская публицистика, круг интересов, переводчик, востоковед.*

***Key words:*** *freedom fighter, immigration journalism, interests, translator, orientalist.*

XX əsr Azərbaycan ziyalılarının taleyinə nəzər saldıqda elə insanları xatırlamaq lazım gəlir ki, onların həyatı nə qədər ağrılı-acılı olsa da, zamanın təlatümləri ilə üz-üzə gəlsələr də yenə də onlar mənən sınmamış, haqq işi uğrunda usanmadan mübarizə apararaq, ömürlərini sarsılmaz amallarına sadiq qalmaqla başa vurmuşlar. Belə ziyalılarımızdan biri də AXC qurucularından biri, Azərbaycanın istiqlal mücahidi, mühacirətin fəal üzvlərindən və təşkilatçılarından olan geniş diapozona malik sənətkar Ceyhun Hacıbəylidir.

İctimai xadim, dilçi, tarixçi, jurnalist, tərcüməçi, publisist, yazıçı kimi tanınan Ceyhun Hacıbəyli ömrünün mühacirət illərini də çox şərəflə yaşamış, qürbətdə keçirdiyi 43 ildə parlaq şəxsiyyətlər səviyyəsinə ucalmışdır. O, mənalı və məzmunlu həyatının qürbətdə keçən ən dəyərli illərində də ürəkdən bağlandığı vətənini bir an belə yaddan çıxarmamış, onun gələcəyi, müstəqilliyi barədə düşünmüş və müvəqqəti məğlubiyyət onun gələcəyə olan inamını qırmamışdır. Çox təəssüf ki, sovet rejiminin qadağaları nəticəsində onun vətən naminə gördüyü işlər son illərədək kölgədə qalmışdır.

Azərbaycan Respublikasının Prezidentinin 2015-ci il 19 noyabr tarixli sərəncamından sonra Ceyhun Hacıbəylinin yaradıcılıq yoluna bir daha nəzər salınmış, onun irsinin dərindən araşdırılmasına başlanmışdır. Düzdür, bir qədər əvvəllər professor Şamil Qurbanovun "Üzeyir bəyin qardaşı", "Ceyhun bəy Hacıbəyov (1891-1962)", professor V.Quluyevin "Dünyanı dolaşan dünya ömürlü "Azərbaycan" və başqa sanballı yazılarında, xüsusən son vaxtlar Azərbaycan ədəbiyyatşünaslarının, o cümlədən "Ədəbiyyat qəzeti"ndə Abid Tahirlinin silsilə məqalələri ədəbi-mədəni, ictimai-siyasi fikir tariximizdə müstəsna rol oynamış bu şəxsiyyət haqqında dəyərli fakt-

ların üzə çıxarılmasına kömək etmişdir. 2013-cü ildən Nizami adına Ədəbiyyat İnstitutunda Azərbaycan mühacir ədəbiyyatı şöbəsinin yaradılması da bu işə təkan vermişdir.

Ceyhun Hacıbəyli xalqımızın mədəniyyət tarixində nüfuzlu və qüdrətli simalardan biridir. O, Şuşa zadəganlarından olan Hacıbəylilər nəslinin davamçısıdır. Bu mötəbər nəsildən pərvazlanan Üzeyir Hacıbəyli məhz Qarabağ mühitində yetişən dünyamiqyaslı şəxsiyyətlərin səviyyəsinə yüksəlmişdir. Məhz belə sənətkarların adı indi də işğalda olan Şuşanı Azərbaycanın mədəniyyət mərkəzi kimi tanıdır.

Ceyhun Hacıbəyli dünyaşöhrətli əsərləri ilə xalqımızın başını göylərə ucaltmış Azərbaycan bəstəkarı, musiqişünas alim, publisist, dramaturq, pedaqoq və ictimai xadim, Azərbaycan EA-nın həqiqi üzvü, professor, iki dəfə (1941, 1946) Stalin mükafatı laureatına layiq görülmüş, SSRİ xalq artisti adını almış, 1938-1948-ci illərdə Azərbaycan Bəstəkarlar İttifaqının sədri, 1928-1929-cu illərdə ADK-nin rektoru, 1945-1948-ci illərdə Azərbaycan EA İncəsənət İnstitutunun direktoru kimi məsul vəzifələrdə çalışmış Üzeyir Hacıbəylinin kiçik qardaşıdır. Bu ailənin başçısı Əbdülhüseyn Molla Məhəmməd oğlu Xurşidbanu Natəvanın sarayında mirzə işləmiş, daha sonra onun Ağcəbədidəki təsərrüfatına başçılıq etmişdir. Üzeyirin anası Şirinbəyim xanımla da məhz Natəvanın sarayında tanış olub ailə qurmuşdur. Onların 2 qızı, 3 oğlu dünyaya gəlmişdir. Əbdülhüseyn Mirzə ziyalı bir şəxs kimi Qarabağın incəsənət adamları ilə yaxınlıq edər, evində tez-tez məclislər qurarmış. Bu işıqlı şəxsiyyətin 1901-ci ildə qəflətən vəfat etməsi bütün ailəni sarsıtmışdı. Onda Üzeyirin böyük qardaşı Zülfüqarın 17, kiçik qardaşı Ceyhunun 10 yaşı vardı. Başsız qalan ailənin uşaqlarına onların istedadlı olmaları köməyə gəlmişdir. Ceyhun Hacıbəylinin şəxsi sənədləri arasında saxlanılan “İlk Azərbaycan operası necə yaranmışdır” xatirə yazısında bu məsələlər öz əksini tapmışdır.

Ailənin böyük oğlu Zülfüqar Hacıbəyli (1884-1950) bəstəkar Niyazinin atasıdır. O, “Aşıq Qərib” (1915) operasının, öz librettolarına bəstələdiyi “Əlli yaşında cavan” (1909), “Varlı” (1911), “Evliykən subay” (1911) musiqili komediyalarının müəllifidir. Onun yarımçıq qalmış “Nüşabə” və “Üç aşıq” operaları da vardır.

Özündən böyük qardaşlarından fərqli olaraq Ceyhun bəyin (1891-1962) taleyi çox acınacaqlı olmuşdur. Fələyin ləngər vuran gəmisi onu qitədən-qitəyə, eldən-elə atmışdır. O, maraqlı və üzüntülü bir həyat yolu keçmişdir. İbtidai təhsilini doğulduğu Şuşada “rus-tatar” məktəbində aldıqdan sonra, orta təhsilini Bakıda başa vurmuşdur. Bütün şuşalılar kimi o da uşaqlıqdan incəsənətə maraq göstərmiş, Şərqin ilk operası olan “Leyli və Məcnun”un yaradılmasında yaxından iştirak etmiş, elə ilk tamaşada iki rolun – İbn Salam və Nofəl rollarının ifaçısı olmuşdur. Müasirlərinin rəyinə görə, o, “İbn Salamda öz rolunu nə qədər gözəl və mahir ifadə etsə də, Nofəl rolunda, demək olar ki, layiqincə oynayıb, layiqincə oxuyurdu (“Tazə həyat” qəzeti, 14 yanvar, 1908, №11). Ceyhun bəy operaya o qədər bağlanmışdı ki, hətta bir afişada müəllif kimi adı Üzeyir Hacıbəyli ilə qoşa yazılmışdı.

Üzeyir bəydən 6 yaş kiçik olan Ceyhun bəy böyük qardaşı ilə bərabər 1908-ci ildə Əlibəy Hüseynzadənin müdir olduğu “Səadət” məktəbində bir il müəllim işləmişdi. O, bu məktəbdə yalnız müəllimlik etməklə kifayətlənmirdi, həm də ədəbi-ictimai aləmin müxtəlif tədbirlərində fəal iştirak edirdi.

C.Hacıbəyli öz bacarığı ilə hələ gənclikdən ziyalıların diqqətini cəlb etmişdi. Artıq hamı bilirdi ki, Hacıbəylilər ailəsində

bir istedadlı gənc də yetişir. O, Bakı milyonçusu M.Muxtarovun ayırdığı vəsaitlə Peterburq Universitetinin hüquq fakültəsinə daxil olmuş (1909), oradan Parisə gedib məşhur Sorbonna Universitetində oxumuşdur. 1916-cı ildə ali təhsilini başa vurub Bakıya qayıtdıqdan sonra, əsasən, mühərrirliklə məşğul olaraq, "Kaspi" qəzetində tez-tez çıxış etmiş, 1917-ci ildə nəşr olunan "İttihad" və "Müsəlmançılıq" qəzetlərinin redaktoru olmuşdur. Bu illərdə o həm də bir hekayənəvis kimi tanınmışdır. Onun yaradıcılığının birinci dövründə, yəni 1905-1919-cu illərdə yazdığı bir sıra satirik hekayələr dövri mətbuatda, o cümlədən "Proqress", "Baku" və "Kaspi" qəzetlərində çap olunmuşdur. Bu hekayələrdə o, cəhalət, qadın hüquqsuzluğu, təhsilə laqeyd münasibəti tənqid etmiş, maarifə, mədəniyyətə yiyələnməyin vacibliyini təbliğ etmişdir.

C.Hacıbəyli M.F.Axundovdan sonrakı dövrün ən qabaqcıl adamlarının əməyini də yüksək qiymətləndirirdi. O, Həsən bəy Zərdabini daha çox dəyərləndirirdi. Hətta onu "Azərbaycan mədəniyyətinin tarixi" adlandırırdı. O dövrün xadimlərinin "millətin atası" adlandırdıqları İsmayıl bəy Qaspiralıya da hörmət bəsləmiş, onun xatirəsinə həsr olunmuş ayrıca məqalə yazmışdır. Hüseyn Ərəblinski, Haşım bəy Vəzirovun fədakarlığını da dönə-dönə qeyd etmişdir. O, "Kaspi" qəzetində Ağabəyim ağa, Aşıq Pəri, Xurşidbanu Natəvan, Kəminə xanım, Kövhər ağa kimi qadın şairlərimiz haqqında məqalələr çap etdirmişdir.

C.Hacıbəyli mətbuat tariximizin araşdırılması ilə də məşğul olmuşdur. O, XX əsrin əvvəllərində fəaliyyət göstərən "Şərqi-Rus", "Həyat", "İrşad", "Rəhbər", "Dəbistan", "Təkamül", "Yoldaş", "Molla Nəsrəddin", "Füyuzat", "Tazə həyat", "Tərəqqi", "Proqress", "İttifaq", "Zənbur" kimi qəzet və jurnallar haqqında əhəmiyyətli fikirlər söyləmişdir. Onun XX əsrin ikinci onilliyindəki Bakı fəaliyyəti, həm də maarifçilik və müəllimliklə bağlı olmuşdur. O, Həsən bəy Zərdabinin təşkilatçılığı ilə Bakıda keçirilən Azərbaycan müəllimlərinin I qurultayının proqramının hazırlanması məqsədilə yaradılan komissiyada çalışmışdır. Həmin illərdə Bakıya pənah gətirən Qars qaçqınlarına yardım etmək məqsədilə keçirilən xeyriyyəçilik tədbirlərində də fəal iştirak etmişdir.

1918-ci ilin avqustunda AXC rəhbərliyi tərəfindən C.Hacıbəyli Gəncəyə dəvət olunur. Yeni qurulan milli hökumətin başçısı Nəsib bəy Yusifbəyli ona və Şəfi bəy Rüstəmbəyova rəsmi "Azərbaycan" qəzetinin nəşrə başlamasını təklif edir. C.Hacıbəyli bu təkliflə razılaşır və az vaxtdan sonra – sentyabrın 15-də onun redaktorluğu ilə bu qəzetin ilk nömrəsi işıq üzü görür. Qəzetdə ən vacib, aktual məsələlərə yer verilirdi. Ümumilikdə 443 nömrəsi çıxan bu qəzetin 88 nömrəsinə C.Hacıbəyli redaktorluq etmişdir. Müəyyən vaxtlarda bu qəzetə Şəfi bəy Rüstəmbəyov, Üzeyir bəy Hacıbəyli və Xəlil İbrahim də redaktorluq etmişlər. Qəzetin fəal əməkdaşlarından olan Yusif Vəzirlinin bütün zamanlar üçün məqbul sayılacaq "Bu gün basılan kitablar kəsilən pullardan qiymətlidir",- kəlamı qəzetin əhəmiyyətini bir daha dəqiq müəyyən edirdi.

Bakının erməni-bolşevik quldurlarından azad olunması münasibətilə "Azərbaycan" qəzetinin 3 oktyabr 1918-ci il tarixli sayında C.Hacıbəyli "Tarixi gün" adlı məqaləsində yazırdı: "15 sentyabrın bütün türk islam aləminin ən səadətli və şövkətli günlərindən sayılacağı şübhəsizdir". Cavan mühərririn sözlərini tarix təsdiq etdi. O özü də bu yolun yolçusu oldu.

Mətbuat səhifələrində məktəb məsələlərinə dair məqalələrdə maarifçi yazıçılar mövqeyindən çıxış edən C.Hacıbəylinin bu əsərlərində əsas ideyalardan biri

kimi təhsilə, elmə yiyələnmək məsələləri qoyulurdu. Onun “Kaspi”də çap olunan 237 məqaləsinin böyük əksəriyyəti bu mövzulara həsr olunmuşdu.

C.Hacıbəylinin “Etinasız”, “Ev tərbiyəsi haqqında bəzi qeydlər”, “Zülmət və işıq”, “Müəllimlərin təqdimatı”, “Şəhər ibtidai məktəbinin müəllimləri haqqında”, “Nuxada gimnaziya”, “Qadın təhsilinin ehtiyacları” kimi onlarca məqaləri bilavasitə təlim-tərbiyə mövzusunda yazılmışdır. Bu məqalələrdə Azərbaycanda maarifin real vəziyyəti əks olunurdu. Mövzu rəngarəngliyi yazıçının dünyagörüşünün genişliyindən xəbər verirdi.

AXC-nin qurulması C.Hacıbəyli üçün yeni perspektivlər açdı. Bundan sonra ən tanınmış şəxsiyyətlərlə çiyin-çiyinə işləyən C.Hacıbəyli Azərbaycan hakimiyyətinin 3 iyul 1918-ci il tarixli qərarına əsasən dörd nömrəsi Gəncə şəhərində çıxarılan “Azərbaycan” qəzetinin Bakıya köçürülməsi ilə məşğul olur və məqsədinə çatır. Qəzet oktyabrın 3-dən etibarən öz işini Bakıda davam etdirir. Ceyhun bəy 1919-cu il yanvarın 16-nadək, yəni Parisə gedənə qədər bu məsul vəzifəni şərəflə daşıyır. Versal Sülh Konfransında iştirak etmək üçün 1919-cu ilin dekabrında Parisə göndərilən C.Hacıbəyli Parisdə də ictimai fəaliyyətini dayandırmır. Elə həmin il istedadlı qələm sahibi Parisdə fransız dilində “İlk müsəlman respublikası olan “Azərbaycan” kitabını nəşr etdirir. 1920-ci ilin 28 aprel bolşevik çevrilişindən sonra o, Paris Sülh Konfransının nümayəndə heyətinin üzvü kimi fəaliyyətini dayandırır və daimilik mühacir kimi Fransada yaşamağı qərara alır.

Vəziyyətin çətin olduğunu görən Ceyhun bəy vətənə qayıtmağın təhlükəli olduğunu görüb ailəsini də Fransaya gətirməli olur. Həyat yoldaşı Zöhrə Hacıqasımova – Hacıbəyli hələ iki yaşı tamam olmamış oğlunu da götürüb, Parisə yollanır. Həmin illərdə Üzeyir bəyin bir ata qayğısı ilə qardaşına yazdığı məktubları indi də həyəcansız oxumaq olmur: “Nuri-didə Ceyhun! Salam-duadan sonra çox şadam ki, sizə məktub göndərməyə müvəffəq oldum... Mən bu il müsəlmanlara məxsus olmaq üzrə bir konservatoriya açdım, bu saət orda iki yüzdən artıq məktəb şagirdi oxuyur. Bir həftə bundan əvvəl rəsmi-güşadi idi. Bütün komissar yoldaşlar başda Nərimanov olmaq üzrə gəlmişlərdi... Həqiqət, bu konservatoriyanın bizim müsəlmanlardan ötrü böyük mənası olacaqdır... Çingiz ilə Niyazi dəxi orda oxuyurlar... Nənəm eşitdi ki, mən sənə kağız yazıram, çox şad oldu və hamıya tapşırdı ki, səs-küy salmasınlar, mən karıxmayım... Bəradərin Üzeyir. 26.11.1921, Bakı”.

Bu məktub ona göndərilən təsəlli məktublarından ancaq biri idi. Ceyhun bəyin vəziyyətlə barışmaqdan, gecə-gündüz çalışmaqdan başqa bir çarəsi qalmamışdı. O, Azərbaycanla bağlı fikirləri reallaşdırmağa çalışır, doğulduğu, boya-başa çatdığı Qarabağı bir an belə unuda bilmirdi. 1934-cü ildə Parisdə nəşr edilən “Asiya” jurnalında “Qarabağ dialekti və folkloru (Qafqaz Azərbaycanı)” adlı məqalə çap etdirir. O, bu məqaləni yazarkən Azərbaycan alimləri ilə sıx əlaqə şəraitində işləyən rus şərqşünası A.N.Samoyloviçlə məsləhətləşmişdir. Samoyloviç Azərbaycan alimləri ilə sıx təmasda idi. O tez-tez görkəmli ədəbiyyatşünas Salman Mümtazla məktublaşırdı. Təsadüfi deyildir ki, Ceyhun bəyin həmin əsəri bu gün də öz aktuallığını itirməmişdir.

Hələ gənclik illərindən C.Hacıbəyli Azərbaycan ədiblərinin əsərlərini fransız, ingilis dillərinə çevirib, Şərq klassikləri, eləcə də Azərbaycan muğamları və musiqi dühaları haqqında yazıları qələmə alıb, yaddaşlardan yazılara köçürür. Azərbaycan mədəniyyətinin təbliğinə xüsusi fikir verirdi. Bu məqsədlə o, Üzeyir bəyin məşhur “Arşın

mal alan" komediyasını tərcümə edib ilk dəfə onun 1925-ci ildə Parisin "Femino" teatrında tamaşaya qoyulmasına nail oldu. Məlumdur ki, Üzeyir bəy bu haqda demişdi ki, "bu ermənilərin Zəngəzur iddiasından daha betərdi. Tamaşaya qoyulsa, yalanları ortaya çıxacaq". Yeri gəlmişkən, onu da demək lazımdı ki, bu premyerada Üzeyir bəy özü də iştirak etmək arzusunda olub, lakin Paris səfəri çox pul tələb etdiyinə və digər səbəblərə görə, o, burada iştirak edə bilməmişdi. Bu haqda Üzeyir bəy qardaşı Ceyhuna yazırdı ki, "evimin bütün əşyalarını da satsam, yenə öhdəsindən gələ bilmərəm", istəyi o idi ki, "Arşın mal alan"ı tamaşaya qoyan teatr onun yol xərcini də ödəsin, çox heyif ki, teatrın bu xərci ödəməyə imkanı yox idi.

Taleyin işinə bax ki, Ceyhun bəyin həmin kitabı Parisdə çap olunanda doğma qardaşı Üzeyir bəyi vətənində böyük musiqi əsərləri, o cümlədən "Koroğlu"nu yazmaq düşündürürdü. 1921-ci ildə Üzeyir bəyin "Arşın mal alan" operettası Bakıda müvəffəqiyyətlə göstərildi. Ceyhun bəy, həmçinin fransızları Cəfər Cabbarlının, Hüseyn Cavidin əsərləri ilə tanış edirdi. O bilirdi ki, Üzeyir bəy bu iki yazıçı ilə həmfikir və əqidədaşdır. Lakin Ceyhun bəy maddi cəhətdən çox ciddi çətinliklərlə üzləşirdi.

Vaxtilə musiqi təhsilini davam etdirə bilməyən Ceyhun bəyin Azərbaycan oxucusuna 1909-cu ildə ilk dəfə məhz İ.Turgenevin "Pulsuzluq" komediyasını tərcümə edərək təqdim etməsi, bəlkə də, təsadüf sayıla bilməz. Pulsuzluq Vətəndə olduğu kimi sonralar, qürbətdə də onu daim izləmişdir. O da digər azərbaycanlı didərginlər kimi Parisdə liseydə oxuyan oğlunun təhsil haqqını ödəyə bilmədiyinə görə uşağı, hətta məktəbdən kənarlaşdırırlar. Bununla əlaqədar Parisdə yaşayan Əlimərdan bəy Topçubaşovun həmin məktəbin müdirinə yazdığı məktub həddən artıq təsirli və düşündürücüdür. Ə.Topçubaşovun məktubunda deyilirdi: "Çox təəssüf hissi ilə öyrəndim ki, bizim heyətin üzvü Ceyhun bəy Hacıbəylinin oğlu, Sizin rəhbərlik etdiyiniz kollecin şagirdi təhsil haqqını ödəmədiyi üçün dərslərdə iştirak etməkdən məhrum olunub. Cənab müdir, sizə məlumdur ki, bu şagird lisey üzrə başqa şagirdlərdən bilik və bacarığına, xüsusilə fransız, ingilis, hətta latın dillərini bildiyinə görə fərqlənir... İndi isə xahiş edirəm, cənab müdir, liseyin şagirdi Hacıbəylini sonuncu dərs ilinə kimi sinifdə əyləşməyə icazə verəsiniz və sonra şərait yaradasınız ki, o, öz təhsilini sona qədər başa vursun. Öncədən mən və müstəmləkə altında yaşayan bütün Azərbaycan Sizə dərin təşəkkürünü bildirir. Əlimərdan bəy Topçubaşov, 26 fevral 1932-ci il".

Tanınmış qələm sahibi İradə Tuncayın bu sahədəki son araşdırmalarını ürək ağrısız oxumaq olmur. AXC-nin Avropaya təhsil almağa göndərdiyi 100 tələbənin taleyinə həsr olunmuş məqaləsində o, Ceyhun Hacıbəylini gənclərin yeganə ümid yeri, havadarı kimi təqdim edir. Aşağıdakı sətirlər buna gözəl misaldır. İradə xanım yazır: "Hələ 19-cu ildə xaricdə tələbələrin təhsili ilə məşğul olan doktor Bəhmən Axundov sonralar İstanbuldan Parisə Ceyhun Hacıbəyliyə təşviş dolu bir məktub göndərir: "Əziz Ceyhun! Tələbələrdən çox nigaranam. İki aydan da bir az artıq müddətdə Bakıda çox çalışdım. Öz əllərimlə 200 brilyant seçib tələbələrlə yola saldım. Sata bildilər, ya yox, məlumatım yoxdu. Nərimanov bu barədə Berlin nümayəndəliyinə sorğu göndərmişdi. Nərimanın Moskvaya gedişi ilə hər şey alt-üst olub. Sabah nə olacaq, deyə bilmərəm. Məchulluqla üz-üzə dayanmışıq. Mən onları unutmuram, unutmuyacağam da. Bakıya qayıdan kimi yenə onlara yardım etməyə

çalışacam. Təki oxusunlar, bizim bu uşaqlara ehtiyacımız var”. Sonra müəllif sözünü Ceyhun bəyin üstünə gətirir: “Nərimanın gedişindən sonra tələbələrin ümid yeri Avropadakı mühacirlər, xüsusilə də Ceyhun bəy Hacıbəyli olur. O illərdə cavan yaşına rəğmən bu tələbələrə ağsaqqallıq edir, onlara həm maddi, həm də mənəvi dəstək olur. Və bu tələbələrin ona yazdığı məktubları da ömrünün son günlərinə qədər arxivində xüsusi qayğı ilə qoruyub saxlayır. Sonradan Ceyhun bəyin oğlu bu arxivi Ramiz Abutalıbova verəcək, o da Azərbaycana gətirəcəkdi...” Ceyhunsevərlər bu cəhətdən R.Abutalıbova çox borcludurlar.

Xatırladırıq ki, 100 tələbənin çoxunun taleyi faciə ilə nəticələnmişdi. Düzdür, vətənə qayıdanlar olmuşdu. Məsələn, onlardan biri tibb elmləri doktoru, professor L.Kərimov ömrünün sonunadək – 1962-ci ilə qədər Azərbaycanda tibb sahəsində fəaliyyət göstərmişdir. Həkimlik sənətinə yiyələnməsi onu repressiyanın caynağından qurtarmışdı.

Ceyhun Hacıbəyli o illərdə Parisdə olan Y.V.Çəmənzəminli ilə tez-tez görüşüb dərdləşirdi. Çəmənzəminli yetkin ziyalı idi, həm də Hacıbəylilərlə ana tərəfdən qohumluğu vardı. Bu sətirlərin müəlliflərindən biri kimi Y.V.Çəmənzəminlinin nəvəsi Leyla Vəzirova bu iki ziyalının yaxınlığına dair bir sıra məlumatların olduğunu da təsdiq edir. Onlar Şuşada birgə böyümüşdülər,Yusif Vəzir onun qardaşları Zülfüqarı, Üzeyiri, hətta bacıları Sayadı və Abuhəyatı da çox yaxşı tanıyırdı. O, onların Çölqala məhəlləsində yerləşən evlərinə tez-tez gedərdi. Realnı məktəbdə oxuyarkən də mütəmadi olaraq görüşərdilər... Sonra Ceyhun Peterburqa gedir və orada bir il oxuyandan sonra Parisə gəlir. Parisdə, o həm də Yusif Vəzirin Diplomatiya Universitetində təhsil alan kiçik qardaşı Mirabdulla ilə də dostluq etmişdir. Ceyhun bəy Ali Politexnik Elmlər Məktəbində təhsil alanda da onlar tez-tez görüşürdülər. Çəmənzəminli Kiyevdə oxuyarkən nəşriyyat açdığı zaman Ceyhun Hacıbəylinin “Hacı Kərim” adlı kitabının satışından əldə etdiyi qonararı göndərmişdi ki, mətbəə qurmağa sərf etsinlər.

Tədqiqatlar və əldə olunmuş sənədlər göstərir ki, Ceyhun Hacıbəylinin mühacirətdən sonrakı həyatı, fəaliyyəti, şərəfli yaradıcılıq yolu çox məhsuldar olmuşdur. Yazıçının “Neydanovun işi”, “Stalinin öpüşü və staxanovçu Fatimə” hekayələrində, “Şamaxı məhkəməsi, yaxud bir xainin mükafatı” adlı əsərlərində ötən əsrin 30-40-cı illərindəki repressiya rejimindən bəhs edilirdi.

İkinci Dünya müharibəsinin dəhşətləri Ceyhun bəyin ailəsindən də yan keçmədi. Onun Bakıda anadan olan, 1937-ci ildə Paris Hərbi Akademiyasını müvəffəqiyyətlə bitirən, alman faşizminə qarşı mübarizəyə təyyarəçi kimi qatılan 23 yaşlı oğlu Ceyhun düşmənlə qeyri-bərabər döyüşlərdə qəhrəmanlıqla həlak olmuşdu.

II Dünya müharibəsi dövründə Almaniyada Azərbaycanın azadlığı üçün fəaliyyət göstərənlərin arasında C.Hacıbəyli də vardı. O zaman Avropada mühacirətdə olan M.Ə.Rəsulzadə keçmiş AXC xadimlərini də almanlara əsir düşən azərbaycanlıların rus işğalına qarşı mübarizə aparılması işinə cəlb edirdi. Bu prosesə C.Hacıbəyli ilə yanaşı Xəlil bəy Xasməmmədli, Mustafa bəy Vəkilli, Şəfi bəy Rüstəmbəyov, Adil xan Ziyadxan, Zahid xan Xoyski, Cahangir bəy Kazımbəyli, Əkbərağa Şeyxülislam kimi şəxslər də cəlb olunmuşdu. Onlar təbliğat-təşviqat işləri aparır, Azərbaycan regionunun rəhbəri Ə.Fətəlibəyli–Düdənginskinin vətənpərvərliyini təqdir edirdilər. Lakin mahiyyətcə Hitler Almaniyası Azərbaycanın müstəqilliyi ideyası ilə razılaşmadığı üçün onlar bu işi

dayandırdılar və Azərbaycan legionerleri Hitlerin işğalçılıq siyasətinə alət olmaq istəmədilər. Ona görə də bundan sonra sadəcə istiqlal uğrunda savaşmağı özlərinə məqsəd götürdülər, vətənə qovuşmaq üçün hər şeyə hazır olduqlarını bir daha təsdiq etdilər. Müharibədən sonrakı illərdə C.Hacıbəyli mühacirət tarixində qısa və silinməz iz buraxan “Azərbaycan Milli Birlik Məclisi” idarə heyətinin üzvü olmuşdur. O həm də bu məclisin orqanı olan “Azərbaycan” jurnalının (1952-1954) redaktoru idi. Milli Birlik Məclisinə isə Fətəli bəy Düdənginiski rəhbərlik edirdi. Vətən təbiəti, vətən həsrəti onları rahat qoymurdu. Xalq şairi Zəlimxan Yaqubun “Təbiətə məktubu” burada çox yada düşür; elə bil ki, bu məktub onların o zamankı ürək arzularının ifadəsidir: “Zirvə, səndən qar istəyirəm – sinəmin üstünə qoymaq üçün; dərə, səndən sel istəyirəm – gurultusuna qulaq asmaq üçün; dağ çayı, səndən sürət istəyirəm – dənizlərə qovuşmaq üçün; bulaq, səndən saflıq istəyirəm – uzaqlara yaymaq üçün; qaya, səndən sərtlik istəyirəm – ötkəm və möhkəm olmaq üçün...”

Sovet rejiminin vətəndən didərgin saldığı qeyrətli, vətənsevər soydaşlarımız qürbətdə ömür sürsələr də, tez-tez yaşadığı yerləri dəyişsələr də azərbaycançılıq inamından əl çəkmirdilər. Onların böyük idealını heç nə qıra bilməmişdi.

1953-cü ildə “Azərbaycan” dərgisində (Almaniyada) dərc olunan “Bir millətin namusu” məqaləsində C.Hacıbəyli 27 aprel çevrilişini millətimizin tarixi faciəsi adlandırır və 1918-ci ildə Gəncə üsyanında tökülən qanların yerdə qalmayacağını bildirirdi. Müəllif ürək ağrısı ilə yazırdı: “Ey qəhrəman və əziz Şəhid övladlarımız! Azərbaycan milləti dünyada tək bir azərbaycanlı türkü qalana qədər sizləri unutmayacaq Yaşadığımız ana torpaqlarda rahat-rahat uyuyun”.

Mühacirət illərində C.Hacıbəyli sovet rejimi və kommunist ideologiyasına qarşı mücadilələrdə fəal iştirak etmiş, milli-mədəni irsimizin xarici ölkələrdə layiqincə təbliği ilə tanıdılmasına çalışmış, bu məqsədlə özünün yaradıcılıq imkanlarından, istedadından gen-bol istifadə etmişdir. Çoxtərəfli yaradıcılıq manerasına malik olan Ceyhun Hacıbəyli Azərbaycan, fransız, rus dillərində publisistik və bədii əsərlər yazmış, tərcüməçiliklə məşğul olmuş, qəzet, jurnal redaktoru kimi antisovet təbliğatda mühüm rol oynamışdır. Belə müqəddəs ideallarla yaşayan C.Hacıbəylinin qəlbini Vətən, qardaş, bacı həsrəti ömrü boyu sızıldatmışdır.

Ceyhun Hacıbəylinin çox əhəmiyyətli məlumatlarla dolu “Bir il xəyallarda və ... bütöv bir ömür” əsəri hazırda Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunda nəşrə hazırlanır. Onun mühacirətdə qələmə aldığı əsərlərdə kommunist ideologiyası, rejimi, kolxoz-sovxoz həyatı, ateist tərbiyəsi, sovet din siyasəti və s. konkret, tutarlı faktlarla kəskin, eyni zamanda yüksək sənətkarlıqla tənqid edilir. Lakin bütün bunlar Ceyhun Hacıbəylinin ürəyindəki niskili yox edə bilmirdi. Vətən həsrəti onun qəlbini göynədirdi.

1948-ci il noyabrın 23-də gecə saat 2-də Ü.Hacıbəylinin ürəyi dayananda Ceyhun bəy Fransada idi. O, uzaq ellərdən vətəninə ancaq bu sözləri yazdı: “Mərhum qardaşım musiqi dünyasında Azərbaycanı Şərqin İtaliyası etmişdir”.

C.Hacıbəylinin bir məktubundan gətirdiyimiz sətirlər onun bu qəlb ağrılarını açıq göstərirdi. O yazırdı: “Doğmalarımdan ayrılmağımın həsrətini bu qırx il ərzində tez-tez çəkirəm. Ən çox da yadıma düşən bacılarımdı. Bəzən də anamın və ortancıl qardaşımın surətləri bacılarımın surətlərini əvəz edirdi. Yadımdadır, mən Fransaya gələndə bacılarım necə acı göz yaşları tökdülər. Anamın dolu gözləri xəyalımdan çəkilmir. Mən onları inandırırdım ki, cəmisi iki aylığa

gedirəm. Nə üçün ağlayırsınız? Amma mən özüm də bilmədən onları aldatmışam. İndi məmləkətimdən ayrılmağımın 41 ilini yaşayıram. Onları bir daha görmədim və heç vaxt da görməyəcəm. Doğmalarım - kişilər və qadınlar bir-birinin ardınca dünyadan köçürlər. Elə mən özüm də köçəcəyəm...”. C.Hacıbəylinin Fransa mətbuatında çap etdirdiyi məqalələri Azərbaycan ədəbiyyatı tarixi və mədəniyyətinin Avropada yayılmasına kömək etmişdir. O bu məqalələrin məzmunu ilə yalnız oxucuları tanış etməklə kifayətlənmir, həm də onları yeni faktlarla zənginləşdirir, çox vacib materialların Avropa mətbuatına çıxarılması ilə öz ideallarını həyata keçirirdi.

1962-ci ildə Parisdə Ceyhun Hacıbəylinin qəlbi döyünməkdən qaldı. Onun qəbri Parisin Sanklu qəbiristanlığındadır. Əlimərdan bəy Topçubaşovun da qəbri buradadır. Onların qəbri yanaşıdır. Ümummilli lider Heydər Əliyev Parisdə rəsmi səfərdə olarkən bu qəbiristanlıqda olmuş, Azərbaycanın mühacir oğullarının qəbrini ziyarət etmişdir. Bu səfərdən sonra həmin qəbiristanlıqda abadlıq işləri aparılmışdır. Onlara müstəqilliyi görmək qismət olmasa da, müstəqillik qazanmağımızda payları az olmamışdır.

C.Hacıbəylinin əsərləri Azərbaycan bədii publisistikasının, ümumiyyətlə, mühacirət ədəbiyyatının ən parlaq və nadir nümunələrindəndir.

***Rəyçi*: *prof. N.Cəfərov***

## İstifadə edilmiş ədəbiyyat


1. Üzeyir Hacıbəyov ensiklopediyası. Bakı, 1996.
2. Hacıbəyli C. Qarabağ dialekti və folkloru. Bakı: Ozan, 1999.
3. Mirəhmədov Ə. Azərbaycan jurnalistləri və naşirləri (Ensiklopediya). Bakı, 2013.
4. Tahirli A. Ceyhun Hacıbəylinin bədii və publisistik irsinə bir nəzər. “Ədəbiyyat qəzeti”, 2015, 26 dekabr.
5. Tuncay İradə. Onlar 100 nəfər idi. “Füyuzat” jurnalı, 2015, №3.
6. Nəcəf Ruslanoğlu. Qəribə tale. “Təhsil problemləri” qəzeti, 2016, № 07-08.


**Л.Вазирова,**
**Н.Наджафов**

**Иммигрантская жизнь братьев Гаджибейли**

**Резюме**

В статье говорится о жизни, общественной деятельности и творческом пути Джейхуна Гаджибейли. В статье рассматриваются оба периода его творчества: 1905-1919-е годы и 1919-1962 годы. Эти произведения являются самыми прекрасными примерами литературы.

**L.Vazirova,**
**N. Najafov**

**The Hajibeylis’ immigrant brother**

**Summary**

The article is dedicated to Jeyhun Hajibeyli’s life, political and literary activity. In the article both periods (1905-1919 and 1919-1962) of his literary activity are analyzed. It is noted that his works are the most valuable examples of immigrant literature.



# ELMİ-PEDAQOJİ İRSİMİZDƏN BİR SƏHİFƏ

**Alxan Bayramoğlu**
***Bakı Dövlət Universitetinin professoru, filologiya üzrə elmlər doktoru***

***Açar sözlər:*** *ustad pedaqoq, dərslik, müəllimlər qurultayı, tövsiyə.*
***Ключевые слова:*** *мастер своего дела , учебник, съезд учителей, рекомендации.*
***Key words:*** *master pedagogue, textbook, teachers' convention, recommendation.*

Azərbaycan təhsil tarixinə müəllim, pedaqoq, dərslik müəllifi kimi daxil olan Mirzə Məhəmməd Axundov eyni zamanda şair, publisist, dramaturq, tərcüməçi, ədəbiyyat tarixçisi, teatr xadimi kimi tanınmış, Azərbaycan Demokratik Respublikası dövründə dövlət və hökumət işlərində çalışmış, parlamentin üzvü seçilmişdir. O, 1875-ci ildə Gəncədə ruhani ailəsində doğulmuş, ibtidai təhsilini Gəncə mədrəsəsində almışdı. Atası Mirzə Kərim Gəncənin nüfuzlu və açıqgörüşlü ruhanilərindən idi. XIX əsrin ikinci yarısından başlanan və ilk Azərbaycan qəzeti “Əkinçi”nin nəşri ilə qüvvətlənən, yeni keyfiyyət alaraq sistemli hala düşməyə başlayan milli-mənəvi oyanma prosesi Gəncənin ədəbi-mədəni mühitindən də yan ötməmişdi. Çünki bu tarixi-inzibati və mədəni mərkəz həmişə dövrün ruhu ilə nəfəs almış, eyni zamanda Azərbaycan ictimai-mədəni fikir xəzinəsinə özünün layiqli töhfələrini vermişdir. Gəncənin tarixi ənənələri, mədəni, elmi potensialı bu mühitin sağlamlığına, ictimai-bədii fikrimizin inkişafına təkan verən öncül regionlardan biri olmuşdur. Odur ki, Gəncənin ziyalılarının əksəriyyəti, silkindən asılı olmayaraq, dövrün qabaqcıl ideyaları ilə nəfəs almış, gənc nəslin layiqli vətəndaş kimi yetişdirilməsi qayğısını ön planda saxlamışlar. Belə bir mühitdə yetişən, bacarığı ilə çoxlarından seçilən Məhəmməd mədrəsə təhsilini qurtardıqdan sonra Gəncə gimnaziyasına daxil olmuşdur.

Gimnaziyada oxuduğu illərdə rus dilini öyrənərək, bu dilin vasitəsi ilə rus və Avropa ədəbi-ictimai fikrinin nümunələri ilə tanış olmuş, eyni zamanda klassik Şərq ədəbiyyatına, o cümlədən Sədi yaradıcılığına dərindən bələd olmuşdur. Ruhani ailəsində böyüyüb boya-başa çatan Məhəmmədə Sədi yaradıcılığının əxlaqi-didaktik keyfiyyətləri daha çox təsir etmişdir. Odur ki, Mirzə Məhəmmədin həyat yolu humanizm, insanpərvərlik, daxili saflıq, əxlaqi kamillik, vətənpərvərlik, pisliyə müqavimət, haqqa dayaq durmaq, məzlumu zalımın zülmündən qorumaq və s. kimi bəşəri prinsiplər əsasında davam etmişdir.

Ədəbi-elmi aləmdə yaxşı tanınan Mirzə Məhəmməd eyni zamanda bacarıqlı müəllim-pedaqoq olmuşdur. Tədadüfi deyildir ki, gimnaziyanı qurtardıqdan sonra elə orada da işə başlamışdır. Fəaliyyəti ərzində şagirdlərini doğma dilin incəliklərinə yiyələndirmək, onları vətənə və xalqına sonsuz məhəbbət ruhunda böyütmək, bir sözlə, bugünkü körpələri gələcəyin layiqli vətəndaşı kimi böyütmək üçün var qüvvəsi ilə çalışmışdır. M.M.Axundov həm o zamankı Yelizavetpol (Gəncə) gimnaziyasının təbiət və ana dili müəllimi, həm də bir vətəndaş

kimi, şagirdlərin milli və əxlaqi kamilliyinin keşiyində dururdu. Onun 1897-ci ildə çapdan çıxan “Sərfi-türki” adlı dərsliyinin titul vərəqində müəllifin adı belə göstərilib: “Yelizavetpol gimnaziyasının müsəlman müəllimi Mirzə Məhəmməd Axundov”.

Buradan aydın olur ki, M.M.Axundov gimnaziyada 1890-cı illərin əvvəllərindən müəllim işləmişdir. Bu fikri söyləmək üçün bizə həmin dərsliyə müəllifin yazdığı yeddi maddəlik müqəddimənin elmi-metodiki səviyyəsi də əsas verir. Müqəddimədə deyilir:

“Cümlə müəllimlərinə bəndənin bu kitabını mətdum buyurub tədris edənlər təvəqqeyi-külli edirəm, bəndənin bu bir neçə sözlərimi həmişə nəzərdə tutub tədris buyursunlar:

1) Bu kitabın hər bir fəslini və ya hər bir mətləbini oxudanda mülahizə buyursunlar, hərgah şagird keçən dərsi öyrənməyibdirsə, o biri dərsi başlamasınlar.

2) Hər bir məsələlərdə şagirdlərə əmr etsinlər ki, hər biri fikirləşib əlahiddə məsələlər gətirsinlər.

3) Hər bir gün oxuduğu dərsə münasib neçə məsələlər dəftərdə və ya kağız üstə yazdırsınlar”.

Bu maddələrdə müəllif tədris olunan fənnin şagirdlərə dərindən mənimsədilməsi məqsədini güdür. O, əvvəlki dərslərin özündən sonrakılar üçün özül, alt pillə rolunu oynadığını əsas tutaraq, təlim zamanı tikilən elm binasının bütün dayaqlarının möhkəm qurulması naminə vaxt itkisinə yol verməkdən çəkinmir. Bu zaman tədrisin əsaslılığı prinsipinə üstünlük verir.

Mirzə Məhəmmədin fikrincə, təlim prosesində şagirdlərin fəallığına və onlarda sərbəst düşüncənin inkişafına da şərait yaradılmalıdır. Bunun üçün həm dərsin izahı prosesində keçilən mövzuya aid yeni misallar tapdırıb onlara öz fikirlərini əsaslandırmağa imkan verməkl, həm də ev tapşırığı kimi, dərslikdə olmayan misallar tapdırıb dəftərlərinə yazdırtmaq tələbini tövsiyə edirdi. Bütün bunlar şagirdlərin şifahi və yazılı nitqlərinin inkişafına şərait yaratmaqla yanaşı, yeni dərsin şagirdlər tərəfindən mənimsənilməsinə imkan verir.

M.M.Axundov şagirdlərdə zehni inkişafdan başqa, yaddaşın möhkəmləndirilməsinə də diqqət yetirirdi. Odur ki, müqəddimənin dördüncü bəndində belə bir tələb qoyurdu:

“4) Bu kitabda məzkur olan qəvaidi şagirdə əzbərdən öyrənməyə əmr etsinlər”.

Beşinci bənd də zehni inkişafın düzgün tənzimlənməsi məqsədini güdür:

“5) Şagirdə ol qədər dərs verməsinlər ki, şagird onun öhdəsindən gələ bilməsin və yainki şagirdlər fəhmlilikdən kəndfəhm olalar”.

Burada şagirdlərin yaş və psixoloji səviyyəsi mahir bir pedaqoq qayğıkeşliyi ilə nəzərə alınır. Belə ki, müəllimlərə dərs verərkən şagirdlərin yaşı və zehninin inkişaf, tutum imkanları ilə hesablaşması tövsiyə olunur. Eyni zamanda xəbərdarlıq edilir ki, bu tələbə əməl olunmasa, müəllim qarşısına qoyduğu başlıca məqsədə – dərsin şagirdlərə mənimsədilməsi tələbinə nəinki nail ola bilmək, üstəlik onların zehninin korşalmasına, şagirdin dərsdən qorxmasına bais olarlar.

Dərslikdə hərflərin öyrədilməsindən sonra dilin qrammatik qaydaları öyrədilir. Ona görə müəllif belə bir cəhəti də nəzərə alırdı ki, bəzi müəllimlər tələskənlik edib qrammatik qaydaların öyrədilməsinə başlayırlar. Bu, pedaqoji cəhətdən düzgün deyil. Çünki qeyri-elmi metodika ilə keçilən dərslərin nəticəsində birinci və beşinci bəndlərdə qoyulan tələblər pozular və şagirdlər “kəndfəhm olarlar”. Təlim prosesində bu cür xətalara yol verilməsinin qarşısını almaqdan ötrü dərslik müəllifi məsləhət görürdü ki:

“6) Əlbəttə, şagirdlər hərfləri bitişdirməyi

bilməmiş sərf qismi başlatmıyalar".

M.M.Axundov dövrün xüsusiyyətini, o dövrkü məktəblərdə başlıca olaraq Quranın, Gülüstan və Bustanın tədris vəsaiti kimi hökm-fərma olduğunu da nəzərdən qaçırmırdı. Bilirdi ki, dərs prosesində ərəb söz birləşmələrinin, izafət və tərkiblərinin mənimsənilərək, yazılı və şifahi nitqdə onlardan istifadə edilməsi zərurəti yaranır və bu zaman şagirdlər müəyyən çətinliklərlə qarşılaşırlar. Bu cür çətinliklərin qarşısının vaxtında alınmasını təmin etmək üçün müəllif yazırdı:

"7) Ərəb ləfzinin kəlmələri ki, bu kitabda zikr olunacaq onun fərilərini və ifratlarını qandıralar ki, bu kəlmədən bu kəlmə müştaq olur".

Buradan görünür ki, M.M.Axundov təlim prosesində ərəb və fars tərkibləri, xüsusilə söz birləşmələri, izafət, tərkib və s. ilə əlaqədar şagirdlərin nə kimi çətinliklərlə üzləşdiklərini, bu çətinliklərin anlaşığı mürəkkəb olan söz və ifadələrin şagirdin beynində dumanlıqlar yaratdığını çox gözəl bilir və təlim prosesində bütün bunların nəzərə alınaraq aradan qaldırılmasının səmərəli yollarını göstərməyə çalışırdı.

Dərsliyin sonundakı nəsihətlərinin birində "insan üçün təlim çox lazımdır", - deyən pedaqoq həm dərs dediyi zaman, həm də dərslik yazarkən şagirdlərdə, birinci növbədə, fəallıq, təşəbbüskarlıq keyfiyyətlərini inkişaf etdirməyə çalışırdı. Odur ki, dərslikdə hərflərin öyrədilməsi mərhələsindən sonra birbaşa olaraq feilin tədrisinə başlanmasına təsadüf kimi baxmaq doğru olmazdı. Müəllim-pedaqoq, uşaqların yaş və anlaq səviyyəsinə uyğun olaraq, feilin zamanları, növləri, şəkilləri haqda ibtidai bilik aşılamaq üçün daha çox uşaq təxəyyülünə uyğun və ətraf aləmdən onlara tanış olan canlı, əşya və predmetlərlə bağlı onların hərəkətlərini ifadə edən misallar verir. Həmin xarakterik misallar uşaqların feillə bağlı dolğun ibtidai bilik almalarına kömək edir.

Qeyd etdiyimiz kimi, bütün bunlar 1897-ci ildə çapdan çıxan "Sərfi-türki" dərsliyinin müəllifinin bir neçə illik təcrübə və müşahidə imkanlarına malik müəllim-pedaqoq olduğunu söyləməyə əsas verir.

Mirzə Məhəmməd Axundov Gəncə gimnaziyasının şəriət və ana dili müəllimi olmaqla qalmayıb, elmi-pedaqoji fəaliyyətini davam etdirirdi. O, bir tərəfdən dövri mətbuat orqanlarında satirik və publisistik yazılarla çıxış edir, yalançı, fırıldaqçı, mollaları dindən "quldurçuluq tüfəngi" kimi istifadə edərək xalqı cəhalətə, nadanlığa sürükləyən üzdəniraq ruhanilərin iç üzünü, onların islama vurduqları zərərlərin mahiyyətini üzə çıxartmağa çalışır, digər tərəfdən də gənc nəslin əsl islam övladı kimi kamil böyüməsi qayğısına qalaraq şəriət dərsliyi yazırdı. "Əqaidi əl-müslimin. Təmrin və duacat qismi" adlı dərslik bu istiqamətdə uzun illərdən bəri aparılan pedaqoji qənaətlərin nəticəsi kimi üzə çıxmışdı. Kitabın titul səhifəsində müəllifin ad və familiyası belə göstərilib: "Gəncə gimnaziyasının əqaid və türk dili müəllimi Mirzə Məhəmməd Axundzadənin əsəridir". Birinci və ikinci sinif şagirdləri üçün nəzərdə tutulan bu dərsliyin də əvvəlində müəllifin elmi-pedaqoji bir "Tövsiyə"si çap olunmuşdur. "Tövsiyə"də müəllif dərsliyin iki hissəyə - "təmirin və duacat qisminə" ayrılmasının səbəbini təmrinlərin birinci, duacatların isə ikinci siniflərdə öyrədilməsinin nəzərdə tutulması ilə izah edir. O, birincilərin hələ hərfləri tanımadıqlarını nəzərə alaraq, dərs ilinin əvvəllərində onlara verilən biliklərin şifahi yolla, uşaqlar hərfləri keçib qurtararaq, artıq sözləri qoşa bilib oxuduqları dövrdən başlayaraq isə onları kitab üzərində işlətməklə həm də yazılı yolla aşılamağı məsləhət bilib yazırdı:

"…Birinci qismi təmin etdikdə dərs

sənəsinin əvvəlinci nisfində əsla ətfalə kitab üzərindən oxutmuyub, türk hürufatını və onları qoşub oxumağı iyicə tanıyınca, dərc olunan mətalibi mürur ilə xaricdən hifz etdirib, ikinci nəsfəsinə düxulunda, yəni ətfal türk hürufatına və onları qoşub oxumağa alışdıqdan sonra kitab üzərindən həman xaricdən hifz olunmuşlardan başlayaraq oxutmalıdır”.

Mirzə Məhəmməd tədris zamanı şagirdlərin yüksək mənimsəmə əldə etmələri üçün əvvəlcə ərəb əlifbasında həmin dilin xüsusiyyətlərindən irəli gələn çətinliklərin aradan qaldırılmasını məsləhət görürdü. Göstərirdi ki, yalnız şagirdlər bu mürəkkəblikləri mənimsəyib ayırd edə bildikdən sonra onları kitab üzərində işlətmək olar. Bu zaman yeri gəldikcə qarşıya çıxan çətin anlaşılan söz və ifadələrin mənalarının müəllim tərəfindən mümkün qədər aydınlaşdırılmasını da lazım bilirdi.

“Kitabçanın ikinci qisminə gəldikdə ətfal üçün ərəb xəttinin şivəsi qeyri-aşina olduğu üçün qabaqca bir neçə müddət vaxtı ərəb xəttinin şivələrini tanıtdırmağa sərf edib, ətfal şiveyi-xəttə lazımınca aşina olduqdan sonra kitab üzərindən tədric ilə dərs verməlidir.

Ara bir ətfal üçün bəzi mənası qeyriməlum kəlmələr rast gələrsə, müəllim bəqədri – imkan asan misal və ya tösiyələr ilə onları ətfalə qandırmalıdır”.

Müəllifin məsləhətlərinin əhatəliliyində və incəliklərində şagirdlərə, onların hələ bərkiməmiş orqanizmlərinə, şüur və düşüncələrinin inkişaf xüsusiyyətlərinə sonsuz qayğı və diqqəti görməmək olmur. Bu münasibətdə gənc nəslin normal fiziki və əqli inkişafı üzərində vətəndaşlıq həssaslığı və məsuliyyəti duyan adamın ürək çırpıntıları görünür. Həmin münasibət aşağıdakı sətirlərdə qabarıqlığı ilə üzə çıxır:

“Hər halda ətfalın əhvalını müraat edib, hər günə isə təklif malaitaq edib, biçarələri kəndfəhm etməkdən həm həzər etməlidir”.

Burada Mirzə Məhəmməd şagirdlərin yaşını, hər birinin fərdi qavrama xüsusiyyətlərini bir pedaqoq həssaslığı ilə nəzərə almağın məsuliyyətini də diqqətə çatdırır ki, əks halda uşaqlar fəhmlilikdən “kəndfəhmliliyə” doğru yönəldilərlər. Bu isə gələcək vətəndaşın nadanlığı, kütlüyü və əqli geriliyinə səbəb olar. Demək, hər bir müəllim gələcək vətəndaşlarımızın əqli, şüuri və intellektual səviyyəsi qarşısında məsuliyyət daşıyır. Mirzə Məhəmməd öz müəllim həmkarlarına birinci növbədə bu məsuliyyət hissinin müqəddəsliyini çatdırmağa çalışırdı.

Elmi ədəbiyyatda o dövrkü dərslik müəllifləri fəaliyyətlərinin məzmun və xarakterinə görə “mütərəqqi mahiyyətdə” yazanlar və “mollaxana və mədrəsədə təhsil alanlar üçün” yazanlar, deyə iki qrupa ayrılaraq, Mirzə Məhəmməd ikinci qrupa aid edilir. Bu haqda oxuyuruq:

“Hüseyn Əfəndi Əfəndiyev, Axund Əbdürrəhim Hadizadə, Molla Həsən Tahirov, Mirzə Məhəmməd Axundzadə, Hacı Şeyx Həsən Mollazadə Gəncəvi, Mirzə Abbas Mirzəzadə və başqalarının yazdıqları oxu kitabları, dərsliklər isə daha çox mollaxana və mədrəsədə təhsil alanlar üçün nəzərdə tutulurdu. Bu kitablarda dini məzmunlu hədis və rəvayətlər, müsəlmançılığın şərtlərindən, əxlaq və davranış qaydalarından bəhs edən əsərlər verilirdi”.

Qeyd edək ki, bu sırada adı çəkilən Mirzə Məhəmməd Axundov yalnız dini dərsliklər yazmaqla qalmayıb, eyni zamanda gimnaziyanın ibtidai sinif şagirdləri üçün yuxarıda haqqında bəhs etdiyimiz “Sərfi-türki” dərsliyini də yazmışdır. Bundan başqa, M.M.Axundovun dərslikləri maarifçilik işığında qələmə alınmışdır. Yəni bu kitablarda təlim-tədris işləri milli dəyərlərə və elmi-nəzəri prinsiplərə əsaslanıb, gənc

nəslin ətalət və cəhalətinə deyil, mənəvi təmizliyinə, əxlaqi saflığına, əqli inkişafına, intellektual səviyyəsinin yüksəldilməsinə xidmət edirdi. Bu ali məqsəd o dövrün bütün demokratik fikirli müəllimlərinin və ümumiyyətlə, ziyalılarının amalı idi. Onlar başa düşürdülər ki, millətin inkişafı və gələcək xoşbəxtliyi üçün gənc nəsli elmli, savadlı, həm də milli ruhda yetişdirmək lazımdır. Bunun üçün də mövcud təhsil sistemində köklü islahatlar aparılmalı, xalq maarifi xalqın nurlu sabahının təminatçılarından birinə çevrilməlidir. Odur ki, "Nicat" maarif cəmiyyəti 1906-cı ilin avqustunda Azərbaycan müəllimlərinin qurultayını keçirməyi qərara aldı. Həmin məsələ ilə əlaqədar Azərbaycanda pedaqoji fikrin inkişaf tarixinə dair fundamental əsərlərin müəllifi olan mərhum pedaqoq-alim, professor Əhməd Seyidov yazırdı:

"1906-cı ilin avqust ayında çağırılacaq müəllimlər qurultayına hazırlıq həmin ilin may ayından başlanmışdır. 1906-cı il may ayının 21-də Bakı məktəblilərinin azərbaycanlı müəllimləri "Nicat" qiraətxanasına toplaşıb rus-tatar (Azərbaycan) məktəblərinin islahatına dair müzakirə açmışlar…

Bakı müəllimlərinin bu müşavirəsi müzakirə nəticəsində belə qərara gəlmişdir ki, 1906-cı ilin avqust ayının 15-də Bakıda Azərbaycanlı müəllimlərin qurultayı çağırılsın və bu qurultaya Qafqazın hər yerindən müəllimlər dəvət olunsun".

Beləliklə, mətbuatda Azərbaycan müəllimlərinin birinci qurultayına hazırlığın gedişi və orada müzakirə olunacaq məsələlər ətrafında yazılar görünməyə başlayır. Burada həlli vacib məsələlərdən biri mövcud proqram və dərslikləri dərindən öyrənərək, onlardakı öyrənilməli cəhətləri götürmək, eyni zamanda dövrə münasib olan daha mütərəqqi proqram və dərsliklər hazırlamaq idi. Təbii ki, həmin məsələ ilə əlaqədar o dövrün məktəblərində əsas fənlərdən sayılan ana dili və şəriət dərsliklərinin, bu fənlərin tədrisinin təkmilləşdirilməsi də daxil idi. Mirzə Məhəmməd Axundov təcrübəli və qabaqcıl görüşlü pedaqoq-müəllimlərdən biri kimi həm qurultaya hazırlıq işində, onun keçirilməsində, həm də qərarlarının yerinə yetirilməsində fəal iştirak etmişdir. Təsadüfi deyil ki, Azərbaycan müəllimlərinin birinci qurultayının seçdiyi üç fənn komissiyasının birinin – "elmi-hesab komissiyasının" tərkibinə daxil olan üzvlərdən biri də Mirzə Məhəmməd Axundov idi. O, bu qurultayda, sonralar özünün də yazdığı kimi, qurultayın təşkilat komitəsinin sədri və idarə heyətinin sədr müavini kimi fəaliyyət göstərmiş Nəriman Nərimanovla da tanış olmuşdu.

1907-ci il avqustun 25-dən sentyabrın 5-dək keçirilən ikinci müəllimlər qurultayında qoyulan məsələlərdən biri də məktəblərdə şəriət dərslərinin qaydaya salınması və bu zaman uşaqların məzhəblərə – sünnü və şiə olmalarına görə bölünüb hər birinə ayrı-ayrı müəllimin dərs deməsi qaydasının ləğv edilməsi məsələsi də kəskin şəkildə qoyulmuşdu. Bununla əlaqədar Əhməd Seyidov yazırdı:

"Qurultay məktəblərdə təlim-tədris prosesində uşaqları valideynlərin mənsub olduğu dini təriqətlərə, sünnü və şiə olmaqlarını necə fərqləndirməyin əleyhinə çıxdı. Məlum olur ki, sünnü və şiə bölgüsü yalnız istismarçıların faydasına olan bir şeydir. "Parçala və hökm et" şüarından sui-istifadə edən istismarçılar islam dininə mənsub xalqlar arasına nifaq salmışlar. Bu məsələdə müsəlman ruhaniləri pozucu rol oynamış, çarizmin mürtəce siyasətinə kömək etmiş, Azərbaycan xalqının tərəqqi və inkişaf yolunu hər cəhətdən kəsməyə çalışmışlar. Məhz buna görə qurultay öz qərarında göstərirdi ki, idareyi-ruhaniyə rəislərindən tələb etmək ki, min bəd elmi-ilahi müəllimlərini bila fərq hər iki tərəfdən ləyaqətli və qabiliyyətli

adamlardan təyin etsinlər.

Sünnülüyə və şiəliyə etina etməyib, ancaq bir istedad və qabiliyyət yetirsin”.

Azərbaycan müəllimlərinin ikinci qurultayının keçiriləcəyi yer əvvəlcə Gəncə şəhəri seçilmiş və bu barədə müvafiq razılıq alınmışdı (Lakin sonradan ortaya çıxan bəzi əngəlləri aradan qaldırmaq üçün II qurultay da Bakıda keçirilmişdir). Dərhal qurultaya qızğın hazırlıq işləri görülməyə başlanmışdı. Təbii ki, Gəncə gimnaziyasının ana dili və şəriət müəllimi və I qurultayın komissiya üzvlərindən biri kimi, bu işlərdə, qurultaya çıxarılacaq məsələlərin hazırlanmasında Mirzə Məhəmməd Axundov da fəal iştirak edirdi. Odur ki, onun həm müəllimlik fəaliyyəti, həm də yazdığı şəriət dərsliyi müəllimlər qurultayının prinsip və qərarlarına əsaslanırdı. Yəni bu dərslikdə ayrı-ayrı təriqətlərin mənafeyi nəzərdə tutulmayıb, vahid müsəlman qanunları şərh olunurdu. Burada müsəlmanların peyğəmbəri yalnız Məhəmməd əleyhissəlam göstərilir, Əli isə Allahın valisi kimi təqdim edilir. Eyni zamanda əxlaqi məsələlər şərh olunaraq, müsəlmanlar doğruluğa, ticarətdə halallığa, verdiyi sözə əməl etməyə, yaxşı əməllərlə məşğul olmağa, düz yoldan azmamağa, ailədə ər və arvadın bir-birinə sədaqət bəsləməsinə, ata-anaya və övlada məhəbbət bəsləyib, onların sözünü tutmağa, günahsız adamların qanlarına bais olmaqdan çəkinməyə və s. səslənilir.

Ümumiyyətlə, Mirzə Məhəmmədin həm ana dili, həm də şəriətə aid yazdığı dərsliklərdə vətən övladının əqli, şüuri, idraki inkişafı, əxlaqi saflığı, mənəvi təmizliyi və onların zəhmətkeş, vətənpərvər, milli təəssüb hissi yüksək olan bir millət xadimi kimi böyüməsi xüsusi diqqət mərkəzində dayanmışdır. Onun dərsliklərinə yazdığı ön söz – “izahatlarda” gənc nəslin sağlam, qüvvətli və zəkalı böyüməsi yolunda özünü şam kimi əridib, həmkarlarını da bu problemlərə məsuliyyətlə yanaşmağa çağıran pedaqoq-müəllimin vətəndaşlıq hisləri ilə döyünən ürəyinin çırpıntıları duyulmaqla yanaşı, yuxarıda qeyd etdiyimiz kimi, zəngin təcrübə, diqqətli müşahidə və analitik təhlildən irəli gələn elmi-pedaqoji dərinlik də vardır.

Mirzə Məhəmməd Axundov millət balalarının elmi biliklərə, əxlaqi dəyərlərə yiyələnməsinə nail olmaq üçün müəllim, pedaqoq, şair, ictimai xadim kimi çalışmaqla qalmayıb, ideya-mənəvi cəhətdən dəyərli publisistik əsərləri ilə də çalışırdı. Onun 1910-cu ildə Gəncə “Nəşri-Maarif” cəmiyyətinin naşirliyi ilə Əhməd Hacı Həsənzadə mətbəəsində çap etdirdiyi “Röyam, yaxud həqiqətə təsadüf” əsəri bu istiqamətdə gördüyü işlərin nəticəsi kimi üzə çıxmışdır.

Əsərdəki təsvir və təhlillərdən görünür ki, Mirzə Məhəmməd müsəlmanlığın xilasını islam dininin xalqa təhrifsiz çatdırılmasında görür.

Mirzə Məhəmmədi belə bir mövzuda əlinə qələm almağa sövq edən məqsəd və məramın özü onun vətənpərvərliyindən, öz xalqının xoşbəxt gələcəyinin təmininə kömək cəhdindən irəli gəlib, təqdir olunmağa layiqdir. Burada o, hər şeydən əvvəl, vətənpərvər ziyalı, demokratik görüşlü maarifçi və millətin xoşbəxtliyi, vətənin abadlığı, amalı uğrunda dönmədən çalışan mübariz, təəssübkeş bir vətəndaş yazıçı, müəllim, pedaqoq və publisist kimi rəğbət doğurur.

Mirzə Məhəmməd Axundov millətin azadlıq və istiqlaliyyəti, onun hüquq və şərəfinin qorunması və tərəqqisi yolunda yalnız qələmi və zehni ilə deyil, həm də əməli şəkildə çalışırdı. Belə ki, tarixdən ermənilərin türklərə, o cümlədən Azərbaycan türklərinə qarşı nə kimi soyqırımları törətdikləri, bu işlərin başında isə onların məşhur millətçi daşnaksütun partiyalarının durduğu məlumdur. 1906-1907-ci illərdə törədilən soyqırımı dövründə həmin daşnak-

sütun partiyasına qarşı Azərbaycanda məşhur mütəfəkkir, publisist və ictimai xadim Əhməd bəy Ağayevin təşəbbüsü və təşkilatçılığı ilə 1906-cı ildə "Difai" deyilən partiya yaradıldı.

"Difai" partiyasının başlıca məqsədi, onun məramnaməsində də deyildiyi kimi, daşnakçıların türk Azərbaycan yurdunun xarabalıqları üzərində öz səadətlərini qurmağın qarşısını almaq, onların türkləri terror yolu ilə etnik təmizləmə niyyətlərinə yol verməmək, Azərbaycan xalqının şərəf və ləyaqətini qorumaq idi. Filologiya elmləri doktoru Vilayət Quliyev bunu nəzərdə tutaraq yazırdı: "… "Difai" əslində həmin qanlı-qadalı illərdə (1906-1907-ci illər nəzərdə tutulur. – A.B.) Azərbaycan türklərinin milli varlığını, şərəf və ləyaqətini qoruyan, onların zülmə boyun əymədiyini göstərən yeganə hərbi-siyasi təşkilat idi". O, xalqı düşdüyü bəladan xilas etmək üçün birinci növbədə onu maarifləndirməyi və iqtisadi-maliyyə cəhətdən qüvvətləndirməyi nəzərdə tuturdu. Bunun üçün mülkədar kəndlilərinin pulsuz olaraq kəndlilərə verilməsi, inzibati məhkəmə və dini sahələrdə geniş özünüidarə tələbləri ilə çıxış edilməsi, Qafqazdakı müsəlman vilayətlərinin muxtariyyəti, şiə və sünnü təriqətlərinə son qoyub, xalqın mənəvi və siyasi yekdilliyini yaratmaq, məktəb və maarifin xalq arasında geniş və şüurlu şəkildə yayılmasına nail olmaq və s. məsələlərin tezliklə həllinə çalışılırdı. V.Quliyev "Difai"nin proqram və fəaliyyətinə əsaslanaraq, belə bir doğru qənaətə gəlir ki, "əvvala… "Difai"…xalqın geniş təbəqələrinin birləşdiyi bir təşkilat idi. İkincisi, "Difai"… cəmiyyətin inkişafında təkamül proseslərinə əsaslanan, maarifçilik, ictimai bərabərlik və sosial-demokratiya kimi dəyərlərə üstünlük verən bir siyasi partiya idi. Nəhayət,…qanlı-qadalı birinci rus inqilabı dövründə "Difai" Azərbaycan türklərinin milli təhlükəsizliyinin təmin olunması kimi çətin bir vəzifəni də öz üzərinə götürmüş və milli dövlət qurumları olmadığı bir şəraitdə bu işin öhdəsindən bacarıqla gəlmişdi".

Mirzə Məhəmməd Axundov "Difai" partiyasının təşkilinə başlandığı elə ilk günlərdən onun üzvü olmuşdur. Bu barədə elmi ədəbiyyatda oxuyuruq: "Əhməd bəy… Gəncədə tanınmış vətənpərvərlərlə görüşərək orada "Difai" təşkilatını yaratdı. Ələkbər və Ələsgər Xasməmmədovlar, Həsən bəy Ağayev, Ələkbər bəy Rəfibəyli, Şeyxülislam molla Məmməd Pişnamazzadə, gimnaziyada din müəllimi işləyən Mirzə Məhəmməd Axundzadə, müəllim Mirzə cavad, gənc müəllim İdris Axundzadə və başqaları Gəncədə təsis olunan "Difai" təşkilatı komitəsinin üzvləri idilər".

Şübhəsiz, Mirzə Məhəmmədi bu təşkilata cəlb edən əsas cəhətlərdən biri onun vətənpərvərliyindən əlavə, "Difai"nin proqramında həm də xalqın maarifləndirilməsi məsələsinin başlıca yerlərdən birini tutması idi.

"Difai" az bir müddət ərzində öz gücünü həm daşnaklara, həm də çar məmurlarına göstərə bildi. Odur ki, həmin təşkilat, onun üzvləri, fəaliyyəti üçün vəsait mənbələri və s. haqda məlumatlar toplanmağa başlandı. Bu işdə bəzi yerli dəmtutanlar və çarizmin nökərləri də fəallıq göstərməyə, öz ağalarından ənam almağa çalışırdılar. Bunlardan biri – Gəncə həbsxanasının imamı olan Molla Atakişi (molla Hədi) çar gizli polisinə xəfiyyəçilik edərək "Difai" partiyasının bir neçə üzvünü ələ verdi. Ələ verilənlər arasında Mirzə Məhəmməd Axundov da var idi. O, Türküstana – Zakaspiyə sürgünə göndərildi. Bu barədə sonralar Mirzə Məhəmməd özü yazırdı: "1908-ci ildə mən Nikolay jandarması tərəfindən həbs olunmuş və 1910-cu ildə 5 il müddətinə Qafqaz bölgəsindən kənara sürgün olunmuşam. Romanovlar sülaləsinin 300 illiyi münasibəti ilə 1913-cü ildə 3 il, bir

aylıq sürgündən sonra mən Qafqaza qayıtdım və siyasi fəaliyyətimi davam etdirməyə başladım”. Mirzə Məhəmmədin mollanın “danos”u ilə əlaqədar tutulduğunu və bu münasibətlə şair Əli Nəzminin “Zindan” adlı şeir yazdığını “Sicimqulunamə”yə yazdığı müqəddimədə Cəlil Məmmədquluzadə də qeyd edir.

Əli Nəzmi “Zindan” şeirinin əvvəlində mötərizədə belə bir izahat vermişdir: “(Gəncədə məşhur bir mərsiyəxanın danosu ilə bir çox türk cavanları həbs olunub, sürgün olunduqları barədə. O cümlədən müəllim Mirzə Məhəmməd Axundov da vardı).”

Mirzə Məhəmməd Axundovun xidmətlərini zahiri danlaq və qınaqla bir-bir sayan Əli Nəzmi təəssüflə bildirir ki, göstərdiyi xidmətlərin, söylədiyi nitqlərin əvəzində millət onu müdafiə edə bilmədi.

Mirzə Məhəmməd Axundov müəllimliklə, dərsliklər yazmaq, ictimai eybəcərlikləri ifşa etməklə kifayətlənmirdi. Xalqın milli-mədəni oyanışına nail olmaq üçün müxtəlif vasitə və üsullara əl atır, ona özünün görkəmli şəxsiyyətlərini tanıdaraq, qədr-şünaslıq duyğularını oyatmağa çalışırdı. Fikrimizə Mirzə Məhəmmədin Nizami Gəncəvinin şəxsiyyəti və irsi ilə əlaqədar qələmə aldığı yazılar misal ola bilər.

Mirzə Məhəmməd Axundovun ictimai-mədəni fəaliyyət dairəsi genişdir; o, bir tərəfdən “Dram” cəmiyyəti, “Nəşri-Maarif” cəmiyyətlərinin yaradılması və fəaliyyətində yaxından iştirak edir, digər tərəfdən də dram əsərləri yazır, teatrın mahiyyəti və əhəmiyyəti barədə “Teatr nədir?” kimi elmi-kütləvi əsər çap etdirir, digər tərəfdən də aktyor kimi səhnəyə çıxırdı.

Mirzə Məhəmməd Axundov 1913-cü ildə - Romanovlar sülaləsinin 300 illiyi ilə əlaqədar verilən “əfvi-ümumi”dən sonra Gəncəyə qayıdaraq ictimai-mədəni fəaliyyətini davam etdirir. 1918-ci ildə Azərbaycan Demokratik Respublikasının parlament üzvü seçilir. Hökumət işlərində, Maarif Komissarlığında çalışır. 1920-ci il aprel işğalından sonra Gəncəyə gəlib müəllimliklə məşğul olur. Lakin 20-ci illər repressiyasının ilkin dalğaları onu qoynuna alır. 1920-ci ilin oktyabr ayında Az.ÇK tərəfindən həbs edilir. Uzun dindirmə və istintaqdan sonra 1 ilik məcburi iş kəsilir.

Vətənpərvər maarifçi, şair, publisist, dramaturq, ədəbiyyat və sənət xadimi Mirzə Məhəmməd Axundov 1923-cü ildə vəfat etmişdir.

## İstifadə edilmiş ədəbiyyat


1. Mir Cəlal. Azərbaycanda ədəbi məktəblər. Bakı, 2004.
2. Həbibbəyli İ. Ədəbi-tarixi yaddaş və müasirlik. Bakı, 2007.
3. Azərbaycan ədəbiyyat tarixi. I cild. Bakı, 1960.
4. Azərbaycan ədəbiyyatı tarixi. II cild. Bakı, 1960.


**А.Байрамоглы**

**Об одном научно-педагогическом наследии отечества**

**Резюме**

В статье повествуется о творческой личности в истории азербайджанской литературы и культуры. А также говорится об известном педагоге, об авторе учебника М.М.Ахундова.

**A.Bayramoglu**

**A page from our scientific-pedagogical heritage**

**Summary**

The article is dedicated to the creative personality, pedagogue and famous textbook author M.Akhundov’life and literary activity.

# İLK AZƏRBAYCAN DİLİ MÜƏLLİMLƏRİNDƏN BİRİ



**Vahid Rzayev,**
***Naxçıvan Dövlət Universitetinin***
***kafedra müdiri, dosent***

***Açar sözlər:*** *Naxçıvan qəza məktəbi, ilk Azərbaycan dili müəllimi, pedaqoji fəaliyyət.*

***Ключевые слова:*** *Нахчыванская уездная школа, первый учитель азербайджанского языка, педагогическая деятельность.*

***Key words:*** *Nakhchivan district school, first teacher of Azerbaijani language, pedagogical activity.*

Azərbaycan məktəbinin tarixindən söz açarkən, ilk növbədə XIX əsrin 20-ci illərindən başlayırıq. O dövrdə açılan məktəblərdə təhsil, əsasən, rus dilində aparılsa da, yeni məktəblərin təhsili o dövr üçün mütərəqqi hadisə idi. Əhalinin qabaqcıl dəstəsi belə məktəblərin açılmasını tələb edirdi. Nəticədə, hökumət 1829-cu il 2 avqust tarixli Nizamnaməsinə uyğun olaraq, Zaqafqaziyanın bir sıra iri şəhərlərində qəza məktəbləri açdı. Bunlardan 9-u Azərbaycanın, o cümlədən biri Naxçıvanın payına düşdü.

Naxçıvan qəza məktəbi XIX əsrin sonu, XX əsrin əvvəllərində Azərbaycanda çox az sayda meydana gəlmiş ilk rus dövlət məktəblərindən biri idi. Bu məktəb Naxçıvan şəhərinin Azərbaycanın ictimai-mədəni mühit mərkəzlərindən biri kimi formalaşması və inkişafında, regionda qabaqcıl pedaqoji ideyaların yayılmasında əhəmiyyətli rol oynamışdır. Qəza məktəbi şəhərin ictimai-mədəni həyatının yenilik əlamətləri, mütərəqqi məzmun keyfiyyətləri ilə zənginləşməsi və dərinləşməsinə, bölgədə yeni–yeni məktəblərin açılmasına müsbət təsir göstərmişdir. Məktəbin məzunları Rusiya imperiyasının müxtəlif ixtisas məktəblərində - seminariya, ali pedaqoji institut və universitetlərində təhsil almış, zəmanəsinin yeni tipli ziyalı zümrəsini təmsil edərək Vətənə, xalqa həqiqi xidmət nümunəsi göstərmişlər. Naxçıvandakı bu ilk məktəbin yetirmələri istər XIX əsrdə, istərsə də XX əsrin əvvəllərində - inqilabaqədərki dövrdə təkcə Azərbaycanda deyil, bütünlüklə Zaqafqaziya mühitində öz fəallıqları ilə seçilmişlər. Görkəmli yazıçılarımız Cəlil Məmmədquluzadə, Eynalı bəy Sultanov, Naxçıvanda ilk milli teatrın yaradıcılarından biri Mirzə Sadıq Qulubəyov, Qori seminariyasının məzunları Mirzə Ələkbər Süleymanov, Əbülqasım Sultanov, Heydər Muradhasilov, Əliməmməd Xəlilov, Məmmədhüseyn Xəlilov, Rəhim Kazımbəyov, Novorossiyski İmperator Universitetinin məzunu Paşa ağa Sultanov, Moskva Universitetinin məzunu Fərəculla Şeyxov, Sankt-Peterburq Dağ Mədən İnstitutunun məzunu Əli Səfərov və başqaları məhz bu məktəbi bitirmişlər" (1).

Bu deyilənlər göstərir ki, həqiqətən də 1837-ci ilin mart ayından fəaliyyət göstərmiş Naxçıvan qəza məktəbi təhsil tariximizdə dövrünə görə yeni inkişaf meyilləri və təhsilin dünyəvi məzmunu ilə seçilən tədris müəssisələrindən biri olmuşdur. Lakin, təəssüf ki, bu tədris müəssisəsinin bizim üçün qaranlıq qalan, öyrənilməmiş, oxunmamış səhifələri də az deyil. Açılmamış səhifələr kimi qəza məktəbinin meydana gəldiyi gündən

Naxçıvanda sovet hakimiyyətinin ilk illərinədək burada işləyən Azərbaycan dili və şəriət müəllimlərindən bəzilərinin kimliyi və taleyinə aydınlıq gətirilməməsidir. Belə müəllimlərdən biri Naxçıvan qəza məktəbində ilk olaraq Azərbaycan dili fənnini tədris etmək kimi şərəfli bir vəzifəni daşımış Molla Allahverdi Sultanovun həyat və fəaliyyəti ilə bağlıdır.

Məktəbin ilk Azərbaycan dili və şəriət müəllimi haqqında məlumata "Кавказская календарь" illik ensiklopedik nəşrin 1846-cı ilə aid birinci buraxılışında rast gəldik. Həmin buraxılışda bu məktəbin müəllim heyəti haqqında məlumatda göstərilir ki, Naxçıvan qəza məktəbinin Azərbaycan dili və şəriət müəllimi Molla Allahverdi İmamqulu oğlu Sultanovdur ( 2 ). Bu fakt müvafiq olaraq "Кавказская календарь " məcmuəsinin 1847, 1848, 1849,1850, 1851-ci illərə aid buraxılışlarında da göstərilir. Lakin burada onun kimliyi, hansı ildən müəllim kimi fəaliyyət göstərdiyi və s. məsələlər haqqında bilgi verilmir.

Azərbaycan Respublikası Mərkəzi Dövlət Tarix Arxivində saxlanılan 1850-ci ilə aid "Tatar dili (Azərbaycan dili) müəllimlərinin qəza məktəblərində rus dilini öyrənməsi haqqında Qafqaz Tədris Dairəsinin popeçitelinin göstərişi" adlı sənədin birinci vərəqində 20 yanvar 1850-ci il tarixində Qafqaz Tədris Dairəsindən Dərbənd məktəblər direksiyasına göndərilən təlimat saxlanılır. Orada göstərilir ki, ötən 1849-cu ildə dairədə olan bir çox qəza məktəbinin Azərbaycan dili müəllimlərinin rus dilini bilmədiyi aşkar edilmişdir. Bu səbəbdən də şagirdlərin rus dilini öyrənmələrində çətinliklər yaranır, bu dil üzrə müvəffəqiyyət qənaətbəxş olmur, bəzən isə uğursuzluqla nəticələnir. Ona görə də Azərbaycan dili müəllimlərindən rus dilini bilməyənlər olduğu müşahidə edilərsə, bu zaman onların rus dilini öyrənib-öyrənməyəcəyi haqqında məlumatları qaydaya salmaq üçün iki il vaxt ayırıram. Əgər bu müddət ərzində Azərbaycan dili müəllimləri rus dilində oxuyub danışmağı bacarmazsa, tutduğu vəzifədən kənarlaşdırılmaqla təqaüd almaqdan məhrum ediləcək (3).

Bəhs etdiyimiz arxiv sənədində digər müəllimlərlə yanaşı Naxçıvan qəza məktəbinin müəllimi Molla Allahverdi Sultanovun da popeçitelin bu göstərişi ilə tanış edildiyini görürük. Qeyd edək ki, Allahverdi Sultanovun rus dilini bilmədiyi raportun məzmunundan açıq- aydın hiss olunur. Naxçıvan qəza məktəbinin ştatlı nəzarətçisi vəzifəsini tutan Krınsovun Qafqaz Tədris Dairəsi İdarəsinə raportunda göstərilir ki, "cənab popeçitelin 20 yanvar 108 nömrəli əmrinə əsasən rus dilini bilməyən Azərbaycan dili müəllimləri üçün iki il vaxt ayrıldığı haqqında göstəriş, ehtimal ki, Azərbaycan dili müəllimi poruçik Allahverdi Sultanova aiddir" (4 ).

"Məktəblər direksiyasının məmurlarının və müəllimlərin formulyar və əlifba siyahısı" adlı işdə göstərilir ki, Molla Allahverdi İmamqulu oğlu Sultanov Naxçıvan qəza məktəbinin şəriət qanunları və Azərbaycan dili müəllimidir. 1851-ci il formulyar siyahısına görə 55 yaşı olduğu göstərilir.

Sənəddə daha sonra göstərilir ki, Allahverdi Sultanov 25 noyabr 1837-ci ildən Naxçıvan qəza məktəbinin Azərbaycan dili və şəriət müəllimi işləyir. O, müəllimliklə yanaşı 1838 – 1841-ci illərdə Naxçıvan qəza məhkəməsində iclasçı işləmişdir. 1841-ci ildə bu vəzifədən öz ərizəsi əsasında azad edilmişdir.

Allahverdi Sultanov 7 dekabr 1851-ci ildə Naxçıvan şəhərində vəfat etmişdir. Allahverdi Sultanov Rusiya-Türkiyə müharibəsi zamanı Naxçıvan süvari müsəlman yarımbatalyonunda rota komandiri xidməti vəzifəsini tutmuşdur. Müharibə qurtardıqdan sonra 8 sentyabr 1829-cu ildən 25 noyabr

1837-ci ilədək, yəni Naxçıvan qəza məktəbinin Azərbaycan dili və şəriət qanunları müəllimi təyin edilənədək gümüş pulla 300 rubl təqaüd kəsilmişdir. Lakin 1837–ci ildə Naxçıvan qəza məktəbinə müəllim təyin edildikdən sonra hərbi xidmətə görə aldığı 300 rubl təqaüd əvəzinə dövlət məktəbində yerli dilləri tədris edən müəllimlərə təyin olunan tarif qaydalarına uyğun olaraq gümüş pulla 200 rubl verilmişdir. Əlbəttə ki, belə bir vəziyyətin hansı səbəblərdən yarandığı, hansı məqsədlərin izlənildiyi, poruçik Allahverdi Sultanovun bu məsələyə münasibətinin necə olduğu, necə bir mövqe nümayiş etdirdiyini söyləmək çətindir. Ancaq, çox ehtimal ki, şəhər qəza məktəbi açılanda Azərbaycan dili və şəriət müəllimi kimi Allahverdi Sultanovun rəsmi dövlət idarələrinin məqsədlərinə uyğun gələn, siyasi cəhətdən etibarsız sayılmayan bir şəxs kimi tanınmasının bu işdə əhəmiyyətli dərəcədə rolu olmuşdur.

Qafqaz Tədris Dairəsinin popeçitelinə 11 sentyabr 1852-ci il tarixli ikinci raportu da saxlanılır. Raportda Qafqaz Tədris Dairəsi poruçik Allahverdi Sultanov haqqında işin məzmunu ilə məlumatlandırılır. Burada Naxçıvan qəza məktəbinin keçmiş şəriət və Azərbaycan dili müəllimi, poruçik Molla Allahverdi İmamqulu oğlu Sultanovun ölümünün təsdiqini əks etdirən formulyar siyahının surətinin Qafqaz Tədris Dairəsinə göndərilməsi, mərhumun dul qalmış qadını Balacaxanıma və övladlarına birdəfəlik yardımın təyin edilməsi, Allahverdi Sultanova ölüm gününədək (7 dekabr 1951-ci ilədək) müəllimlik xidməti vəzifəsi üzrə təqaüdün təyin olunmaması, Allahverdi Sultanovun xidməti vəzifədən heç vaxt uzaqlaşdırılmaması, məhkəməyə verilməməsi və s. məsələlərdən danışılır (7).

Beləliklə, Allahverdi Sultanovun müəllimlik məharəti, ana dilini övladlarımıza öyrətmək səyləri, tədris etdiyi fənni hansı üsul və vasitələrlə öyrətdiyi, ümumən pedaqoji işə qabilliyi haqqında o qədər məlumatlı olmasaq da, bu arxiv sənədləri qəza məktəbinin müəllimi kimi onun həyatına və müəllimlik fəaliyyətinə işıq salmaq, ona dövrün, zamanın fonunda nəzər yetirmək, qiymət vermək baxımından dəyərli faktik materiallar sayıla bilər. Soy adının Sultanov olması, rus-türk müharibəsi zamanı Naxçıvan Sarvanlar süvari yarımbatalyonunda komandir kimi iştirakı onun Kəngərli xanlarının nəslindən olması ehtimalını artırır. Dövlət məktəbinə müəllim kimi işə qəbul edilməsi onun doğma Azərbaycan dilindən başqa, ərəb və fars dilləri üzrə təhsilli olduğunu söyləməyə imkan verir. Din xadimi və şəriət müəllimliyi rütbəsi kimi "Molla" adını qazanması da müəllim Allahverdi Sultanovun islam dəyərləri və şəriət qanunları haqqında təfsilatlı, sistemli biliklərə malik olduğunu göstərir.

Allahverdi Sultanov ömrünün 14 ilə yaxın bir dövrünü müəllimliyə həsr etmiş, mükafatlar almasa da, qüsursuz işləmişdir. Bu illər ərzində qəza məktəbində xeyli sayda azərbaycanlı uşaqlar təhsil almışdır. Allahverdi Sultanovun yetirmələrindən biri olan Mirzə Sadıq Qulubəyov müəlliminin ölümündən sonra məktəbin Azərbaycan dili və şəriət müəllimi vəzifəsini tutmuşdur. Müəllim Allahverdi Sultanovun təlim-tərbiyəsi ilə məşğul olduğu Vətən övladları sonralar Naxçıvanda, bütün Azərbaycanda və Zaqafqaziyada maarifin, elm və mədəniyyətin yayılmasında, inkişafında mühüm xidmətlər göstərmişlər. İlk olaraq onlara qələm tutmağı öyrətmiş Allahverdi Sultanovun yandırdığı maarif çırağının daha da alovlanmasına çalışmış, bu nəcib və müqəddəs işin şölələnməsinə layiqli töfhələr vermişlər.

***Rəyçi*: *prof. O.Həsənli***

## İstifadə edilmiş ədəbiyyat

1. “Şərq qapısı” qəzeti, 28 fevral 1998-ci il.
2. “Кавказский календарь” на 1846 год, Тифлис, s.184.
3. Azərbaycan Respublikası MDTA, f.845, s.1, iş 3, vər.1.
4. Azərbaycan Respublikası MDTA, f.845, s.1, iş 3, vər.1.
5. Azərbaycan Respublikası MDTA, f.845, s.1, iş 62, vər.79.
6. Naxçıvan MR MDTA f.26, s.1, iş 5, vər.1-3.
7. Naxçıvan MR MDTA, f.26, s.1, iş 5, vər.4-6.

**В.Рзаев**

**Один из преподавателей азербайджанского языка**

**Резюме**

Статья посвящена жизни и педагогической деятельности первого учителя азербайджанского языка и законов шариата Нахчыванской уездной школы Моллы Аллахверди Имамгулу оглу Султанова.

Впервые на основе архивных материалов исследована педагогическая деятельность народного просветителя Аллахверди Султанова с 1837 по 1851 гг.

**V.Rzayev**

**One of the first teachers of Azerbaijani language**

**Summary**

The paper is devoted to life and pedagogical activities of Mullah Allahverdi Imamgulu oglu Sultanov, the first teacher of the Azerbaijani and Sharia laws in the Nakhchivan uyezd school.

For the first time pedagogical activities of the national educator Allahverdi Sultanov from 1837 to 1851 are studied on the basis of archival materials.

* * *



# ŞAGİRDLƏRİN ESTETİK TƏRBİYƏSİNƏ TƏSİR EDƏN AMİLLƏR



**Vidadi Xəlilov,**
***pedaqogika üzrə elmlər doktoru, professor,***
***Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü,***
***əməkdar müəllim***

***Açar sözlər:*** *melodiya, vokal əsərləri, instrumental əsərlər, ifaçılıq tərzi, musiqi repertuarı, musiqi duyumu, estetik zövq, estetik fəaliyyət.*

***Ключевые слова:*** *мелодия, вокальные произведении, инструментальные произведении, испольнителское нюансы, музыкальные репертуары, музыкальное чувство, эстетический вкус, эстетическое деятельность.*

***Key words:*** *melody, vocal works, instrumental works, performance style, musical repertoire, musical sense, aesthetic pleasure, aesthetic activity.*

Tanınmış pedaqoq, ziyalı Hacıbaba Həsənovun həyat və fəaliyyət idealı tələbələrinə incəsənətin ecazkar rəng çalarlarını, mütənasib forma və ritmlərini duymağı öyrətməkdən, onları bu sehrkar aləmlə təmasda olmağa hazırlamaqdan ibarət olmuşdur. Onun gənc nəslin musiqi, estetik tərbiyəsi sahəsindəki fəaliyyət istiqamətlərini araşdırarkən yəqinliklə belə bir qənaətə gəlmək olur ki, o, çox istedadlı və hər cəhətdən hazırlıqlı musiqi pedaqoqu kimi çoxsaylı tələbələrinin qəlbində özünəlayiq yer tutmuş, apardığı mühazirə-seminar məşğələləri fakt zənginliyinə, şərhin emosionallığına görə həmişə diqqəti cəlb etmişdi.

O, musiqi sənətini ürəkdən-candan sevirdi. Bu sevgini tələbələrinə çatdırmaq, bu hissi onlarda qüvvətləndirmək üçün əlverişli yollardan, vasitələrdən istifadə edirdi. Klassik şair və bəstəkarlarımızın, söz-sənət adamlarının dəyərli fikirlərini nəzərə çatdırırdı. Musiqi sənətinin ayrı-ayrı janrlarındakı bir-birindən dəyərli nümunələrinin tərbiyəvi əhəmiyyətini, təsir qüvvəsini uşaqlara, məktəbli gənclərə çatdırmağı vacib sayırdı.

Hacıbaba Əbdüləli oğlu Həsənov 13 sentyabr 1922-ci ildə Bakının mərkəzindən çox da uzaq olmayan Əhmədli kəndində dünyaya göz açmışdı. Aşağı siniflərdən simli musiqi alətlərində ifa etməyi öyrənməyə başlayan Hacıbaba əvvəlcə mandalinada, sonra tarda və kamançada bir sıra xalq mahnılarını, müvafiq muğamları öyrənməyə, müstəqil ifa etməyə çalışmışdı. Hələ gənc yaşlarından musiqi istedadı hiss olunsa da, kənd ağsaqqalları, ictimai təşkilatların nümayəndələri o dövrdə kənddə ali təhsilli tibb işçisinə olan ehtiyacı nəzərə alaraq onun Azərbaycan Dövlət Tibb İnstitutunda təhsil almasını qərara alır. Beləliklə, o, 1942-ci ildə Azərbaycan Dövlət Tibb İnstitutunun müalicə-profilaktika fakültəsinə daxil oldu. Lakin o, musiqidən də ayrılmadı. Özünün təşkilatçılığı ilə yaradılan və kənddə fəaliyyət göstərən xor, xalq-çalğı alətləri ansamblına dərsdən sonrakı

asudə vaxtlarda da inamla rəhbərlik edirdi. İstedadlı musiqiçilərin, kənddəki özfəaliyyət musiqi dərnəklərində iştirak etmək istəyənlərin sayı daha da artırdı. Bütün bunlar isə musiqiyə qəlbən bağlı olan gənc mütəxəssisi daha da sevindirirdi. O, 1947-ci ildə Azərbaycan Dövlət Tibb İnstitutunun müalicə-profilaktika fakültəsində təhsilini uğurla başa vurdu. Kənddəki xəstəxanada həkim, baş həkim kimi yurddaşlarının sağlamlığının keşiyində durdu. Ancaq musiqiyə olan marağı, məhəbbəti onu bir an belə tərk etmirdi. İşdən sonrakı vaxtlarını da kənddə musiqi özfəaliyyət işlərinin genişlənməsinə həsr edirdi.

1947-ci ildə respublika üzrə özfəaliyyət musiqi kollektivlərinə keçirilən baxışda repertuara ancaq yeni yazılan, ilk dəfə ifa olunacaq vokal və instrumental əsərlər daxil edilməli idi. Heç şübhəsiz, bu tələb ansamblın rəhbəri, gənc musiqiçi H.Həsənovu da orijinal yaradıcılıq fəaliyyətinə istiqamətləndirdi. Olduqca lirik, orijinal səslənən "Özfəaliyyət marşı"nı və “Mənim səsim” mahnısını (sözləri Əliağa Vahidindir) yazdı. Münsiflər heyəti həmin musiqi nümunələrinin orijinallığını və professional ifa səviyyəsini nəzərə alaraq kollektivi Fəxri Fərmanla təltif etdi, xüsusi mükafata layiq gördü.

H.Həsənov 1952-ci ildə Moskvadakı Ümumittifaq Xalq Yaradıcılığı Evində fəaliyyət göstərən ikiillik musiqi təhsili kursunu qiyabi yolla başa vurduqdan sonra Ü.Hacıbəyli adına Azərbaycan Dövlət Konservatoriyası nəzdində fəaliyyət göstərən Xalq Konservatoriyasının bəstəkarlıq şöbəsini də əla təhsil göstəriciləri ilə başa vurdu. Hər hansı melodiyanı notla yazmağı, nota köçürmək sistemini mükəmməl öyrənmişdi. Qarşısına belə bir yaradıcılıq vəzifəsi qoydu: Respublikamızın ümumtəhsil məktəblərində oxuyan şagirdlər üçün bir-birindən maraqlı mahnılar yazmaq, onların musiqi və nəğmə dərslərində, özfəaliyyət musiqi dərnəklərinin məşğələlərində geniş yer tutmasına nail olmaq. Bax elə buna görə də bəstəkar Hacıbaba Həsənovun böyüməkdə olan nəslin musiqi-estetik tərbiyə sahəsindəki fəaliyyətinin mühüm bir istiqaməti də məktəbli repertuarı yaratmaq, uşaqların, məktəblilərin vokal-xor ifaçılıq qabiliyyətlərini inkişaf etdirən mahnılar yaratmaqla bağlı olmuşdur.

Hacıbaba müəllimin Bəxtiyar Vahabzadənin, Nəbi Xəzrinin, Novruz Gəncəlinin, Qasım Qasımzadənin, Arif Cəfərovun sözlərinə yazdığı mahnıların bir çoxu keçən əsrin 50-60-cı illərində “Məktəbli mahnıları”, “Dostluq və sülh mahnıları” adlı məcmuələrdə əks olunmuşdur.

1956-cı ildə nəşr olunan “Məktəbli mahnıları”nda (1) H.Həsənovun “Qızıl bayraq” (sözləri Bəxtiyar Vahabzadənindir), “Bu yerdə” (sözləri Nəbi Xəzrinindir), 1964-cü ildə Azərbaycan Dövlət Tədris Pedaqoji Ədəbiyyatı Nəşriyyatının çap etdiyi “Dostluq və sülh mahnıları”nda (2), habelə 1988-ci ildə “Yazıçı” nəşriyyatı tərəfindən çap olunan “Nəğmə çələngi” məcmuəsində də dövrün başlıca tələbləri, xalq ruhuna uyğun mahnılar nəzərə çatdırılmışdır. Hələ 1956-cı ildə nəşr olunan “Məktəbli mahnıları”nda yer alan və Arif Cəfərovun sözlərinə bəstələnən “Vətənim” mahnısı da olduqca şən, ritmik, əlvan melodiyaya malik bir mahnıdır:

Sənsən öz şöhrətim, sənsən öz sözüm,
Sənsən öz qüdrətim, günüm-gündüzüm.
Sənin camalına vurğunam ozüm
Gülür azad elim, olubsan gülşən Vətənim,
Səndən ayrılmayır ürəyim mənim.

H.Həsənov uşaqlarla, məktəblilərlə yanaşı, böyüklərin, müxtəlif nəsildən olan insanların zövqünü oxşayan bir-birindən dəyərli mahnılar da yazmışdır. Bu mahnılar keçən əsrin 50-ci illərində ən çox sevilən və dinləyici məhəbbəti qazanan vokal əsər-

lərindən olmuşdur. Onun mahnıları hələ o dövrdə adlı-sanlı xanəndələrimiz Əbülfət Əliyevin, Şövkət Ələkbərovanın, Zeynəb Xanlarovanın, Rübabə Muradovanın, Gülağa Məmmədovun və başqalarının ifasında lentə yazılmışdır. Müxtəlif qəbildən olan dinləyicilərin, tamaşaçıların musiqi-estetik hisslərinin inkişafında mühüm rol oynayan həmin mahnılar respublika radiosunun fonotekasında saxlanılır. Yeri gəlmişkən qeyd edək ki, Azərbaycan Uşaq və Gənclər Ədəbiyyatı Nəşriyyatının hələ 1961-ci ildə çap etdirdiyi "Lirik mahnılar" məcmuəsində o dövrdə görkəmli xanəndələrimizin repertuarında geniş yer tutan "Xatirələr", "Yağma yağış" (sözləri Bəxtiyar Vahabzadənindir.(4, s.138-139), 1958-ci ildə ekranlaşdırılan "Ögey ana" filmində səslənən "Eşqimin növrağı" (sözləri Qasım Qasımzadənindir. 4, s.165), "Yanıma gələndə" (sözləri Novruz Gəncəlinindir. (4, s.167), "Sənin gözlərin" (sözləri Kərim Faiqindir, 4, s.201) mahnıları müxtəlif nəsildən olan insanların estetik hisslərini oyadan, estetik zövqünü oxşayanlar sırasındadır. Həmin mahnılar indi də "Hacıbaba Həsənovun melodiyaları" adı ilə efirdə verilən konsertlərdə səsləndirilir.

Bəstəkarın müxtəlif nəsildən olan insanların bədii estetik zövqünü oxşayan yüzdən çox mahnısı və romansı var. Onlar xalq ruhunda yazan digər bəstəkarlarda olduğu kimi müəllifin öz adı ilə elan olunmamış, xalq mahnıları, muğam təsnifləri kimi təqdim edilmişdir.

Daim yaradıcılıq axtarışında olan H.Həsənov geniş tamaşaçı kütləsinin operetta-musiqili komediya janrına olan marağını nəzərə alaraq bu janrda da qələmini sınamışdır. Onun bu janrda yazdığı ilk əsəri dramaturq Məhərrəm Əlizadənin "Şeyx Rəhmətullah" komediyasına bəstələdiyi musiqi olmuşdur.

Musiqi sənətinin inkişafını, tərbiyəvi imkanlarını daha parlaq şəkildə nəzərə çatdırmaq naminə müxtəlif istiqamətlərdə səylə çalışan Hacıbaba Həsənov bir arzu, amalla yaşayıb-yaradırdı. Bəstəkar musiqi müəllimi kimi özünü respublikamızın ümumtəhsil məktəblərində daha çox ehtiyac hiss olunan musiqi-nəğmə müəllimi hazırlığı prosesində görürdü. 1958-ci ildən Hacıbaba müəllim Azərbaycan Dövlət Pedaqoji İnstitutunun ibtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müəllimi kimi işə dəvət olunur. Görkəmli pedaqoq, professor Mərdan Muradxanov və fakültə dekanı, ali təhsil sisteminin fəal qurucularından olan dosent İsfəndiyar Vəlixanlının diqqət və qayğısı sayəsində o, musiqi tədrisi metodikası üzrə mühazirə və seminar məşğələləri aparır. Mühazirə və seminar məşğələlərində musiqinin çox qüvvətli tərbiyəvi təsir imkanlarını konkret faktlar, xarakterik nümunələr, dəyərli fikirlərlə nəzərə çatdırırdı. Mühazirə, söhbət əsnasında istinad etdiyi, misal çəkdiyi musiqi nümunəsinin bədii-estetik təsirini daha inandırıcı, əyani şəkildə tələbələrə-gələcəyin sinif müəllimlərinə çatdırmaq üçün həmin musiqiləri pianoda aözü ifa edirdi. Sözlə təsvir edilən musiqinin mahiyyəti qəlb oxşayan təranələrlə açıqlanırdı.

İş o yerə çatırdı ki, tələbələr təkidlə fakültə dekanlığından, kafedranın rəhbərliyindən Hacıbaba müəllimin həftəlik və semestr ərzindəki dərs-məşğələ saatlarının artırılmasını dönə-dönə xahiş edirdilər. Keçən əsrin 60-cı illərinin əvvəllərində (1960-1964) pedaqogika və ibtidai təhsil metodikası fakültəsində təhsil aldığım illərdə Hacıbaba müəllimin tələbələrindən biri kimi həmin söhbətlərin dəfələrlə şahidi olmuşam.

O, Abbas Səhhətin hələ keçən əsrin əvvəllərində yazdığı "Nəğmə və musiqinin məktəblərdə əhəmiyyəti" adlı məqaləsində məzmun rəngarəngliyinə malik olan nəğmələrin müxtəlif nəsillərdən olan insan-

lara çatdırılmasının əhəmiyyətindən bəhs edərək yazırdı ki, xalqın həyatı, məişəti ilə bağlı bir sıra nəğmələr məktəblərdə təlim edilərsə, vətənpərvərlik baxımından olduqca faydalı nəticələrə gəlmək imkanı yaranar. Çünki qısa cümlələr vasitəsilə böyük fikirlər anladan nəğmələr uşaqların ürəyində, damarlarında nə qədər təsirli həyəcanlar törədir. Vətənpərvərlik kimi nə qədər qüvvətli hislər oyadır. Görmürsünüzmü, əsgər musiqi sədaları ilə addımlayarkən intizamlı, yorğunluğa daha çox davamlı olur. Nəğmə dərsləri uşaqlar üçün sevinc mənbəyi olmaqla zehinləri dincəldir, gərginlik yaranmır.

Hacıbaba müəllim mühazirə və seminar məşğələlərində milli musiqimizin əsası sayılan muğamlarla müntəzəm təmasda olmağı, radio və televiziya ilə verilən konsertlərdə, habelə muğamların quruluşuna, məna çalarlarına, dinləyicilərdə, tamaşaçılarda müxtəlif səpkili hislər oyatma imkanlarına xüsusi diqqət yetirməyi, həmin cəhətləri mükəmməl mənimsəməyi zəruri şərt kimi qarşıya qoyurdu. Bu məsələdən bəhs edərkən dahi bəstəkarımız, böyük musiqi alimimiz Üzeyir Hacıbəylinin mühüm didaktik mahiyyət kəsb edən fikrini diqqət mərkəzinə gətirdi:

"… Bədii ruhi təsir cəhətdən "Rast" dinləyicidə mərdlik və gümrahlıq hissi, "Şur" şən lirik əhvali-ruhiyyə, "Segah" məhəbbət hissi, "Şüştər" dərin kədər, "Cahargah" həyəcan və ehtiras, "Bayatı-Şiraz" qəmginlik, "Humayun" isə "Şüştər"ə nisbətən daha dərin bir kədər hissi oyadır".

Hacıbaba müəllim mühazirə və seminar məşğələlərində muğamlarımızın fəlsəfi, bədii-estetik mahiyyətindən bəhs edərkən Azərbaycan Respublikasının xalq artisti, Şərq aləmində "Qız qalası" adlı ilk balet əsərinin müəllifi, bəstəkar, musiqişünas Əfrasiyab Bədəlbəylinin nəzəri və praktik əhəmiyyəti ilə diqqəti cəlb edən aşağıdakı dəyərli fikirlərini də yada salırdı:

- Muğamat musiqimizin təməli, onun bünövrəsi, onun dayaq sütunudur. Muğamat mahnılarımız, təsniflərimiz, oyun havalarımız, simfonik əsərlərimiz, opera və baletlərimiz üçün tükənməz və gözəl təranələr mənbəyidir. Bir sözlə, muğamat Azərbaycan musiqi dilinin, əgər təbiri düzgün başa düşülərsə, lüğət fondudur…

Məşhur maestronun həmin fikirlərini diqqətə çatdırarkən Hacıbaba müəllim fikrin aliliyinə heyrət və heyranlığını gizlədə bilmirdi. O anlarda xalq şairi Mirmehdi Seyidzadənin həmişə təravətli muğamlarımızın məna dəyərlərini çox böyük məharətlə, poetik dillə tərənnüm edən "Qəlb oxşamağa incə kamanım və tarım var" mətləli qəzəlini də yada salırdı.

Hacıbaba müəllim yaxşı bilirdi ki, mühazirə və seminar məşğələlərində yeri gəldikcə bu kimi heyrət və heyranlıq yaradan fikirlərə istinad olunması tələbələrdə-gələcək müəllimlərdə musiqiyə böyük maraq yaradır. Onlar aparacaqları sinif-dərs məşğələlərinin estetik-emosional təsirini artırmağa səy göstərirlər.

H.Həsənovun bir bəstəkar, musiqi pedaqoqu kimi təqdirəlayiq cəhətlərindən biri də bu idi ki, o hər bir tələbəyə diqqət və qayğı ilə yanaşırdı. Vaxti ilə psixologiya üzrə aspiranturanı bitirmiş bir müəllim kimi hər bir tələbənin potensial imkanlarını, musiqi qavrama qabiliyyətlərini düzgün müəyyənləşdirir, faydalı tövsiyələrini verirdi. Onu da deyək ki, bütün bu humanist keyfiyyətlərinə görə hazırda pedaqoji fəaliyyətdə olan yetirmələri Hacıbaba müəllimi minnətdarlıq hissi ilə xatırlayırlar. O, 1997-ci ildə 75 yaşında dünyasını dəyişsə də hazırda yaşayıb-yaradan yetirmələri yeri gəldikcə peşə-sənət adamları üçün parlaq nümunə təsiri bağışlayan müəlliminin pedaqoji ustalığından, insani keyfiyyətlərindən böyük məhəbbətlə söhbət açırlar.

Hacıbaba müəllim vaxtilə dərs dediyi istedadlı tələbələrlə həmişə əlaqə saxlayır, onların səmərəli fəaliyyət göstərmələri, peşəkarlıq səviyyəsinin yüksəlməsi üçün əlindən gələni əsirgəmirdi. O, sözün həqiqi mənasında vətənpərvər pedaqoq idi.

Musiqinin tərbiyəvi təsir imkanlarını daima diqqət mərkəzində saxlayan, bu sahədə yaradıcılıq axtarışlarında olan Hacıbaba müəllim hələ keçən əsrin 60-cı illərinin əvvəlindən başlayaraq ümumtəhsil məktəblərində çalışan musiqi və ibtidai sinif müəllimlərinin elmi-metodik hazırlıqlarını artırmaq məqsədilə silsilə məqalələr üzərində işlədi. O dövr üçün çox vacib olan, nəzəri-praktik əhəmiyyəti ilə diqqəti cəlb edən həmin məqalələri pedaqoji mətbuatımızın möhtəşəmi, tacı sayılan "Azərbaycan məktəbi" jurnalının ayrı-ayrı nömrələrində dərc etdirdi.

"İbtidai məktəbdə musiqi ədəbiyyatı tədrisi haqqında (1963, №4), "Nəğmə və musiqi daha güclü gurlasın" (1965, №11), "İbtidai siniflərdə ikisəsli mahnıların tədrisinə dair" (1966, №8), "Mahnıların tədrisi haqqında" (1967, №9) sərlövhəli məqaləlıri çox böyük səfərbəredici təsir göstərdi. Musiqi və nəğmənin bir fənn kimi tədrisinə əhəmiyyətli təsir göstərdi. Məktəblərdə bu sahədə xeyli canlanma hiss olundu.

1970-ci ildə "Azərbaycan məktəbi" jurnalına əlavə kimi nəşr olunan "İbtidai məktəb və məktəbəqədər tərbiyə" məcmuəsinin elə həmin ilə aid 5-ci nömrəsində dərc olunan "Sinifdənxaric musiqi işlərinin təşkili" mövzusunda məqaləsi də musiqi təlimi-tərbiyəsi işlərinə kompleks qaydada yanaşmağın vasitə və yollarını nəzərə çatdırdı.

Görkəmli musiqi xadimi, musiqi pedaqoqu kimi tanınan H.Həsənovun "Azərbaycan məktəbi" jurnalında dərc olunan həmin məqalələri, bir növ, təcili yardım rolunu oynayır, ümumtəhsil məktəblərində çalışan və ibtidai siniflərdən başlayaraq musiqi və nəğmə fənnini tədris edən müəllimlərin yoluna işıq tuturdu. Əlbəttə, həmin məqalələrdə diqqət mərkəzinə gətirilən və bu gün üçün də aktuallıq kəsb edən bir sıra problem məsələlərin üzərində dayanmaq imkan xaricindədir. Bunları ancaq problemliyi ilə diqqəti cəlb edən xüsusi bir məqalədə nəzərə çatdırmağı daha vacib və məqsədəmüvafiq sayırıq. O dövrdə respublikamızın ümumtəhsil məktəblərində musiqi tədrisi metodikası ilə bağlı vəsaitə çox böyük ehtiyac var idi. Keçən əsrin 60-cı illərində musiqi təmayüllü internat məktəbində musiqi müəllimi, xormeyster kimi səmərəli fəaliyyət göstərən Yuli Əliyevin (sonralar o, SSRİ Pedaqoji Elmlər Akademiyasının Bədii Tərbiyə İnstitutunda dissertasiya müdafiə edərək baş elmi işçi, laboratoriya müdiri vəzifəsində çalışmışdır. Hazırda o, pedaqoji elmlər doktoru, professor, akademik kimi elmi fəaliyyətini davam etdirir). 1964-cü ildə nəşr etdirdiyi "Nəğmə dərsinin tədrisi metodikası" (Bakı: Azərtədrisnəşr, 1964) vəsaiti az miqdarda nəşr olunsa da, problem dairəsində nəzərə-çarpan dönüş yaradılmasına əhəmiyyətli təsir göstərdi. Əlbəttə, belə bir tədris vəsaitinin meydana çıxması Hacıbaba müəllimin də ürəyincə idi. Bu sahəyə xüsusi diqqət yetirilməsini vacib sayırdı. Nəşr etdirdiyi nəzəri-metodik məqalələrində, müxtəlif xarakterli elmi-praktik konfranslardakı çıxışlarında məktəblərdə musiqi və nəğməyə etinasız münasibət göstərənlərə, "ikinci dərəcəli" fənn kimi nəzərdə tutanlara tutarlı cavablarını verirdi. Dönə-dönə qeyd edirdi ki, sivilizasiyanın ən böyük bəşəri dəyərlərindən biri musiqi sənətidir. Qədim dövrlərdən yaranan və bizim günlərə gəlib çatan müxtəlif janrlı musiqi nümunələri isə ölkədə, cəmiyyətdə musiqi mədəniyyətinin, bütövlükdə estetik mədəniyyətin inkişafına, formalaşmasına

zəmin yaratmışdır. Şəxsiyyət zənginliyi ilə tanınan, sayılıb-seçilən hər kəs bu məlum həqiqəti bir an belə yaddan çıxarmamalıdır.

***Rəyçi: prof. N.Kazımov***

## İstifadə edilmiş ədəbiyyat

1. Abbas Səhhət. “Nəğmə və musiqinin məktəblərdə əhəmiyyəti”. // Azərbaycan məktəbi, 2015, № 6.
2. Ümumi təhsilin fənn standartları (I-XI siniflər). Bakı, 2012.
3. Nəğmə çələngi. Bakı: Yazıçı, 1998.
4. Lirik mahnılar. Bakı: Azərbaycan Uşaq və Gənclər Ədəbiyyatı Nəşriyyatı, 1961.
5. Səfiyev N. //“Ədalət və həqiqət” qəzeti, 5-12 iyun 2003-cü il.
6. Muğamların tədrisinə dair metodik tövsiyələr. Bakı, 1982.
7. Xəlilov V. Məktəblilərə musiqi haqqında. Bakı: Nərgiz, 2002.
8. Məktəbli mahnıları. Bakı: Maarif, 1956.
9. Dostluq və sülh mahnıları. Bakı,: Azərbaycan Dövlət Pedaqoji Ədəbiyyatı Nəşriyyatı, 1964.

**В.Халилов**

**Факторы, влияющие на эстетическое воспитание учащихся**

**Резюме**

В статье говорится о сделанных работах в области музыкально-эстетического воспитания, как о главной составной части музыкальной культуры, педагогом, известного как композитора, музыкального педагога, психолога и врача в прошлом веке

**V.Khalilov**

**Factors affecting the aesthetic upbringing of students**

**Summary**

The article is dedicated to the widely known pedagogue of the last century, who was also a famous physician, psychologist, composer and music teacher, and his major works done in the field of music and aesthetic education, which is one of the main components of our music culture.

# AZƏRBAYCAN–ALMANİYA ELMİ–PEDAQOJİ ƏLAQƏLƏR TARİXİNƏ BİR NƏZƏR



**Hüseyn Əhmədov,**
***akademik***

***Açar sözlər:*** *Azərbaycan-alman əlaqələr, məktəb, təhsil, elm, ədəbiyyat, mədəniyyət, M.Ş.Vazeh, Fren, Dorn, Miller, Bodenştedt, Kazım bəy, əməkdaşlıq.*

***Ключевые слова:*** *Азербайджано-Германские отношения, школа, образование, наука, литература, культура, М.Ш.Вазех, Френ, Дорн, Мюллер, Боденштед, Казым бек, сотрудничество.*

***Key words:*** *Azerbaijan-Germany relation, school, education, the science, literature, culture, M.S. Vazeh, Fren, Dorn, Miller, Bodenshtedt, Kazim bey, cooperation.*

Qloballaşan dünyamızda xalqlar və dövlətlər arasında əlaqələr get-gedə genişlənir. Azərbaycan xalqının və müstəqil Azərbaycan dövlətinin də Asiya ilə bərabər Avropa xalqları və dövlətləri ilə əlaqələri genişlənməkdədir. Belə ölkələrdən biri də Almaniyadır. Bu gün azərbaycanlılardan Almaniyada təhsil alanlar, orada yaşayanlar, həmçinin Almaniya vətəndaşlarının Azərbaycan, onun tarixi, mədəniyyəti və gəzməli-görməli yerlərinə maraqlarının artması ilə əlaqədar bu əlaqələrin tarixinə ötəri də olsa, nəzər salmağı lazım bildim.

Azərbaycan–Almaniya əlaqələrinin tarixi təxminən 200 illik bir dövrü əhatə edir. İlkin mənbələrə görə, bu əlaqələr XIX əsrin əvvəllərindən başlamış və zəmanəmizə qədər müxtəlif yollarla inkişaf etmişdir.

Rəsmi mənbələrdə XIX əsrin əvvəllərində Azərbaycan ərazisində iki alman koloniyasının (kəndinin) olduğu göstərilir.Onlardan biri Yelendorf, digəri isə Annenfeld adlanırdı. Bunlardan birincisi Gəncə şəhərinin yaxınlığındakı Göygöl rayonunda, digəri isə indiki Şəmkir rayonunun ərazisində yerləşirdi. Ağstafa yaxınlığında da Marksovka adlı bir alman kəndinin olduğu deyilir.

Çox maraqlıdır ki, bu kəndlərin hər birində ümumi təhsil verən məktəb də fəaliyyət göstərmişdir. Yelendorfdakı məktəbin əsası 1819-cu, Annenfelddəki məktəbin əsası isə 1837-ci ildə qoyulmuşdur. Hər iki məktəbdə oğlanlarla bərabər qızlar da oxuyurdu. Bu məktəblər 1890-cı ildə Rusiya Xalq Maarif Nazirliyinin tabeliyinə keçərək ibtidai məktəbə çevrildilər. Burada ilahiyyat və alman dilindən başqa digər fənlər rus dilində tədris edilməyə başladı.

Alman məktəblərinin Azərbaycanın digər rayon və kəndlərində də fəaliyyət göstərməsinə aid məlumatlar qalmaqdadır. Qafqaz təhsil Dairəsinin əməkdaşı L.Modzalevski 1880-ci ildə Tiflisdə rus dilində nəşr etdirdiyi “1802-ci ildən 1880-ci illərə qədər Qafqazda tədris ilinin gedişi” adlı əsərində yazır ki, Bazel missionerləri rus hökuməti nümayəndələrindən əvvəl 1827-ci ildə Azərbaycanın Şuşa şəhərində özlərinin məktəblərini açmışdılar ki, burada, hətta bir çox müsəlman uşaqları böyük həvəslə alman dilini öyrənirdilər.

Yeri gəlmişkən deyək ki, Zaqafqaziya ərazisində ilk dövlət məktəbinin əsası 1830-cu il dekabrın 30-da 19 şagird ilə Azərbaycanın Şuşa şəhərində qoyulmuşdur. 1829-cu il avqustun 2-də təsdiq edilmiş Zaqafqaziya məktəblərinin Əsasnaməsi əsasında yaranan bu məktəb qəza məktəbi adlanırdı. Təhsil, əsasən, rus dilində verilir, Azərbaycan dili və şəriət müstəqil bir fənn kimi tədris edilirdi.

Sankt-Peterburq şəhərindəki Rusiya Mərkəzi Dövlət Tarix Arxivində saxlanılan sənədlərin birində deyildiyi kimi, növbəti alman məktəbi 1890-cı illərdə Gədəbəy – Qalakənd Misəritmə zavodu nəzdində açılmışdı. Gədəbəy Misəritmə zavodunun əsası 1855-1856-cı illərdə qoyulmuşdur. Yuxarıda göstərilən məktəb zavodun gəlirindən və təhsil haqqından toplanan vəsait ilə idarə edilirdi.

XIX əsrin əvvəllərində Azərbaycanın Rusiya tərəfindən işğal edilməsi çarizmin məxfi məqsədindən asılı olmayaraq Azərbaycanın digər xalqlar ilə elmi-pedaqoji, ədəbi, mədəni və ictimai əlaqələrinin yaranmasına və inkişafına zəmin yaratdı.

XIX əsrin sonlarında alman mənşəli akademiklərdən X.D.Fren (1782-1851) ilə B.A.Dornun (1805-1881), həmçinin akademik A.Millerin (1848-1913) Azərbaycanla, Azərbaycanşünaslıqla bağlı əlaqələri və xidmətləri və nəhayət, Avropa səyyahlarının, ilk növbədə alman şairi və tərcüməçi Fridrix Bodenştedtin (1819-1892) Qafqaza, o cümlədən Azərbaycana səyahətləri, bu ölkənin həyat tərzinə, maarifinə, mədəniyyətinə, tarixinə və ədəbiyyatına, dilinə maraq göstərmələri diqqəti cəlb edir.

Almaniyada anadan olmuş, orada təhsil almış Boris Andreyeviç Dorn başlıca olaraq fars mənbələri əsasında yazdığı “Şirvanşahların tarixinin öyrənilməsinə təşəbbüs” həmçinin “Hakimlərin və xanlıqların hökmranlığı dövründə Şirvanın tarixi” adlı əsərləri rus şərqşünaslığında Şirvan tarixinə dair ilk tədqiqat işləri hesab edilir.

Akademik Dorn Azərbaycanın məşhur mütəfəkkiri, tanınmış yazıçı, filosof, pedaqoq və ictimai xadimi olan M.F.Axundzadə (1812-1878) ilə məktublaşmış, onun yeni əlifba layihəsini bəyənmişdir. Dorn Azərbaycanın bəzi tarixi abidələrini də tədqiq etmişdir. Mənbələrdə akademik Dornun XIX əsrin ikinci yarısında Lənkərana gəlməsinə, burada ana dili məktəbi açmış M.İ.Qasirlə (1806-1900) tanış olmasına aid məlumat vardır. Akademik Miller akademik Dornun Tiflisdən tez-tez Lənkərana gəldiyini, burada Qasir və digər ziyalılardan talış dili və nəğmələri haqqında məlumat topladığını söyləyir.

Azərbaycan-Almaniya elmi əlaqələrinin yaranmasında və inkişafında alman professoru Millerin böyük xidməti olmuşdur. XIX əsrin 80-ci illərində Kenisberq (1882 – ci ildən) və Qalle (1889-cu ildən) universitetlərində Şərq dilləri professoru olmuş Miller Şərq xalqları ilə, ilk növbədə ərəb, türk xalqları ilə bağlı bir sıra əsərlərin, o cümlədən yunan elminin ərəb mədəniyyətinə təsirinə, yəhudi, ərəb və türk dillərinin qrammatikasına dair tədqiqatların müəllifidir.

Miller məşhur ərəb alimlərindən İbn Əbü Übeyd (1203-1270) və İbn Nədimin (XI əsr) əsərlərinin elmi tənqidi mətnini çapa hazırlamış, şərqşünaslığa aid ədəbiyyatın biblioqrafiyasını tərtib etmişdir.

İlk mənbələrdə deyildiyi kimi, Millerin ən məşhur əsəri XIX əsrin sonu XX əsrin əvvəllərində Almaniya və Rusiyada geniş yayılmış dörd cildlik “İslam tarixi” (“İslam Şərqdə və Qərbdə”) əsəridir. Əsərdə Azərbaycanın ərəblər tərəfindən işğalı, İslam dininin yayılması, ərəb-xəzər müharibələri, Azərbaycanda mövcud olmuş dövlətlər və s. haqqında məlumat verilir.

Azərbaycan-Almaniya pedaqoji və

mədəni əlaqələrinin yaranması tarixində F.Bodenştedtin ayrıca rolu qeyd edilməlidir. O, Qafqaza səyahət etmiş, 1843-1846-cı illərdə Tiflis gimnaziyasında dərs demişdir. O zamanlar Tiflis gimnaziyasında Şərq dillərindən dərs deyən müəllimlərdən biri də məşhur Azərbaycan şairi M.Ş.Vazeh idi. Bu iki müəllimin Tiflisdəki tanışlığı nəticə etibarilə təkcə Azərbaycan-Almaniya pedaqoji əlaqələrinin deyil, həmçinin ədəbi əlaqələrinin yaranmasına əlverişli zəmin hazırlamış oldu.

M.Ş.Vazeh 1892-ci ildə Gəncə şəhərində anadan olmuş, mədrəsə təhsili almış, müəllimlik və xəttatlıq sənəti ilə məşğul olmuş, 1840-1846-cı illərdə Tiflis qəza məktəbində, sonradan isə Tiflis gimnaziyasında Azərbaycan dilindən dərs demiş, arxiv sənədlərində deyildiyi kimi, "özünün çalışqanlığı və mərdliyi" ilə fərqlənmişdir.

Gürcüstan MDTA-da saxlanılan Tiflis məktəblər direksiyası müəllimlərinin 1851-ci ilə aid siyahısında Mirzə Şəfi haqqında çox müfəssəl məlumatlar verilmişdir. M.Ş.Vazehə dair bir formulyar vərəqədə isə deyilir: *1849-cu ildə Gəncə qəza məktəbində Azərbaycan dili müəllimi olub, 12-ci sinfə mənsubdur, 40 yaşındadır, ruhani təbəqəsindəndir. Əvvəllər Gəncədə ərəb və fars dillərindən xüsusi (fərdi) dərs verməklə məşğul olub;*

*1840-cı il noyabrın 24-də Tiflis qəza məktəbinə Azərbaycan dili müəllimi vəzifəsinə təyin olunub.*

*1846-cı il noyabrın 12-də Gəncə qəza məktəbinə Azərbaycan dili müəllimi vəzifəsinə dəyişdirilib. Həmin sənədin sonu Tiflis məktəblər direktorunun aşağıdakı qeydi ilə bitir: "Спасобен и достоен" (f. 424, s.l. iş № 156, v. 207 arx.).*

Azərbaycan xalq maarifi muzeyinin arxivində saxlanılan bir sənəddə isə deyilir ki, Tiflis qəza məktəbindən 1840-cı il mayın 3-də Zaqafqaziya məktəblər direksiyasına göndərilən 28 saylı raportda Azərbaycan dilini tədris etmək üçün ən ləyaqətli namizədin Mirzə Şəfi Sadıq oğlunun olduğu göstərilir".

Mirzə Şəfinin pedaqoji fəaliyyətinin Tiflis dövrü zəngin hadisələrlə dolu olduğu kimi, ədəbi fəaliyyətinin də ən məhsuldar illəri olmuşdur. Tiflisin inzibati və ədəbi mühiti onun azərbaycanlı, rus, gürcü və digər xarici ölkə ziyalıları ilə, ilk növbədə M.F.Axundzadə, A.Bakıxanov, A.Berje, İ.Qriqoryev və başqaları ilə yaxından tanış və dost olmasına əlverişli şərait yaratdı. Az bir müddətdə M.Şəfi Tiflis ədəbi mühitinin tanınmış nümayəndəsi kimi məşhurlaşdı. 1844-cü ildə Mirzə Şəfi tərəfindən Tiflisdə "Divani-hikmət" adlı ədəbi-fəlsəfi məclis təşkil olunmuşdur. Qeyd edək ki, XIX əsrdə Azərbaycanın iri şəhərlərində tanınmış ziyalılar, şairlər tərəfindən təşkil edilən ədəbi məclislər geniş şöhrət tapmışdır. Burada şairlərin yeni şeirləri oxunar, hikmətli söhbətlər aparılardı. M.Ş.Vazehin "Divani-hikmət" məclisinin iştirakçıları onun özünün dostları və şagirdləri idilər. Onlardan biri də Almaniyadan Rusiyaya, oradan da Tiflisə gəlib burada müəllimlik edən F.Bodenştedt idi. O, Mirzə Şəfidən fars dilini öyrənirdi. M.Şəfi isə onun köməyi ilə Qərbi Avropanın bəzi klassiklərinin əsərləri ilə tanış olurdu.

Məlum olduğu kimi, F.Bodenştedt M.Şəfinin şeirlərini toplayıb 1846-cı ildə Almaniyaya aparmış və bir qismini alman dilinə tərcümə edərək 1851-ci ildə "Mirzə Şəfinin şərqiləri" adı ilə çap etdirmişdir.

M.Ş.Vazehin şeirləri tezliklə ingilis, italyan, norveç, isveç, yəhudi, rus və s. dillərə tərcümə olunmuşdur. M.Ş.Vazehin "Şərqilərinin" Avropada şöhrət qazandığını görən F.Bodenştedt sonralar, 1875-ci ildə özünü həmin şeirlərin müəllifi elan etmişdir.

F.Bodenştedt M.Ş.Vazehdən əvvəl digər Azərbaycan və fars şairlərinin əsərlərini də alman dilinə çevirərək 1850-ci

ildə Berlində “Şərqdə min bir gün” adı ilə çap etdirmişdir.

“Şərqilər” Qərbi Avropada və Rusiyada geniş yayılmış və onun müəllifinə dünya şöhrəti qazandırmışdır. “Şərqilər” M.Şəfinin dünyagörüşünü və pedaqoji fikirlərini müəyyən etməyə imkan verir. Bu şeirlərdə M.Şəfi ədalətlilik və humanizm ideyalarını inkişaf etdirir, zəhmətkeşin insani ləyaqətini müdafiə edir, bu dünyada həyatın fərəhini, müdrikliyin, əqlin, elmin və biliyin gücünü tərənnüm edirdi. O, xeyirxahlıq və mehribanlıq, həqiqət və gözəllik, düzlük və xoşbəxtlik kimi mənəvi keyfiyyətləri uca tuturdu.

M.Ş.Vazeh 1850-ci illərdə gimnaziyanın Şərq dilləri müəllimi İ.Qriqoryev ilə birlikdə “Kitabi-Türki” adlı oxu üçün dərs vəsaiti də hazırlamışdır.

Azərbaycan-Almaniya elmi əlaqələr itarixində məşhur Azərbaycan alimi professor Mirzə Kazımbəyin (1802-1870) adı şərəflə çəkilir. Kazan və Sankt-Peterburq universitetlərinin professoru, 33 yaşında ikən Rusiya Elmlər Akademiyasının müxbir üzvü seçilən, türk, fars, ərəb, rus, ingilis, fransız dilləri ilə yanaşı alman dilini bilən, ensiklopedik biliyə malik olan M.Kazımbəy “Rus Şərqşünaslığının patriarxı” kimi şərəfli bir ad qazanmış, üç dəfə Rusiya Elmlər Akademiyasının “Demidov” mükafatına, Böyük Britaniya kraliçasının brilyant üzüyünə layiq görülmüşdür. Professor M.Kazımbəyin əsərləri digər Avropa dilləri ilə yanaşı alman dilinə tərcümə edilərək çap edilmişdir. O, qədim və zəngin Şərq mədəniyyətinin Rusiya və Qərbi Avropada tətbiqinə çalışmışdır. Məhz bu səbəbdəndir ki, M.Kazımbəy Rusiya Elmlər Akademiyasından savayı, Böyük Britaniya, Almaniya, Fransa, Danimarka, Amerika Birləşmiş Ştatları Elmlər Akademiyasının və Elmi Cəmiyyətlərinin üzvü seçilmişdir.

Azərbaycan-Almaniya elmi-pedaqoji, ədəbi-ictimai əlaqələrinin yaranması və inkişafı, həm də Almaniyanın təhsil ocaqlarında, xüsusi ilə də universitetlərdə təhsil alan azərbaycanlı gənclərin fəaliyyəti ilə bağlı olmuşdur. Onardan biri də tanınmış pedaqoq, publisist Məhəmməd Ağa Şahtaxtlıdır (1846-1931).

Məhəmməd Sultan oğlu Şahtaxtlı 1846-cı ildə Şərur-Dərələyəz qəzasının Şaxtaxtlı kəndində anadan olmuşdur. İlk təhsilini Naxçıvan şəhər məktəbində almış, sonralar Tiflis gimnaziyasını bitirmişdir. Ali təhsil almaq məqsədilə Peterburqa getmiş, orada alman dilini öyrənmiş, təhsilini Almaniyanın Leypsiq universitetində davam etdirmiş, sonra isə Fransanın məşhur Sarbonna Universitetinin Şərq dilləri fakültəsini bitirmiş, uzun müddət Rusiya və Qərb mətbuatında mühərrirlik etmiş, mühazirələr oxumuş, dövri mətbuatda məqalələr nəşr etdirmişdir.

Bir sıra dilləri, təxminən 12 dili dərindən bilən Məhəmmədağa Avropanın elmi və ictimai mühitində böyük hörmət qazanmışdır. Rusiya İmperator Coğrafiya Cəmiyyətinin həqiqi üzvü seçilmişdir. M.Şahtaxtlının fəaliyyəti Almaniya, Amerika, İran və Türkiyədə də maraq doğurmuşdur.

1882-ci ildə “Qafqaz” qəzetinin səhifələrində dərc etdirdiyi “Müsəlmanların məktəb həyatı” başlıqlı silsilə məqalələr onun Qərbi Avropa və Rusiya ilə yanaşı Azərbaycan xalq maarifi və məktəb təhsilinin vəziyyəti ilə dərindən tanış olduğuna dəlalət edir. O, xalqın maariflənməsi üçün yollar axtarır, ana dilində dərsliklər yazıb nəşr etdirmişdir.

M.Şahtaxtlının 1906-1907-ci illərdə Tiflisdə nəşr etdirdiyi üç hissədən ibarət “Ana dili” adlı dərslikləri və “Təkmilləşmiş müsəlman əlifbası” Azərbaycan ictimai-pedaqoji həyatında mühüm hadisə idi.

M.Şahtaxtlı 1902-ci ildə nəşr etdirdiyi “Sövti Şərq əlifbası” və 1903-cü ildə nəşr

etdirdiyi "Xətti-Məhəmmədağa" adlı əsərləri mövcud ərəb əlifbasını sadələşdirmək yolunda atılan mühüm addım idi. Nəhayət, 1903-1905-ci illərdə Tiflisdə nəşr etdirdiyi "Şərqi-rus" qəzeti ilə xalqın mədəniyyətə qovuşması üçün yollar axtarırdı.

Ensiklopedik biliyə malik olan M.Şahtaxtlı demokratik maarifçilik mövqeyindən çıxış edirdi. Azərbaycanda Sovetlər hakimiyyəti qurulduqdan sonra Azərbaycan Dövlət Universitetində professor vəzifəsində çalışmışdır. Zəngin irsə malik Avropa və Rusiya məktəb həyatına yaxından bələd olan M.Şahtaxtlı Azərbaycanda məktəb təhsilinin inkişafında xüsusi rol oynamışdır.

Avropanın mütərəqqi pedaqoqlarının pedaqoji ideyalarının Azərbaycanda yayılması da yuxarıda göstərilən əlaqələrin qızıl səhifələrini təşkil edir. Azərbaycanda fəaliyyət göstərən orta və ali pedaqoji məktəblərdə təhsil alan gənclərin bu ideyalardan faydalanması buna sübutdur. Bu məktəblərin tədris proqramlarına daxil edilmiş Avropa pedaqoqlarından J.A.Komenski, İ.H.Pestalotsi, J.J.Russo, C.Lokk ilə bərabər məşhur alman pedaqoqu Adolf Disterverqin (1790-1866) ideyaları müəllimlik peşəsinə hazırlaşan gənclərin pedaqoji dünyagörüşünün formalaşmasına təsir edən başlıca amillərdəndir.

A.Disterverqin həyatı və fəaliyyəti Azərbaycanın pedaqoji universitetlərində tədris edilən "Pedaqogika tarixi" dərsliyində özünə layiq yer tutmuşdur. Bu dərsliyin müəllifi proffesor Ə.Y.Seyidov (1892-1977) onun ideyalarını aşağıdakı kimi səciyyələndirmişdir:

A.Disterverq təlim və tərbiyədə silkilik, milli məhdudluq və kilsənin məktəb üzərindəki himayəsinə qarşı çıxmışdır. Russonun və Pestalotsinin mütərəqqi ideyalarını yaymış və inkişaf etdirmişdir. Mütərəqqi alman müəllimləri hələ sağlığında ikən haqlı olaraq ona "Alman müəllimlərinin müəllimi" kimi şərəfli bir ad vermişlər. Onun əsərləri müxtəlif dillərə tərcümə edilmiş, Disterverqin adına xüsusi medal təsis edilmişdir. Disterverqin pedaqoji ideyaları dövrünün alman pedaqojisi dairəsində qalmamış, onun ümuminsanlıq tərbiyəsi kimi mütərəqqi ideyaları Rusiyada, eləcə də Azərbaycanda özünə tərəfdarlar tapmışdır. Professor Ə.Y.Seyidovun fikrincə "Disterverqin pedaqoji fikirləri yalnız tarixi əhəmiyyətə malik deyildir. Orada bu gün üçün öz əhəmiyyətini itirməmiş bir sıra faydalı cəhətlər vardır."

Sovetlər birliyi illəri Azərbaycan–Almaniya əlaqələri, öz inkişafının yeni mərhələsini təşkil edir. Bu illərdə alman ədəbiyyatının görkəmli nümayəndələrinin əsərləri Azərbaycan dilinə tərcümə edilərək çap olunmuşdur. Onlardan İ.V.Hötenin "Faust", "Gənc Verterin iztirabları", F.Şillerin pyesləri, H.Haynenin şeir və poemaları, G.Hauntman, L.Feyxtvanger, E.M.Remark və başqalarının bəzi əsərləri Azərbaycan dilinə tərcümə olunmuşdur.

İkinci Dünya müharibəsindən sonra Azərbaycan ilə Almaniya elmi idarələri arasında elmi-texniki əlaqələr yaradılmışdır.

Azərbaycan Milli Elmlər Akademiyasının Fizika, Qeyri–üzvi və Fizika-Kimya İnstitutları, həmçinin Şamaxı Astrofizika Rəsədxanası Almaniyanın elmi müəssisələri ilə əməkdaşlıq etmişlər.

Keçən əsrin 60-cı illərindən sonra Alman gənclərinin Azərbaycanda, Azər-baycan gənclərinin isə Almaniyada təhsil almaları bu əlaqələrin zirvəsini təşkil edir.

Bu gün müstəqil Azərbaycan Respublikasında fəaliyyət göstərən Azərbaycan Dillər Universitetində alman dili fakültəsi mövcuddur.

Alman dili Azərbaycan Respublikasının bir sıra ümumitəhsil, orta ixtisas təhsili və ali təhsil müəssisələrində də tədris olu-

nur. Ümumtəhsil məktəblərinin 5-10-cu sinifləri, habelə ali məktəblər üçün alman dili dərslikləri yaradılmışdır.

Azərbaycan ziyalılarının bir sıra əsərləri alman dilinə tərcümə edilərək nəşr olunmuşdur.

Bu gün Azərbaycanda alman dili və ədəbiyyatının tanınmış mütəxəssislər dəstəsi səmərəli fəaliyyət göstərir.

## İstifadə edilmiş ədəbiyyat

1. Əhmədov H. XIX əsr Azərbaycan məktəbi. Bakı, 2006.
2. Əhmədov H. Azərbaycan pedaqoji antologiyası. 3 cilddə. II cild. Bakı, 2011.
3. Qriqoryev İ. Mirzə Şəfi Vazeh Kitabi-Türki transliterasiya və faksimile. Çapa hazırlayan Hüseyn Əhmədov. Bakı, 2010.
4. Seyidov Ə. Pedaqogika tarixi. Bakı,1968.
5. Azərbaycan-Almaniya dostluğunun XXI əsr təməli. // "Azərbaycan" qəzeti, 1997, 29 oktyabr.
6. Azərbaycan-Alman mədəni maarif əlaqələri genişlənir.//"Azərbaycan" qəzeti, 2001, 10 yanvar.
7. Şükürova (Fuad) E. "Yeni körpü" Azərbaycanla Almaniya arasında mədəniyyət körpüsüdür. //"Respublika" qəzeti, 2004, 5 noyabr.
8. Qasımov E. Azərbaycan-Almaniya əməkdaşlığının mədəni əlaqələrinin istiqamətləri. (1996-2004-cü illər) // "Pedaqoji Universitet xəbərləri". Bakı, № 3, 2014.
9. Муллер Б. "Талышский язык". Москва изд. АН СССР, институт языкознания, 1953.
10. Модзалевский Л. Ход учебного дела на Кавказе с 1802 по 1880 г. В книге "Памятная книжка Кавказского Учебного Округа на 1880". Тифлис, 1880.
11. Die Gedichte von Mirza Schaffi Wazeh. Düsseldorf,den 6 Dezember 1983. West Germany.

**Г.Ахмедов**

**Об историю и научно-педагогических связей между Азербайджаном и Германией**

**Резюме**

Взгляд на историю Азербайджано-Германского научно - педагогического, и литературно - культурною отношения.

В статье анализируются некоторые исторические аспекты возникновения и развития Азербайджано-Германских научно-педагогических, и литературно-культурных отношений.

**H.Ahmadov**

**A glance at the history of Azerbaijan-German scientific –pedagogical relations**

**Summary**

Look at the history of the Azerbaijan-Germany scientific-pedagogical and literatury cultural relations.

The artical analyzed some of the historical aspects of the emergence and development of Azerbaijan-Germany scientific-pedagogical and literatury-cultural relations.



# QƏRB ÖLKƏLƏRİNDƏ İNKLÜZİV TƏHSİL

**Fərid Süleymanov,**
***Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutunun böyük elmi işçisi və doktorantı***

***Açar sözlər:*** *inklüziv təhsil, xüsusi təhsil, xüsusi qayğıya ehtiyacı olan uşaqlar, Avropa, resurs mərkəzləri.*

***Ключевые слова:*** *инклюзивное образование, специальное образование, детей с особыми потребностями, Европа, ресурсные центры.*

***Key words:*** *inclusive education, special education, children with special needs, Europe, resource centers.*

Ölkəmizdə son illərdə inklüziv təhsilə xüsusi fikir verilir. Hazırda respublikamızın 20-dən çox təhsil müəssisəsində bu təlim metodundan istifadə olunur. Qərb ölkələrində, xüsusilə Avropa ölkələrindəki inklüziv təhsilin tarixi, inkişaf mərhələləri və formalaşması bir-birindən müəyyən mənada fərqlənsə də, əsasən, eyni dəyər və məqsədlər üzərində təşəkkül tapıb. Avropa ölkələrinin hər birində inklüziv təhsil bu və ya digər formada və səviyyədə mövcuddur. Mərkəzi və Şərqi Avropa dövlətləri keçən əsrin 90-cı illərinədək Sovetlər İttifaqının nüfuz dairəsində qaldıqlarından bu ölkələrin təhsil sistemində Sovet təhsil sisteminin dəyərləri hakim idi ki, bu sistemdə də fiziki və intellektual inkişafında ləngimələr olan insanlara soyuq münasibət onları, təhsil də daxil olmaqla, ictimai həyatın bütün sferalarından təcrid olunmuş saxlayırdı. İnklüziv təhsilin daha mükəmməl formaları isə liberal dəyərlərin daha zəngin olduğu demokratik Skandinaviya, Qərbi Avropa ölkələri, ABŞ, Kanada, Avstraliya kimi inkişaf etmiş ölkələrdədir. Məhz buna görə bu məqalədə adı çəkilən ölkələrin təcrübəsi araşdırılmışdır. Qeyd edilməlidir ki, inklüziv təhsil həm xüsusi, həm də ümumi təhsilin vəhdətində formalaşmışdır. Yəni inklüziv təhsil hər iki təhsil növünün təcrübəsindən faydalanmaqdadır, lakin burada xüsusi təhsilin çəkisi nisbətən üstünlük təşkil etdiyindən bu məqalədə inklüziv təhsilin inkişaf tarixi xüsusi təhsilin fonunda təhlil edilir.

İnklüziv təhsil aparılan məktəblərimizə əməli kömək etmək məqsədilə bir sıra ölkələrin bu sahədə işlərindən bəhs edilməsini məqsədəuyğun sayırıq.

İnklüziya məfhumu **Norveç** hökumətinin təhsil siyasətinin əsas prinsipini təşkil edir. Təhsil siyasətində qarşıya bir məqsəd kimi qoyulan inklüziya konsepsiyası müxtəlif sosial təbəqələrdən, etnik qruplardan, fərqli din və dilləri, müxtəlif əqli və fiziki imkanları olan uşaq, yeniyetmə və gənclərin təhsilin bütün pillələrində bərabər hüquqlara sahib olmaqla birgə keyfiyyətli təhsil almasını nəzərdə tutur. İnklüziv təhsilin fəlsəfəsi ölkədə “pozitiv diskriminasiya” (müsbət ayrı-seçkilik) prosesinə rəvac verir. Təhsil siyasətində o da nəzərdə tutulur ki, keyfiyyətli təhsil vermək üçün təhsil hər bir təhsilalanın maraq və qabiliyyətinə uyğunlaşdırılmalı, onların rəvan inkişafını təmin etmək məqsədilə məktəblər əlverişli akademik və sosial mühit təmin etməlidirlər.

Çünki şagirdlərin əldə etdiyi bilik, bacarıq və səriştə ilə uyğunlaşdırılmış təhsil arasında birbaşa qarşılıqlı sıx əlaqə mövcuddur. Norveç təhsil qanununda uyğunlaşdırılmış (adaptasiya edilmiş) təhsil dedikdə şagirdin təlim və tədris prosesindən maksimum faydalanmasını təmin etmək məqsədilə tətbiq edilməsi mümkün olan bütün tədbirlər məcmusu nəzərdə tutulur. Bu tədbirlərə təlim metodlarının diferensiallaşdırılması, təlim materiallarının, əyani vəsaitlərin tələblərə uyğunlaşdırılması və s. daxildir. Uyğunlaşdırılmış təhsil anlayışı təkbətək təlim prosesini qəti şəkildə yolverilməz hesab edir. Bu isə o deməkdir ki, uyğunlaşdırılmış təhsilin tətbiq edilməsi prosesi şagirdin xüsusi qayğıya ehtiyacı olub-olmadığını aşkarlamaqda effektiv vasitədir. Lakin tövsiyə edilir ki, şagirdin xüsusi təhsilə cəlb olunmasında tələskənliyə yol verilməsin və məktəblər inklüziv təhsil çərçivəsində bütün imkanlarını səfərbərliyə alsınlar. Xüsusi qayğı tələb edən şagird üçün sinif daxilində dəstəkverici təlim mümkün qədər elə təşkil edilməlidir ki, şagird sinifdən təcrid olunmasın. Dəstəkverici təlimin səmərə verməsi üçün şagirdin potensial imkanlarını nəzərə alan real tələblər qoyulmalı və nəticə dəqiq qiymətləndirilməlidir. XQEU-nun dolğun inkişafını təmin etmək məqsədilə Norveç Təhsil və Tədqiqat Nazirliyi inklüziv təhsilə yardım edən resurs mərkəzlərinin fəaliyyətinə dəstək verir və məktəblərdə psixoloq xidmətinin keyfiyyətini artırmaq üçün tədbirlər görür.

Salamanka Bəyannaməsindən sonra isə Norveçdə (eləcə də bütün dünyada) inklüziv təhsilin yeni çağırışları ortaya çıxdı və bu çağırışların öhdəsindən gəlmək üçün bir sıra tədbirlər həyata keçirildi.

Norveç inklüziv təhsilə keçiddə inqilabi islahatlar aparan, demək olar ki, yeganə ölkədir. Belə ki, Norveçdə 1951-ci ildə qəbul olunmuş Xüsusi Təhsil haqqında Qanun 1976-cı ildə Təhsil haqqında Qanunun tərkib hissəsinə çevrilir. Yeni təhsil qanununa əsasən xüsusi məktəblər bağlanır, yaxud da xüsusi təhsil üçün resurs mərkəzlərinə çevrilir. XQEU isə ümumtəhsil məktəblərində təhsil almaq hüququ əldə edir. Təşkil olunan resurs mərkəzlərinin əsas məsuliyyəti ölkədəki bütün XQEU-a keyfiyyətli təhsilin verilməsi üçün lazımi tədbirlər həyata keçirməkdir.

Bütün bu tədbirlərin tədrici surətdə icrası ilə yanaşı bəzi kritik suallar da təhsilin qərar öndərlərini düşündürürdü: inklüziya perspektivindən əslində hər bir fərdə yanaşma necə olmalıdır; təlim metodlarını ən səmərəli şəkildə necə diferensiallaşdırmaq mümkündür; təlimdə “öyrətmə” perspektivindən “öyrənmə” perspektivinə necə keçmək olar. Bütün bu sualların cavabı ondadır ki, inklüziv təhsilin sağlam təməlini qoymaq üçün məktəblərin göstərdiyi xidmətdən əlavə olaraq dəstək sistemi təşkil olunmalıdır. Məhz bu tələb əsasında Norveçdə iki səviyyəli “dəstək xidməti” mərkəzi fəaliyyətə başladı.

**İsveçdə** 1842-ci ildə ümumtəhsil məktəbləri haqqında qanunun qəbul edilməsi ilə ölkədə icbari təhsilin əsası qoyulmuş olur. Buna qədər təhsil ancaq cəmiyyətin orta və yuxarı təbəqəsi üçün əlçatan idi. Yeni qanun isə bütün vətəndaşların təhsilə cəlb olunmasını nəzərdə tuturdu. Qanunda nəzərdə tutulmasa da reallıqda paralel olaraq iki ümumtəhsil məktəb sistemi ortaya çıxdı: biri yoxsul və digər risk qrupuna daxil olan ailələrin uşaqları üçün, digəri isə kübar ailələrin uşaqları üçün. Bu tarixdən etibarən xüsusi təhsilin də əsası qoyulmuş oldu. Belə ki, təsis edilən xüsusi təhsil müəssisələrinə müxtəlif adlarla damğalanan əqli və fiziki qüsurlu uşaqlar cəlb olunurdular. İsveç sosial rifah ölkəsi kimi formalaşdıqdan sonra təhsil də cəmiyyətin əsas təməl daşlarından birinə çevrildi. Təhsilalanların bərabər-

hüquqluluğunu təmin etmək və təhsilin keyfiyyətini artırmaq məqsədilə İsveç hökuməti təhsildə bir neçə dəfə islahat keçirmişdir. Artıq XX əsrin 60-70-ci illərindən etibarən "hamı üçün məktəb" anlayışı İsveçdə təhsilə dair bütün qanunvericilik aktlarının əsasını təşkil etdi. Hazırkı dövrdə də təhsil qanununun təməlində "bütün şagirdlər fərqlidir" prinsipi durur. İsveç milli kurikulumunda göstərilir ki, təlim zamanı hər bir şagirdin özünəməxsus müxtəlif qabiliyyət və ehtiyacları nəzərə alınmalı, buna müvafiq olaraq təlim diferensiallaşdırılmalıdır. Bununla belə tədris materiallarını mənimsəməkdə çətinliyi və xüsusi dəstəyə ehtiyacı olan şagirdlərə qeydsiz-şərtsiz xüsusi diqqət ayrılır.

İsveçdə eşitmə, görmə və kəskin nitq qüsurları olan uşaqlar üçün 3 dövlət və 5 regional xüsusi məktəb fəaliyyət göstərir. Lakin XQEU-nun əksəriyyəti ümumtəhsil müəssisələrində təhsil alır.

**Finlandiyada** xüsusi təhsilin tarixi XIX əsrin əvvəllərindən başlayaraq dörd inkişaf mərhələsi keçmişdir. Finlandiyada xüsusi təhsilin müxtəlif istiqamətlərdə inkişafı 1940-1960-cı illərdə də baş vermişdir. Belə ki, bu dövrlərdə xüsusi təhsildə yeni təmayüllər meydana çıxmış, qüsurlu uşaqların imkanlarına uyğunlaşdırılmış təlim metodlarından istifadə genişlənmişdir. Lakin bu dövr ərzində XQEU-nun təhsili müstəvisində tibbi yanaşma hələ də öz hökmranlığını qoruyurdu. Məsələyə uşaqlarda var olan qüsurların perspektivindən baxışın olması bu uşaqların ümumtəhsil məktəblərində digər uşaqlarla birgə təhsil almasını mümkünsüz edirdi.

1983-cü ildə təhsil haqqında qəbul edilmiş yeni qanun da inteqrasiya prosesinə güclü təkan verdi. Yeni qanunun müddəalarına əsasən heç bir uşaq təhsildən məhrum edilə bilməzdi. İnteqrasiya prosesini sürətləndirən digər tədbir 1985-ci ildə müfəssəl milli kurikulumun qəbul edilməsi oldu. Yeni kurikulum təhsilin diferensiallaşdırılması və individuallaşdırılması məsələlərini qaldırdı. Yeni kurikulumun mütərəqqi prinsiplər əsasında hazırlanması xüsusi təhsilin tədris proqramını da özündə ehtiva etməyə imkan yaratdı və bu da öz növbəsində XQEU-nun ümumtəhsil məktəblərinə cəlb olunmasına yol açdı.

Xüsusi təhsilin ən mütərəqqi və müasir forması hesab olunan inklüziv təhsilə keçid prosesində Finlandiyada genişmiqyaslı tədbirlər planı həyata keçirildi. Belə ki, xüsusi təhsilin kurikulumu ləğv edildi və bundan sonra XQEU-un təlimi üçün FTP əsasında fərdiləşdirilmiş kurukilumdan istifadə olunmağa başlandı. Həmçinin ümumtəhsil müəssisələrində formalaşdırılmış "şagird rifahı xidməti"nin təklifləri kurikulumun hazırlanmasında hökmən nəzərə alınmalı idi.

**Avstriyada** XX əsrin 80-ci illərində valideynlər XQEU üçün inklüziv təhsil tələbi ilə çıxış etməyə başladılar və bu tələblər əsasında pilot layihələrin icrasına başlandı. Hazırda 3 tip məktəbəqədər təhsil müəssisəsi var – ümumi, inklüziv və xüsusi. 1993-cü ildə qəbul edilmiş qanunla XQEU ümumtəhsil müəssisələrində ibtidai sinifdə təhsil almaq hüququ əldə etdi. 1996-cı ildən etibarən isə XQEU yuxarı siniflərdə də təhsil almaq hüququ əldə etdi. Bu yenilik orta məktəblərdə təhsilin keyfiyyətini artırmağa (təlimin diferensiallaşdırılması, idarəetmə və dərs vəsaitlərinin təkmilləşdirilməsi) təkan verdi. Rayon təhsil idarəsi (xüsusi təhsil mərkəzlərinin (xüsusi məktəblər) rəyi əsasında) uşağın qüsurlarından asılı olaraq təlim prosesində əlavə dəstəyə ehtiyac olub-olmamasına qərar verir. Digər bir sıra Avropa ölkələrində olduğu kimi Avstriyada da xüsusi təhsil mərkəzləri inklüziv təhsil verən məktəblərə bütün lazımi köməkliyi edir (ekspert rəyi,

valideynlərlə iş, müəllimlərin təlimi və s.).

Avstriyada birgə təhsilin aşağıdakı modelləri tətbiq olunur: 1. İnklüziv siniflər – bu siniflərdə bir neçə müəllim (əsasən 2) komanda halında çalışır; 2. Müəllim köməkçisi olan dərslər – bu dərslərdə təhsil alan XQEU ehtiyaclarından asılı olaraq həftədə bir neçə saat müəllim köməkçisinin yardımından faydalanır. Avstriyada eyni zamanda 10 müxtəlif təyinatlı xüsusi məktəb fəaliyyət göstərir. Burda kurikulum, təlim metodları və materiallar uşaqların ehtiyaclarına uyğunlaşdırılmışdır.

**Almaniya** xüsusi təhsildə 1960-cı illərdən başlayaraq mütəmadi tənzimləmə işləri aparır (qanunvericilik, islahat və s.). XQEU bütün mümkün hallarda inklüziv təhsilə cəlb olunur, lakin bununla belə ölkə üzrə inklüziv təhsilə cəlb olunma səviyyəsi 20 faizdir. Almaniyada xüsusi təhsil müəssisələri öz əhəmiyyətini saxlamaqdadır. Belə ki, Almaniyada əqli və fiziki qüsurun formasından və dərəcəsindən asılı olaraq 10 müxtəlif təyinatlı xüsusi məktəb fəaliyyət göstərir. Lakin inklüziv təhsil ideyasının dalğası Almaniyadan da yan keçməyib. 80-ci illərdən etibarən inklüziv təhsil üzrə pilot layihələrin icrasına başlandı. 90-cı illərdən etibarən bu pilot məktəblər standart məktəblərə çevrildi. Yeni tipli xüsusi təhsilin (inklüziv təhsil) formalaşmasına əsas səbəb kimi aşağıdakı amillər göstərilir: demokratik dəyərlərin qabardılması, fiziki və əqli qüsur anlayışına münasibətin dəyişməsi, təhsil paradiqmalarının dəyişməsi, yeni təlim metodlarının təklif edilməsi, yeni texnologiyalar əsasında diaqnostika üsullarının təkmilləşdirilməsi, erkən müdaxilə sisteminin yaradılması və s.

Almaniyada XQEU üçün təşkil olunan təhsilin aşağıdakı formaları var: 1. İnklüziv təhsil - xüsusi qayğıya ehtiyacı olan uşaqlar ümumi təhsil müəssisələrində bu şərtlə təhsil ala bilərlər ki, təlim prosesində onlar üçün xüsusi dəstək təmin edilsin. 2. İnteqrativ təhsil (müştərək əməkdaşlıq meyarları əsasında) - eyni təhsil müəssisələrində təşkil olunan ümumi və xüsusi təhsil forması (birgə dərslər təşkil olunur, bu proses inklüziv təhsilə keçidi sürətləndirir). 3. Xüsusi təhsil üzrə resurs mərkəzləri – bu mərkəzlərin məqsədi xüsusi təhsil müəssisələrini geniş fəaliyyət və səlahiyyət sahibi olan resurs mərkəzlərinə çevirməkdir. 4. Fənlər üzrə xüsusi təhsil - xüsusi təhsil mütəxəssisləri müəyyən fənlər üzrə xüsusi qruplarda dərslər təşkil edir.

Digər bir sıra Avropa ölkələri kimi **İsveçrədə** də xüsusi təhsil XIX əsrin əvvəllərindən təşəkkül tapmağa başlamışdır. İsveçrədə 1810-cu ildə açılan ilk xüsusi təhsil müəssisəsi Zürix şəhərindəki görmə qabiliyyətini tamamilə itirmiş uşaqlar üçün məktəb olmuşdur. 1811-ci ildə eşitmə qabiliyyətini itirmiş uşaqlar üçün xüsusi məktəb təsis olunmuşdur. 1882-ci ildə isə öyrənmə çətinliyi olan uşaqlar üçün xüsusi məktəb fəaliyyətə başlamışdır. 1960-cı ildə müvafiq qanunlar tədrisi xüsusi kurikulum əsasında təşkil edən təhsil müəssisələrinin işini daha da sürətləndirdi. İsveçrədə mərhələli tədbirlərin və islahatların icrasından sonra 2008-ci ilədək xüsusi təhsil ümumi təhsil sisteminin tam tərkib hissəsinə çevrilmişdir.

Xüsusilə vurğulamaq lazımdır ki, İsveçrədə erkən müdaxilə sisteminə çox böyük önəm verilir. Ölkədə 100-dən çox erkən müdaxilə xidməti göstərən müəssisə (dövlət və özəl) var.

Təlim prosesində şagirdlərin xüsusi yardıma ehtiyacı aşkarlandıqda, onlar üçün xüsusi spesifik yanaşma və strategiyaya əsaslanmış xüsusi təhsil təşkil edilir. Hər şeydən əvvəl, məktəb səviyyəsində xüsusi təhsilin təşkili üçün müəyyən tədbirlər görülür. Bu kifayət etmədikdə məktəbdənkənar əlavə resurslardan istifadə olunur. Bu zaman

uşağın fərdi ehtiyaclarını daha dəqiq müəyyənləşdirmək üçün standart qiymətləndirmə proseduru icra olunur.

Ölkədə, əsasən, beş istiqamətdə (intellektual inkişafında problemləri olan uşaqlar, fiziki qüsurları olan uşaqlar, ciddi davranış pozuntuları olan uşaqlar, eşitmə, görmə, nitq problemləri olan uşaqlar və xroniki xəstəliyi olan uşaqlar üçün məktəblər) xüsusi təhsil müəssisəsi fəaliyyət göstərir. Xüsusi təhsilin digər forması ümumi təhsil müəssisələrində təşkil olunan xüsusi siniflərdir. Bu təhsil formasının ibtidai sinif səviyyəsində təşkil olunan siniflərində, adətən, 14-dən çox şagird olmur və təlim adaptasiya edilmiş kurikulum əsasında aparılır. Orta təhsil səviyyəsində isə təlim ixtisar edilmiş kurikulum əsasında müxtəlif tipli məşğələlərin tətbiqi ilə aparılır.

Göründüyü kimi, inklüziv təhsil, əsasən, sosial sifariş kimi təhsil sferasına daxil olsa da müəyyən inkişaf mərhələsində təhsil sistemində özünə yer tutmuş və istər təhsilin idarəetməsi, istərsə də təlimin diferensiallaşması baxımından təhsilə töhfələr vermişdir. Məhz bu keyfiyyətini nəzərə alaraq hesab etmək olar ki, özünü sübut etmiş bir təhsil forması kimi inklüziv təhsilin ölkəmizdə də inkişaf etdirilməsi bir zərurətdir.

**ABŞ-da** bu sahədəki müvafiq ədəbiyyatların təhlili göstərir ki, təhsilin bir sıra innovasiyaları və yeni paradiqmaları kimi inklüziv təhsil konsepsiyası da ABŞ-dan başlanğıcını götürmüşdür. XIX əsrdən eti-barən güclü mühacir axınına məruz qalan ABŞ müxtəlif dil, din, irq və sosial zümrədən olan insanlar arasında sosial uçurumun yaranmasından narahat idi. Buna görə də dövrün görkəmli ictimai xadimi və təhsil eksperti Horas Mann (1796-1859) təklif etdi ki, dövlət fərqli dil, din, irq və sosial statusa malik uşaqların birgə təhsil alması üçün dövlət məktəbləri açsın. H.Mannın fikrincə, birgə təhsil alan uşaqlar erkən yaşlardan insanların fərqliliklərini əxz edir və hörmət edir. Bu tipli məktəblər uşaqlarda ortaq dəyərlər, tolerantlıq aşılayır və beləliklə, cəmiyyətdə fərqli millətlərdən olan insanlar çoxmədəniyyətli ictimai mühitdə əmin-amanlıq şəraitində yaşayacaqdır.

1954-cü ildə Kanzas ştatı məhkəməsinin qərarı ilə həmin ştatda afroamerikalı uşaqlar onlar üçün nəzərdə tutulmuş xüsusi məktəblərdə deyil, ağdərili amerikalılarla birgə dövlət ümumtəhsil məktəblərində təhsil almaq hüququ əldə etdilər. Məhz bu məhkəmə qərarından sonra XÜEU-nun valideynləri oxşar tələblərlə çıxış etməyə başladılar. Valideynlər iddia edirdilər ki, məktəblərin XQEU-nu qəbul etməməsi onlara qar-şı ayrı-seçkilikdir. Beləliklə, bu tələblər əsa-sında inklüziv təhsilin bünövrəsi qoyuldu. 1965-ci ildə ABŞ Konqresində qəbul edilmiş "İbtidai və Orta Təhsil haqqında Qanun"da cəmiyyətin imtiyazsız təbəqəsindən olan uşaqların təhsilə cəlb olunmasını nəzərdə tutan müddəalar öz əksini tapmışdır. 1966-cı ildə bu qanuna edilmiş dəyişiklik XQEU-nun təhsil imkanlarını yaxşılaşdırmaq və genişləndirmək məqsədilə layihə və proqramlar icra etmək üçün ştatlara xüsusi qrantlar ayrılmasını nəzərdə tuturdu. 1970-ci ildə Konqres ştatları XQEU-nu keyfiyyətli təhsilə cəlb etmək və təhsil proqramlarının intensiv icrasını təşviq etmək məqsədilə "Əlil İnsanların Təhsili haqqında Qanun" qəbul etdi.

Konqresin XQEU-nun təhsilinin vəziyyətinə dair apardığı xüsusi statistik araşdırmadan sonra məlum oldu ki, ölkədə xüsusi təhsilə və digər müvafiq xidmətlərə ehtiyacı olan 8 milyondan çox uşaq var. Bu uşaqlardan yalnız 3.9 milyonu normal təhsil ala bilir. 2.5 milyon uşaq keyfiyyətsiz təhsil alır. 1.75 milyon uşaq isə ümumiyyətlə, təhsildən məhrumdur. Bu nəticədən sonra qanunverici orqan 1975-ci ildə daha da

təkmilləşdirilmiş qanun lahiyəsini, “Əlilliyi olan bütün Uşaqlar üçün Təhsil” qanununu qəbul etdi. Bu qanun əlilliyi olan bütün uşaqların təhsil almaq hüququnu qəti şəkildə bəyan edir və elə bir idarəetmə prosesinin əsasını qoyurdu ki, ştatlar və yerli təhsil idarələri XQEU üçün təhsil xidmətlərinin təmin edilməsinə məsuliyyət daşısınlar. Təhsildə ortaya çıxan yeniliklərlə ayaqlaşmaq məqsədilə bu qanuna bir neçə dəfə əlavə və dəyişiklik edilmişdir. Sözügedən qanuna sonuncu genişmiqyaslı dəyişiklik 2004-cü ildə edildi və qanunun adı dəyişdirilərək “Əlilliyi olan İnsanların Təhsilinin İnkişafı haqqında Qanun” adlandırıldı.

Bu qanunda səmərəli inklüziv təhsil üçün vacib olan əsas amillər haqqında ətraflı müddəalar öz əksini tapmışdır. Belə ki, qanunda 6 əsas komponent göstərilib: fərdi tədris planı (FTP); ödənişsiz və keyfiyyətli dövlət təhsili; minimum məhdud mühit; müvafiq qiymətləndirmə; valideyn və müəllimin təhsildə iştirakı; hüquqların müdafiəsi. Bundan başqa, qanunda xüsusi təhsil üçün əlavə xidmət və yardım, təcrübəli və səriştəli müəllim kimi başqa digər zəruri amillər də göstərilib. Bu qanuna əsasən XQEU-nun fərdi və keyfiyyətli təhsilə olan hüquqlarının əsasında fərdi “fərdi tədris planı” dayanır və buna görə də təhsil sistemi xüsusi yanaşma tələb edən uşaqların hər birinin özünəməxsus xüsusiyyətləri nəzərə alınaraq onlar üçün “fərdi tədris planı” tərtib olunur.

“Ödənişsiz və keyfiyyətli dövlət təhsili” müddəası xüsusi təhsilin və aidiyyəti xidmətlərin dövlət hesabına təşkil olunduğunu, bu prosesə dövlətin nəzarət etdiyini və istiqamət verdiyini təsbit edir. Həmçinin bu müddəa təsbit edir ki, xüsusi təhsil (inklüziv təhsil) məktəbəqədər təhsil, ibtidai təhsil, orta və tam orta təhsil səviyyələrində təşkil olunur və bu təhsil səviyyələrinin hər birində təlim TFP-a əsasən aparılır. Qanunda “ödənişsiz və keyfiyyətli dövlət təhsili” bölməsinin salınmasının əsas məqsədi odur ki, XQEU üçün xüsusi təhsilin və digər müvafiq təhsil xidmətlərinin dövlət tərəfindən təmənnasız təmin olunması bəyan olunsun və sosial statusundan asılı olmayaraq hər bir XQEU üçün gələcəkdə firavan həyat təmin olunsun.

XQEU yalnız “müvafiq qiymətləndirmə”dən sonra inklüziv təhsilə cəlb edilirlər. Qiymətləndirmənin müvafiqliyini təmin etmək məqsədilə tibb, psixologiya və pedaqogika üzrə ekspertlərdən ibarət qiymətləndirmə qrupu təsis edilir. Qiymətləndirməyə bu cür xüsusi əhəmiyyət vermənin səbəbi ondan ibarətdir ki, bu qanun həm inklüziya prosesinin ləngiməməsi, həm də XQEU-nun keyfiyyətli təhsil ala bilməsi üçün təlim prosesi başlamadan şagird təhsildə düzgün istiqamətləndirilsin, şagirdin potensialı imkan verirsə o, inklüziv təhsil, əks halda isə xüsusi təhsil müəssisəsinə yönləndirilsin. Bundan başqa “müvafiq qiymətləndirmə”, həm də şagirdin inklüziv təhsildə hansı təlim metodlarından, əlavə resurslardan istifadə edəcəyi müəyyənləşdirilir.

Müəllim və valideynlərin təhsil prosesində əməkdaşlığı inküziv təhsil kontekstində xüsusilə əhəmiyyət kəsb edir. Elə məhz bu səbəbdən sözügedən qanunda “valideyn və müəllimin təhsildə iştirakı” müddəası ilə bu əməkdaşlığın keyfiyyəti və davamlılığı zəmanət altına alınır. Qanunda əksini tapmış “hüquqların müdafiəsi” bölməsi isə XQEU və onların valideynlərinin hüquqlarını qoruyur və onların təhsildə iştirak səlahiyyətlərini təmin edir.

**Kanadada** hər bir əyalətin özünəməxsus təhsil sistemi var və federal hökumətin bu sistemlərə təsiri çox zəifdir. Əyalətlərdə təhsil sistemi spesifik mexanizmlə fəaliyyət göstərsə də, onların hər birində xüsusi təhsilə yanaşmalar oxşardır. Kanadada müvafiq təhsil sənədlərində

“xüsusi təhsil” fiziki və intellektual problemləri olan, davranış pozuntuları olan, öyrənmə vərdişlərinin spesifik pozuntuları olan, xüsusi istedada malik uşaqlar və digər xüsusi qayğı tələb edən uşaqlar üçün təşkil edilmiş təhsil nəzərdə tutulur. Lakin Kanadanın əyalətlərində XQEU-ya istinadən müxtəlif ifadələr işlədilir. Məsələn, Ontario və Nyu-Brunsvik əyalətlərində “müstəsna ehtiyacları olan uşaqlar”, digər əyalətlərdə isə “xüsusi qayğıya ehtiyacı olan uşaqlar” terminalogiyası işlədilir. Dünyanın digər bölgələrində olduğu kimi Kanadada da tarix boyu əlilliyi olan insanlara təcridedici münasibət hakim olub. XX əsrin əvvəllərinə qədər uşaqların intellektual testlərdən keçməsi tələb olunurdu. Bu testlərdə lazımi nəticə göstərməyən uşaqlar ümumtəhsil məktəblərindən çıxarılıb institutlaşmış təhsilə cəlb olunurdular. Lakin XX əsrdən etibarən Kanadada mütərəqqi ideyaların formalaşması və yevgenika (insan nəslini bioloji yolla yaxşılaşdırmaq haqqında nəzəriyyə) hərəkatının vüsət alması xüsusi qayğıya ehtiyacı olan insanlara münasibəti müsbətə doğru dəyişməyə başladı.

1970-ci illərdə xüsusi təhsil müəssisələri ilə yanaşı inteqrasiya prosesi başladı. 1980-ci illərdə xüsusi təhsil müəssiələrinin fəaliyyətində bəzi ciddi problemlər aşkar olunmağa başladı. Bu problemlərdən çıxış yolu kimi Kanadanın bütün əyalətlərində qəti şəkildə inklüziv təhsil formasına keçməyə başladılar.

1950-ci illərdən xüsusi təhsil istiqamətində ciddi addımlar atılmağa başlandı. 1950-ci ildə hökumətin tədqiqat qrupu qismində “Kral Komissiyası”nın hazırladığı hesabatda xüsusi təhsil proqramlarının ölkə üzrə genişlənmə perspektivlərinə dair məlumat verildi. Həqiqətən də 1950-ci illərdə xüsusi siniflərin sayı iki dəfə artdı və müvafiq xidmətlərin miqyası genişləndi. Lakin bu vəziyyət yalnız şəhərlərdə mövcud idi. Bu dövrdə XQEU üçün keyfiyyətli təhsildə bərabər imkanların yaradılması istiqamətində aparılan təbliğat-təşviqat işləri nəticəsində xüsusi təhsil növbəti onilliklər ərzində cəmiyyətin diqqət mərkəzində qalmağı bacardı. 1960-cı illərdə XQEU-nun keyfiyyətli təhsili istiqamətində aparılan lobbiçilik fəaliyyəti daha da intensiv hal aldı. 1963-cü ildə təsis edilən “Əlil Uşaqlar üçün Ontario Assosiasiyası” əyalət üzrə müxtəlif ofislər vasitəsilə valideynlərlə birgə xüsusi təhsilin keyfiyyətinin artırılması üçün genişmiqyaslı təbliğat kompaniyası həyata keçirməyə başladı. 1970-ci illərdə təhsil siyasəti, təlim-tədris metodlarında, məktəb və sinif mühitinin tələblərə uyğunlaşdırılmasında mütərəqqi dəyişikliklər baş verdi. 1978-ci ilədək Ontario məktəblərində XQEU üçün aparılan xüsusi təhsilə 369 milyon Kanada dolları xərclənmişdi. Həmin dövrdə əyalətdə 11,000 xüsusi təhsil üzrə pedaqoq var idi. 120.000 uşaq xüsusi təhsilə cəlb edilmişdi. 15.000 uşaq isə təhsilə cəlb olunmağı gözləyirdi. 1978-ci ildə Təhsil Nazirliyinin qəbul etdiyi qərara əsasən məktəblər uşaqların tədris ilinin başlanğıcında təlimdə xüsusi qayğıya ehtiyacı olub-olmamasını müəyyənləşdirməli idi. Bu qərara əsasən 1981-ci ilin sonunadək bütün məktəblərdə erkən qiymətləndirmə xidməti icra olunmağa başladı. 1980-ci illərin əvvəllərində nazirliyin digər bir qərarı ilə məktəblər təlimdə çətinlik çəkən uşaqlar üçün xüsusi proqramlar tərtib etməli idi. Nəhayət, 1980-ci ildə bütün XQEU-nun ümumtəhsil məktəblərində təhsil almasını nəzərdə tutan “Təhsil haqqında” qanun qəbul edildi. Qanunda birbaşa və birmənalı surətdə göstərilirdi ki, Ontarion əyalətinin bütün məktəbləri XQEU da daxil olmaqla bütün uşaqlara təhsil xidməti verməyə məsuldurlar. Qanunda həm də göstərilirdi ki, məktəblər ehtiyacı olan şagirdlər üçün xüsusi təhsil xidməti təmin etməli, bu mümkün

olmadıqda isə bu xidmətləri digər dövlət məktəblərindən satın almalı idi. 1991-ci ildə Təhsil Nazirliyinin yeni qərarına əsasən Ontarioda ümumtəhsil məktəblərinin imkanı olduğu halda və valideynlər tələb edərsə XQEU-nun ümumtəhsil məktəblərinə inteqrasiyası və inklüziv təhsilə cəlb olunması bir daimi norma kimi qəbul edildi. Kanadada təhsilin müasir tələblərinə uyğun olaraq inklüziv təhsil sahəsində mütəmadi islahatlar keçirilir.

**Avstraliya** konstitusiyasına əsasən, ştatlar təhsil məsələlərində sərbəst idarəetməyə və digər müəyyən hüquqlara malikdirlər. Digər böyük və federativ dövlətlər kimi Avstraliyada da xüsusi təhsilin tarixi, inkişaf mərhələləri və yanaşmaları regionlar üzrə bir-birindən nisbətən fərqlənsə də onlar ümumi və ahəngdar surətdə inkişaf etmişdir.

Avstraliyada xüsusi məktəblər hələ 1890-cı illərdə açılmışdır. Bu tipli məktəblər, əsasən, eşitmə və görmə qabiliyyətini itirmiş uşaqlar üçün nəzərdə tutulmuşdu. 1920-ci illərdə isə digər növ xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün məktəblər açılmağa başlandı. Lakin XX əsrin əvvəllərində təsis edilmiş xüsusi məktəblər xeyriyyə təşkilatlarının və könüllülərin dəstəyi ilə ərsəyə gəlirdi. 1970-ci illərdən başlayaraq dövlət xüsusi məktəblərin fəaliyyətini öz öhdəliyinə götürdü. Bundan başqa, dövlət tərəfindən hətta ümumtəhsil məktəblərində xüsusi siniflər də açıldı. Xüsusi təhsilə bu dövrdə diqqətin ayrılması təsadüfi deyildi. Çünki məhz 1970-ci illərdə dünyanın bir sıra inkişaf etmiş ölkələrində, xüsusilə sosial rifah səviyyəsi yüksək olan ölkələrdə (ABŞ, Kanada, Skandinaviya ölkələri), sosial xidmətlər sferasında yeni nəzəriyyə olan “normallaşdırma” prosesi start götürür. “Normallaşdırma” prosesinin əsas prinsipi xüsusi qayğıya ehtiyacı olan insanların sosial, maddi və mədəni həyat səviyyələrini yaxşılaşdırmaq və onları cəmiyyətin digər təbəqələrinin səviyyəsinə qaldırmaq idi. Bu nəzəriyyə əlilliyi olan insanların güzəranını yaxşılaşdıran, onların cəmiyyətə inteqrasiya və adaptasiyasını uğurla təmin edən uzunmüddətli və təsirli sosial nəzəriyyələrdən biri olub. Bu sosial nəzəri cərəyan əlilliyi olan insanlar üçün keyfiyyətli təhsilin təmin edilməsində də böyük rol oynadı. Çünki cəmiyyətə inteqasiya təhsilsiz mümkünsüz olardı. Yeni təhsil siyasəti XQEU-nun ümumtəhsil məktəblərinə inteqrasiyasını nəzərdə tuturdu, lakin ağır əlilliyi olan uşaqlar üçün ixtisaslaşmış məktəblərin saxlanılması təhsil siyasətinin tərkib hissəsi idi.

Bir sıra ölkələrdən fərqli olaraq əlilliyi olan insanların təhsil hüquqlarını və aidiyyəti olan digər məsələləri özündə ehtiva edən təhsil haqqında xüsusi bir qanun yoxdur. Lakin bu boşluğu 1992-ci ildə qəbul edilmiş “Anti-diskriminasiya haqqında” qanun, digər ştat və federal səviyyədə qəbul edilmiş qanunlar doldurur. Bu qanunlar bütün gərəkli xidmətlərlə yanaşı xüsusi qayğıya ehtiyacı olan insanlar üçün onları diskriminasiyaya məruz qoymadan təhsil xidmətlərinin verilməsini nəzərdə tutur. 1992-ci il qanununa qədər inklüziv təhsili hüquqi surətdə tələb edən birbaşa qanun olmasa da Avstraliyanın qoşulduğu beynəlxalq konvensiyalar bunu tələb edirdi. “Anti-diskriminasiya haqqında” qanunu aşağıdakıları təsbit edir: əlilliyi olan insanlara qarşı diskriminasiya hallarını mümkün qədər aradan qaldırmaq; əlilliyi olan insanlara digər insanlarla yanaşı bərabər imkanlar yaratmaq; əlilliyi olan insanların cəmiyyət tərəfindən qəbul edilməsini və xoş qarşılanmasını təşviq etmək.

Dünyanın bir sıra inkişaf etmiş ölkələri ilə yanaşı Avstraliyada da dövlətin qayğısından başqa qeyri-hökumət təşkilatları və xeyriyyə təşkilatları xüsusi qayğıya ehtiyacı olan insanların sosial tələbatlarını, təhsil ehtiyaclarını təmin etmək məqsədilə

təşkilati və şəxsi surətdə təşəbbüslər irəli sürürlər. Məhz bu təşəbbüslər sayəsində əlilliyi olan insanların rifah halı yüksəlir və onlar cəmiyyətə lazımınca inteqrasiya edə bilirlər.

Göründüyü kimi, inklüziv təhsilin inkişafına rəvac verən amillərdən biri də xüsusi təhsil təcrübəsinin zəngin olmasıdır. Bir sıra ölkələrdə inklüziv təhsilə radikal keçid həyata keçirilsə də xüsusi təhsil müəssisələrindən birmənalı şəkildə imtina edilməmiş, əksinə onların təcrübəsindən məharətlə istifadə edilmişdir. Çünki inklüziv təhsil ümumtəhsil müəssisələrində təşkil edilsə də xüsusi qayğıya ehtiyacı olan uşaqlarla işləmək üçün ixtisaslaşmış kadrların təcrübəsindən istifadə edilir ki, bu kadrlar da, əsasən, xüsusi təhsil müəssisələrində püxtələşirlər. Bu baxımdan inklüziv təhsili səmərəli əsaslarla təşkil etmək məqsədilə xüsusi və ümumtəhsil müəssisələrinin təcrübəsindən bərabər surətdə faydalanmaq vacibdir.

***Rəyçi: p.ü.e.d. H.Əhmədov***

## İstifadə edilmiş ədəbiyyat

1. Abbasov A. İnkişaf etmiş ölkələrdə Pedaqoji İnternatura. Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutunun dərgisi. Elmi Əsərlər, № 1, 2015, Cild 56, № 1, 2015, ISSN 2409-8817.
2. Əhmədov H. Azərbaycan Təhsilinin İnkişaf Strategiyası. Bakı: Elm, 2010.
3. Xüsusi və inklüziv təhsilin inkişafı üzrə Avropa Agentliyi, https://www.european-agency.org
4. The Salamanca Statement And Framework for Action on Special Needs Education. Adopted by the World Conference on Special Needs Education: Access And Quality Salamanca, Spain, 7-10 June 1994.
5. Kathy C. Inclusive Education in the Early Years: Right from the Start, 2014.
6. Lacey P. On a Wing and a Prayer: Inclusion and Childen with Svere Learning Difficulties. London: Mencap, 1999.
7. İnklüziv təhsil günün tələbidir. //Azərbaycan məktəbi, 2012, №4.

**Ф. Сулейманов**

**Развитие инклюзивного образования в Европе**

**Резюме**

В этой статье, говориться об особенно развитых и с научно-педагогической точки зрения обогащенных нескольких инклюзивных моделях образования западных стран, его этапах развития и перспектив будущего развития.

**F.Suleymanov**

**Inclusive education in western countries**

**Summary**

This article deals with inclusive education in some western countries, which has considerably developed and enriched in terms of scientific-pedagogical perspective, as well as development stages and future improvement perspectives.

# AXTARIŞLARIN UĞURLU NƏTİCƏLƏRİ

**Fikrət Aslanov,**
***filologiya üzrə elmlər doktoru, professor***

***Açar sözlər:*** *koqnitiv, koqnitiv linqvistika, koqnitiv sistem.*
***Ключевые слова:*** *когнитив, когнитивная лингвистика, когнитивный систем.*
***Key words:*** *cognitive, cognitive linguistics, cognitive system.*

Elmin, texnologiyanın inkişafı ilə, siyasi, ictimai quruluşla əlaqədar bütün elm sahələrində olduğu kimi dilçilikdə də yeni sahələrin müasir dövrlə səsləşməsi üçün sistemli tədqiqat işləri aparılır.

Ümummilli liderimiz Heydər Əliyev çıxışlarından birində qeyd etmişdir ki, heç bir elmin sonuna nöqtə qoyulmamışdır. Alimlərimiz bunu düşünməlidirlər. Bu sahədə son illər dilçi alimlərimizin də əməyi az məhsuldar olmamışdır.

Ölkəmizdə Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dövlət səviyyəsində ardıcıl diqqət və qayğı göstərilir. Son illərdə bu sahədə təqdirəlayiq işlər görülür, bir sıra fundamental əsərlər yaradılır. Bu əsərlərdə Azərbaycan dilçiliyi üçün yeni olan problemlərə toxunulmuş, onun tədqiqi ön plana çəkilmişdir. Belə əsərlərdən biri də professor F.Veysəllinin dilçiliyin aparıcı istiqamətlərindən olan koqnitiv dilçiliyə həsr edilmiş kitabıdır.

Dilçiliyin tarixində onun müxtəlif sahələrinin inkişafı ilə bağlı vacib və elmi cəhətdən dəyərli olan problemдэкш yerinə yetirməyə qadir dilçi alimlər (V. fon Humboldt, A.Şleyxer, H.Paul, F.F.Fortunatov, İ.A.Boduen de Kurtene, F.de Sössör, N.S.Trubeskoy, L.V.Şerba, O.Yakobson, L.Blumfild, E.Sepir, V.V.Vinoqradov, N. Xomski və b.) fəaliyyət göstərmişlər. Öz ideyalarının həqiqiliyini sübuta yetirmək üçün onlar illərlə axtarışlar aparmışlar. Məsələyə çağdaş dilçiliyimizin inkişafı aspektindən yanaşdıqda məlum olur ki, belə çətin və ağır işi yerinə yetirənlərdən biri də öz orijinal fikirləri ilə, yaradıcılıq diapazonunun böyüklüyü və rəngarəngliyi ilə seçilən, respublikamızda ümumi dilçiliyin, eləcə də germanistikanın inkişafı sahəsində xidmətləri olan, filologiya elmləri doktoru, professor F.Y.Veysəllidir. O, çoxsaylı fundamental elmi əsərlərin və dərsliklərin (“Alman dilinin fonetikası”( Bakı:1980), “Lehrbuch der deutschen Phonetik”, “Fonetika və fonologiya məsələləri”, “Dilimiz, qeyrətimiz, qayğılarımız”, “German dilçiliyinə giriş”, “ Einführung in die Phonologie”, “Dil, cəmiyyət və siyasət”, “Struktur dilçiliyin əsasları”, “Dil”, “Semiotika”, Seçilmiş əsərləri 2 cilddə, “Элементы общей и частной лингвистики», Azərbaycan dilinin funksional qrammatikası: fonemika/morfemika” və s. müəllifidir. Qeyd olunan bu əsərlər F.Y.Veysəllinin zəngin elmi yaradıcılığının bir hissəsidir və bu gün dilçilərin bəhrələndikləri, istinad etdikləri əsas mənbələrdir. Onun bu yaxınlarda çap olunmuş və böyük oxucu auditoriyasının istifadəsinə

verilmiş "Koqnitiv dilçilik: əsas anlayışları və perspektivləri" əsəri respublikamızda dilçiliyin bu sahəsinə olan tələbatın ödənilməsinə istiqamətlənmişdir. İnanıram ki, əsər dilçiliyi özünə peşə seçmiş hər bir kəs (müəllimlər, doktorantlar, magistrantlar, tələbələr və b.) tərəfindən maraqla qarşılanacaq. Bu cəhətdən çap olunmuş kitabın nəzəri və praktik əhəmiyyəti danılmazdır. Avropa və rus dilçiliyində koqnitiv dilçilik və onun aspektləri kifayət qədər tədqiq olunmuşdur. Keçmiş sovetlər birliyində koqnitiv dilçiliyin təşəkkülü N.İ. Jinkinin tədqiqat işləri ilə bağlıdır. O hələ 1959-cu ildə doktorluq dissertasiyasında bu gün yeni sayılan koqnitiv dilçiliyin elmi əsaslarını işləyib hazırlamışdır. Azərbaycan dilçiliyi üçün bu, yeni problem olduğundan onun tədqiqinə ehtiyac duyulurdu. Elə bu səbəbdən də "Koqnitiv dilçilik: əsas anlayışları və perspektivləri" əsəri respublikamızda koqnitiv dilçiliyin inkişafı sahəsində yeni səhifə açmaqla aktuallığını təmin etmişdir. Kitabda dilçiliyin kökləri, koqnitiv dilçiliyin bir elm sahəsi kimi formalaşması, əsas istiqamətləri və inkişaf perspektivləri yeddi fəsil üzrə sistemli şəkildə şərh olunmuşdur. Müəllif dilin koqnitiv aspektdə öyrənilməsinin zəruriliyini və qanunauyğunluğunu, dilöyrənmədə koqnitiv dilçiliyin vacibliyini vurğulamışdır. Şübhəsiz ki, gələcəkdə tədris planlarında bunlar nəzərə alına bilər. Koqnitiv dilçilikdə ən kiçik vahid kimi konsept qəbul edildiyindən kitabda bu vahidin mental və neyroloji əsaslarının şərhinə geniş yer verilmişdir.

Koqnitiv dilçiliyin sələflərini göstərmək məqsədi ilə kitabın əvvəlində ümumi nəzəri məsələlərdən bəhs olunmuşdur.

Kitabın birinci fəsli "Müasir dilçiliyin postulatları" adlanır. Burada koqnitiv dilçiliyin banilərinin irəli sürdükləri fikirlər elmi əsaslarla müqayisə və təhlil olunmuş, dilçiliyin bu sahəsinin fəlsəfi kökləri və nəzəri əsasları kimi məsələlərə aydınlıq gətirilmişdir. Müəllif hesab edir ki, taksonomik dilçiliyin əsaslarını işləyib hazırlamış İ.A.Boduen de Kurtene haqlı olaraq insanı dil tədqiqatlarının mərkəzində götürmüşdür, halbuki strukturalistlər bu məsələdə səhv olaraq, insanı dil tədqiqlərindən kənar etmişlər. Boduen de Kurtenenin ideyaları sonralar koqnitiv dilçilik kimi formalaşan elmin əsasını təşkil etmişdir. K.Büler və başqalarının linqvistik nəzəriyyələrini təhlil edən F.Y.Veysəlli qeyd edir ki, onların dil vahidlərinin üç funksiyasını fərqləndirməsi– ifadə (ekspressiv), müraciət (apelyativ) və təsvir (eksplikativ) – bu gün də öz əhəmiyyətini itirməmişdir. Bütün bunlar bugünkü koqnitiv dilçiliyin inkişafında həlledici rol oynamışdır. Dildən istifadə və onun dərk olunması problemlərinin öyrənilməsində psixodilçiliyin təsirinin böyük olduğu və bu səbəbdən də dilçilikdə koqnitiv – psixoloji istiqamətdə dönüş yaradılmasının zəruriliyi, dilçiliyin elmlərarası koqnitiv elmin tərkib hissəsi olduğu fikirləri kitabın bu fəslində irəli sürülmüş, təhlil olunmuş və dilçilik baxımından əhəmiyyətli olan nəticələr əldə edilmişdir. Dil səriştəsinin və dil şüurunun mövcudluğu, fərqli xüsusiyyətləri haqqında da burada müfəssəl məlumat əldə etmək mümkündür.

İkinci fəsildə "Koqnitiv dilçilik dil haqqında yeni elm sahəsi kimi" probleminin maraq doğuracaq məsələləri: koqnitiv dilçiliyin yaranması haqqında, koqnitiv dilçiliyin tədqiqat metodları, dilçilik koqnitiv elm kimi və koqnitiv dilçiliyin əsas vahidlərinin sadə və anlaşılan dildə şərh olunması, ifadə olunan fikirlərin oxucu tərəfindən incəliklərinə qədər dərk edilməsinə imkan vermişdir. Müəllifin qeyd etdiyi kimi, hazırda koqnitiv dilçilik daha çox maraq doğuran sahə olmaqla, əsas qayəsi koqnisiya sistemində dilin statusunu müəyyənləşdirməkdən ibarətdir. Buna görə də o, koqnisiyanın nə oldu-

ğu, bu elmin hansı ümumi postulatlara söykənməsi və koqnitiv sistemlərin struktur əlaməti haqqında izahata yer ayırmışdır. Bu məqsədlə dünya dilçilik elmində öz dəstixətti ilə fərqlənən F.Y.Qallın və J.A.Fodorun koqnisiya ilə bağlı fikirləri təhlil olunmuşdur. Koqnisiyanın iş metodlarından bəhs edərkən F.Y.Veysəlli induksiya və deduksiya ilə yanaşı müşahidə metodundan geniş istifadə olunduğunu, başqasını müşahidə etmək üçün eksperimentin mühüm rol oynadığını göstərmişdir. Bu metodların özəllikləri əsaslandırılmışdır. Müəllif ümumi və abstrakt ifadələrə deyil, təcrübi yolla əldə edilmiş konkret dil faktlarına əsaslanmağı daha üstün tutur, çünki bu, ifadə olunanların gerçəklik dəyərini əsaslandırmağın həqiqi yoludur. Onu da qeyd edək ki, tədqiqat işinə bu cür yanaşma F.Y.Veysəllinin bütün əsərlərində özünü göstərir. Daha sonra müəllif özünün irəli sürdüyü "dil insanın koqnitiv fəaliyyətinin əsas ifadəsidir və onun tərkib hissəsidir, dil insan əqlinin spesifik nailiyyəti olmaqla bütöv koqnitiv sistemə bağlı mental bilik sistemini əhatə edir" kimi fikirlərini əsaslandıraraq, koqnitiv dilçiliyin mahiyyətini və hüdudlarını müəyyənləşdirir. Burada konsept, konseptsfer, mentalitet kimi anlayışlara da müxtəlif dillərin materiallarının təhlili əsasında aydınlıq gətirilir.

Üçüncü fəsildə dünya mənzərəsi və dünyanın dil mənzərəsi təhlil olunur. Belə bir fikir vurğulanır ki, dil mənzərəsi sözlərlə, işarələrlə, frazemlərlə, onların ünsiyyət prosesində seçimi ilə, obrazlı ifadələrlə, metaforla və intonasiya ilə yaranır. Bu hissədə insanın təfəkkürünə və davranışına bu və ya digər şəkildə dünyanın koqnitiv mənzərəsinin təsir göstərdiyi, dünyanın konseptsfer mənzərəsi və dil mənzərəsinin mental və verbal cəhətdən bir-biri ilə bağlı olub şüurun forma və məzmununu əks etdirdiyi araşdırılır. Nəticə olaraq dünyanın bədii mənzərəsinin dil mənzərəsi kimi ikinci olduğu və insan şüurunda dil vasitəsilə ifadəsini tapdığı göstərilir. Müəllif koqnitiv semantikanı araşdırmaqla belə qənaətə gəlir ki, koqnitiv dilçilik mənanı dil formalarına bağlı mental reprezentasiya vahidləri kimi götürdüyü üçün, o, təkcə sözlə kifayətlənməyib, digər dil vahidlərini də öyrənməyi qarşısına məqsəd qoyur. İrəli sürülmüş fikir Azərbaycan dili materialının təhlilindən alınan faktlarla öz həllini tapmışdır. Kitabdan istifadə edən hər bir oxucu "Konseptin mental və neyronal əsasları" adlanan fəsildə mental fenomenlərin xüsusiyyətləri, koqnisiyanın neyronal əsasları, koqnitiv yayınmaların neyroloji əsasları, yaddaşın funksiyaları və mental leksikon, emosiyanın koqnitiv proseslərə təsiri kimi məsələlərə dair lazımi informasiyanı əldə edə bilər.

Beşinci fəsildə dilöyrənmənin aspektləri təqdim olunur və bununla bağlı J.Piaje, E.Benvenist, R.Yakobson, D.Kristal və b. dilçilərin fikirləri təhlil olunmuşdur. Müəllifin fikrincə, koqnitiv dilçiliyi maraqlandıran məsələlərdən ən vacibi insanın öz aləmini dildə ifadə etməsi bacarığıdır. Bunu da uşaq dilini müşahidə etməklə öyrənmək mümkündür. Ona görə də kitabın bu hissəsində uşaq dilinin, iki və çoxdilliliyin, habelə dilöyrənmənin əsas məsələlərinə aydınlıq gətirilir. İstifadə olunmuş dil faktları və onların təhlili fikirlərin başa düşülməsini asanlaşdırır.

"İki və çoxdillilik problemi"nə həsr olunmuş altıncı fəsildə iki və çoxdilliliyin tarixi inkişaf yolu, insanda dil pozuntuları hallarının əsas cəhətləri, davranış və reaksiyaların tədqiqi, qrammatikanın mənimsənilməsi və universal qrammatika ideyası kimi mübahisəli məsələlərə aydınlıq gətirilir, bu prosesdə baş verən interferensiyanın xüsusiyyətləri göstərilir.

Tətbiqi dilçiliyin əsas istiqamətləri, dillərin tədrisində istifadə olunan metodlar,

dillərin tədrisində hansı qrammatikanın əsas olması və s. kimi məsələlər kitabın sonuncu fəslində şərh olunur. Göstərilən məsələlər hər bir dil öyrədən və öyrənən üçün elmi cəhətdən əhəmiyyətlidir.

Hər fəslin sonunda verilmiş "Fəslin ədəbiyyatı və qeydlər" kitabda irəli sürülmüş fikirlərin daha asan başa düşülməsinə, koqnitiv dilçiliyin son durumu haqqında təsəvvür yaratmağa kömək edir. Hər bir kitabın dəyəri onun informativliyi ilə ölçülür. Bu cəhətdən yeni işıq üzü görmüş bu kitab zəngin informativliyi ilə oxucuların diqqətini cəlb edəcək. İnanırıq ki, müəllifin bu kitabı koqnitiv dilçiliyə maraq göstərənlərin artan tələbatını ödəmək iqtidarındadır. F.Y.Veysəllinin çap olunmuş bu və digər əsərləri bir daha onu deməyə əsas verir ki, o, dilçiliyimizin germanistika sahəsi üzrə mərkəzdə duran aysberqdir. Çap olunmuş əsərləri onun dilçilik dünyasının görünən hissəsidir, görünməyən hissəsi isə hələlik onun daxilində gizlənir və gələcək əsərlərində biz oxuculara çatdırılacaq.

Bununla yanaşı, kitab haqqında bəzi fikirləri də bildirmək istərdik:

- hesab edirik ki, müəllif kitabın ikinci fəslini daha geniş şəkildə şərh etsə, daha yaxşı olardı;
-yəqin ki, müəllif gələcək tədqiqatlarında bu kitabda irəli sürdüyü müddəaları eksperiment yolu ilə sübut edəcək.

Kitabın dilçilik, dilşünaslıq ixtisaslar жüzrə oxuyan bakalavr və magistrlər, dil öyrənmiş ontogenez və filogenez məsələləri ilə məşğul olanlar, habelə filologiya fakültələri tələbələri və dil-ədəbiyyat müəllimləri üçün maraqlı olacağı şübhə doğurmur.

***Rəyçi: prof. M.Musaoğlu***

## İstifadə edilmiş ədəbiyyat

1. "Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı haqqında" Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 9 aprel 2013-cü il tarixli sərəncamı. //Azərbaycan, 2013, 10 may.
2. Veysəlli F. Koqnitiv dilçilik: əsas anlayışları və perspektivləri. Bakı: Mütərcim, 2015.
3. Маслова В. Введение в когнитивную лингвистику. Москва, 2008.
4. Попова З., Стернин И. Когнитивная лингвистика, Москва: Восток-Запад, 2007.
5. Schwarz M. Einführung in die kognitive Linguistik. 3. Auflage, Tübingen, A.Franke, 2008.

**Ф.Асланов**

**Удачные результаты исследований**

**Резюме**

В настоящей статье анализированы основы когнитивной лингвистики и освещаются роль данной книги в развитии азербайджанского языкознания.

**F.Aslanov**

**Successful results of researches**

**Summary**

In this article the essence of cognitive linguistics is analyzed and is spoken about the role of this book in the development of Azerbaijan linguistics